**Türkiyə türkcəsindən uyğunlaşdıranı və**
**ön sözün müəllifi: AYBƏNİZ KƏNGƏRLİ**
**Filologiya elmləri doktoru**

**Elmi redaktoru: Dr. Fethi Gedikli**
**Türkiyə Cümhuriyyəti Bakı Böyükelçiliyi Mədəniyyət və Tanıtma müşaviri**

Akçuraoğlu Yusuf, “Türkçülüyün tarixi”-Bakı, 2006.

Bu kitab türk dünyasının tanınmış mütəfəkkiri Akçuraoğlu Yusufun Azərbaycanda nəşr olunan ilk kitabıdır. Kitabda böyük mütəfəkkirin özünün xüsusi önəm verdiyi “Türkçülüyün tarixi” əsəri ilk dəfə olaraq Azərbaycan oxucusuna təqdim edilir. Kitab filosoflar, sosioloqlar, tarixçilər, türkoloqlar, ümumiyyətlə geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

## Ön söz

Dr. Aybeniz Kengerli geçen asrın ilk çeyreğinde ortak Türk dili hakkında Azerbaycan ziyalılarınca yazılmış makaleleri "Turanın bir eli var ve yalnız bir dili var" başlığı ile derlemişti. Şimdi de aslen Kazanlı olan büyük tarihçi Akçuraoğlu Yusuf'un ilk kez 1928 yılında İstanbul'da "Türk yılı" salnamesinde (s. 289-455) Arap elifbasında basılan "Türkçülüğün tarihi" adlı değerli eserini neşre hazırlamıştır. Türk Derneği, Türk Yurdu, Türk Ocağı gibi cemiyetlerin kurucusu olmuş, ayrıca Türk Derneği, Türk Yurdu gibi çok tesirli dergiler çıkarmış Akçuraoğlu'nun elinizdeki kitabı, Türkiye'de iki kere de Latin alfabesiyle yayımlanmıştır. Müellifinin de gelişmesinde büyük emeği olan Türkçülük hareketi hakkında kaleme alınan bu eserin kimlik tanımlamasında Azerbaycan aydınlarına bazı tereddütleri aradan kaldırmada yardımcı olacağını düşündük.

Yazar hakikaten meseleye geniş bir açıdan bakabilen ve ciddi tahliller aparabilen mütefekkir bir tarihçidir. Ne yazık ki, onun Türkiye'de de kadrinin gereği gibi bilindiğini söylemek çetindir. Hakkında yazılan en güzel kitabın müellifi bir Fransızdır [bk. François Georgeon, *Aux origines du nationalisme turc*, *Yusuf Akçura (1876-1935)*,1980)].

Eserlerinin birçoğu köhne elifba iledir ve yeniden neşredilmemiştir. Oysa o, daha 1904'te, Kahire'de çıkan "Üç Tarz-ı Siyaset" başlığını koyduğu küçük ama çok müessir eseriyle evvela Osmanlı İmparatorluğundaki gelişmelerde ve sonra Türkiye Cumhuriyetinin kurulmasında belirleyici adamlardan biri olmuştu.

Şimdi neşrettiğimiz kitabın hem bütününün, hem de içindeki "Azerbaycan'daki Türkçülük" bölmesinin ciddi bir ilgiyle okunacağına eminiz. Akçuraoğlu'nun Ağaoğlu Ahmed Beyin doğduğu Şuşa şehri münasebetiyle söylediği sözleri bugünkü şeraitte okumak, insanın içini kanatmaktadır. "Karabağ, Şirvan ile beraber Azerbaycan Türk kültürünün, Türk musikisinin, Türk edebiyatı ile Türk milliyetçiliğinin de beşiğidir." Bu sayfalarda Azerbaycan tarihi için de çok değerli malumat ve değerlendirmeler vardır. Misal için 1907'de Petrograd'da (St. Petersburg) toplanan bir heyetin, Bakü'de petrol olduğu için buranın Türk ahalisinin yerinden göçürülmesini istediğini ondan öğreniyoruz.

Bu kitabın neşrinin Azerbaycan'da Akçuraoğlu'na ve onun ömrünü verdiği Türklük hareketine alakayı canlandıracağını umuyoruz.

Akçuraoğlu sadece tarihçi ve bir düşünce adamı değil aynı zamanda faal bir teşkilatçı idi de. Onun Atatürk'ün kurduğu Türk Tarih Kurumunda da çok değerli çalışmalar yapıp bu kurumun istikametinin çizilmesinde önemli rolü olduğunu biliyoruz.

Dr. Aybeniz Kengerli'yi hem bu kitabı, hem de "Yom" dergisinin 4. sayısında yayımlanacak Akçuraoğlu'nun en meşhur ve neşrinden sonraki siyasi fikirleri ve hareketleri derinden etkileyen "Üç Tarz-ı Siyaset" makalesini Azerbaycan'da neşre hazırladığına göre samimi kalple tebrik ediyoruz.

Son olarak, kitabın ışık yüzü görmesini katkılarıyla mümkün kılan Türk Dünyası Araştırmaları Vakfının Azerbaycan temsilcisi, TUSİAB Yönetim Kurulu üyesi, AZSAN MMC.nin sahibi, arkadaşımız Dr. Halil Kurumahmut'a şükranlarımızı sunuyoruz.

Doç. Dr. Fethi GEDİKLİ
T.C. Bakü Büyükelçiliği Kültür ve Tanıtma Müşaviri

**Akçuraoğlu Yusuf kimdir?!**

***"Bütün türklərin milliyyətçiliyin qüvvətini anlamalarında, milli məfkurəni, türkçülüyü bulmalarında, kültürlərində və siyasi həyatlarında bunun tətbiqinə keçmələrində heç kimsə Yusuf bəy qədər müəssir olmamışdır. O, Kazanda çalışarkən Krımı, Qafqazı, Türküstanı,Türkiyəni unutmamışdı".***

**S. Ə. Krımər**

Akçuraoğlu Yusufun (1876-1935) adı Həsən bəy Zərdabi, İsmayıl bəy Qaspıralı, Əli bəy Hüseynzadə, Əhməd bəy Ağaoğlu, Əlimərdan bəy Topçubaşov, Ziya Göyalp, Məmməd Əmin Rəsulzadə, Məmməd Əmin Yurdaqul, Ənvər Paşa, Mustafa Kamal Atatürk... kimi türk millətinin mülli şüurunun oyanmasında, yüksəlməsində böyük rol oynamış nəhəng şəxsiyyətlərlə bir cərgədə dayanır.

Akçuraoğlu Yusuf-Yusuf Akçura adları ilə bütün dünyada məşhur olan böyük tatar türkçüsü haqqında, Azərbaycanda demək olar ki, heç bir məlumat yoxdur. Baxmayaraq ki, XIX yüzilin sonu, XX yüzilin əvvəllərində türk milli təfəkkürünün inkişaf yolunu, türkçülük hərəkatının təşəkkül və təkamül yolunu izləyən tədqiqatçılar bu adın üzərində dönə-dönə dayanmaq məcburiyyətindədirlər. Akçuraoğlu Yusuf təkcə "Türkçülüyün tarixi"ni yazan şəxsiyyət deyil, həm də bu tarixi yaradan, öz xidmətləri, çalışmaları ilə türkçülük hərəkatının tarixində mühüm yer tutan türk böyüklərindəndir. Milliyyətcə Kazan tatarı olsa da, onun xidmətləri bütün türk xalqları, türk dünyası ilə bağlıdır və bu səbəbdən Akçuranın irsi bütün türk dünyasında öyrənilməlidir.

Türk xalqlarının azı dörddə bir əsrlik, yəni 1900-dən başlayan tarixi Yusuf Akçura adı olmadan, onun xidmətləri nəzərə alınmadan olduğu kimi təqdim edilə bilməz. Yusuf Akçura olduqca zəngin bir elmi-nəzəri, publisistik irs qoyub getmişdir. Və bu əsərlər, küll halında Akçuranın yaradıcılığı dünyanın müxtəlif dillərində və müxtəlif ölkələrində bir əsrdən artıqdır ki, diqqət mərkəzindədir. Təəssüf ki, nə 70 illik sovet dönəmində, nə də müstəqillik qazandığımız son onilliklərdə Yusuf Akçura Azərbaycan tədqiqatçılarının maraq dairəsinə daxil ola bilməyib. Amma Yusuf Akçuranın xidmətləri Azərbaycanla da birbaşa, yaxud dolayı yolla mütləq bağlıdır...

Biz 2002-ci ildə, "Azərbaycan romantikləri və türkçülük hərəkatı" adlı doktorluq dissertasiyamızda türkçülük hərəkatının tarixindən bəhs edərkən Yusuf Akçuranın həyatı və

yaradıcılığı haqqında da Azərbaycanda ilk dəfə olaraq elmi məlumat vermişdik. Bir neçə il keçdikdən sonra Akçura irsini Azərbaycanda tanıtmaq zərurətini hiss edib onun sizə təqdim etdiyimiz bu iki əsərini Türkiyə türkcəsindən uyğunlaşdırdıq. (Bizdən fərqli olaraq Akçura irsi Türkiyədə həmişə diqqət mərkəzində olub.) Bu kitab Akçuraoğlu Yusufun Azərbaycanda nəşr olunan ilk kitabıdır. Kitabda böyük mütəfəkkirin özünün xüsusi önəm verdiyi "Üç tərzi-siyasət" (1904) məqaləsi və "Türkçülüyün tarixi" (1928) əsəri ilk dəfə olaraq Azərbaycan oxucusuna təqdim edilir. Yazılış tarixləri arasında böyük bir zaman məsafəsi olan bu əsərlər Akçura irsi, onun dünyagörüşü haqqında təsəvvür yaratmaq üçün səciyyəvi örnəklərdir.

Təkcə bu əsərlərdən biri Yusuf Akçuraoğlu haqqında uzun-uzun bəhslər açmaq üçün yetərlidir. "Türkçülüyün tarixi" kitabında Yusuf Akçuraoğlu bir türkçü olaraq özü haqqında da geniş məlumat vermişdir. Bunu nəzərə alaraq böyük mütəfəkkirin həyatı və yaradıcılığı haqqında yığcam məlumat verməklə kifayətlənirik.

*****

İsmayıl Qaspıralıdan sonra təkcə Azərbaycanda, Rusiya türkləri arasında deyil, Türkiyə türkləri arasında, bütün türk dünyasında siyasi türkçülüyün yayılmasında tatar mütəfəkkiri Yusuf Akçuraoğlunun çalışmaları böyük rol oynamışdır.

Yusuf Akçuraoğlu Krımdan Kazana köçmüş kübar tatar ailəsinə mənsub idi. Ulu babalarından knyaz Adaş rus çarı İvan Qroznının yaxın dostu olmuşdu. Akçuralar Simbirsk şəhərində və onun ətrafında olan bütün qumaş fabriklərinin sahibləri idilər. Bu ailənin rus hakim dairələri ilə münasibətləri var idi. Rus çarı I Nikolay Kazanı ziyarət edərkən Yusufun atası Həsən bəyin evində qonaq olmuşdu. Yusuf Akçuraoğlu 1876-cı ildə Simbirsk şəhərində doğulmuş, 2 yaşında ikən atasını itirmiş, anasının himayəsində qalmışdı. 1883-cü ildə anasının xəstəliyi üzündən Yusuf anası ilə birlikdə İstanbula köçür. 1883-1886-cı illərdə orada ibtidai məktəbi, 1886-1892-ci illərdə isə orta məktəbi bitirir. Orta təhsilini bitirib anası ilə birlikdə Kazana dönür. Bu səyahəti zamanı tatar ziyalılarından Qəyyum Nasiri (1825-1902), din islahatçısı Alimcan Barudi (1857-1921) Şeyx Şamilin oğlu general Şamil və Rusiya müftisi Şeyx Əbdüləzizlə görüşür. Şeyx Şamilin nəvəsi Zahid Şamil bəydən fransız dili, osmanlı tarixi və xəttatlıq dərsləri öyrənir.

Akçuranın əmisi qızı Zöhrə xanım İ.Qaspıralının həyat yoldaşı idi. O, tez-tez bu ailədə qonaq olar, İsmayıl bəylə söhbətlər edərdi.

1892-1896-cı illərdə Yusuf İstanbul Hərbiyyə məktəbində oxuyur. Burada tələbə ikən türk alimlərinin türkologiya sahəsində ilk araşdırmaları ilə -Vələd Çələbi, Nəcib Asim bəy, Bursalı Məhəmməd Tahir kimi türkçülərin əsərləri ilə tanış olur.

Türk tarixi və mədəniyyəti sahəsində zəngin məlumat sahibi olan Yusuf Akçuraoğlu heç bir siyasi partiya ilə bağlı olmadığına baxmayaraq hökumət tərəfindən "Gənc türklər" cəmiyyəti ilə

əlaqədə bilinərək həbs edilir. 1897-ci ildə isə Sultan Əbdülhəmidin əmri ilə türkçülük görüşlərinə görə Trablisqərbə ömürlük sürgünə göndərilir. Avropadakı Gənc türklərin sultanla apardığı danışıqlardan sonra azad edilir, dostu Əhməd Fərid bəylə birlikdə Trablüsqərbdən qaçaraq Parisə gedir. 1899-1903-cü illərdə Fransanın Siyasi Elmlər Akademiyasında, eyni zamanda Sorbon Uyğulamalı İncələmələr Yüksək Məktəbində təhsil alır. Akçuranın siyasi görüşlərinin formalaşmasında bu dövr müstəsna rol oynayır. Məlumdur ki, o dövrdə Paris jontürklərin əsas iqamətgahı idi. Akçura onlarla sıx əlaqə saxlayır, Gənc türklərlə təmas və görüşlər onun dünyagörüşünə ciddi təsir göstərir.

Parisdə görüşdüyü türk millətçisi Şərafəddin Məğmumi Akçuraya osmanlıçılıq ideyasının çürüklüyündən, müxtəlif ünsürlərin anlaşmasının imkansızlığından, türk millətçiliyindən başqa keçərli bir fikrin olmayacağından bəhs edərək, Şərq və türk düşməni olan batılıların “dillərinə doladıqları” “ədalət”, “insanlıq” sözlərinə inamın tam bir axmaqlıq olacağını anladır. Digər tərəfdən, Akçura Paris və Sorbon ali məktəblərində Avropanın tanınmış millətçi alimlərinin -Kornell, Boutmi, Renuarın dərslərini dinləyir.

Yusuf, o zaman Sorbon Universitetinin hüquq fakultəsində təhsil alan Sədri Maqsudi ilə birlikdə “Tərcüman” qəzetinin 20 illik yubileyinin keçirilməsinin təşəbbüskarları olur. Sədri Maqsudi bu barədə yazır: “Bu törən və toplantı Rusiya türklərinin ilk milli konqresi mahiyyətini aldı. Ayrı-ayrı vilayətlərdən gələn türk münəvvərlər ilk dəfə olaraq Rusiyaya bağımlı türkləri maraqlandıran milli məsələ, milli kültürü yaşatma çarələri və rusların ruslaşdırma siyasəti ilə mücadilə üçün görülməsi vacib olan tədbirlər haqqında görüşmüş oldular”. “Tərcüman”ın 20 illik yubileyinin qeyd olunması Rusiya türklərinin milli oyanış tarixində yer alan mühüm bir hadisə oldu. Bu tədbirdən sonra Rusiya türklərinin milliyyətlərini mühafizə yolunda təşkilatlı bir surətdə mücadilə dövrü başlanmışdır.

Akçura təhsilini bitirib 1904-cü ildə Rusiyaya dönür, 1908-ci ilə qədər burada qalır.

Kazanda ikən özünün məşhur “Üç tərzi-siyasət” məqaləsini yazır. 1905-ci ildə “Kazan müxbiri” qəzetinin redaktoru olur. Dumaya millət vəkili seçilməsinin qarşısını almaq məqsədi ilə 1906-cı ildə hökumət tərəfindən həbs olunur. Məşrutiyyət elanından sonra 1908-ci ildə Türkiyəyə gedir və ömrünün sonuna qədər orada yaşayır. Türkçü dərnək və cəmiyyətlərin qurulmasında, onların mətbu orqanlarının nəşrində yaxından iştirak edir. “Rusiyadakı türk-tatar xalqlarının haqlarını qoruma komitəsi”nin başkanı seçilir. Heyət Avstriya Macarıstan, Almaniya və İsveçrəyə gedib, Rusiya türk-müsəlmanlarının haqlarını müdafiə və tələb edir. Sürix şəhərində Akçura Leninlə də görüşür, bolşeviklərin hakimiyyətə gələcəyi təqdirdə millətlər məsələsinə onun münasibətini soruşur. Lenin Akçuraya: ”Hakimiyyətə gələrsək, istədiyiniz hüquq ziyadəsi ilə təmin olunacaqdır!” -cavabını verir.

1917-1919-cu illərdə Akçura ruslara əsir düşmüş türk əsirlərinin məsələsi ilə bağlı Qızılay cəmiyyətinin nümayəndəsi kimi Qərbi Avropaya və Rusiyaya gedir.

Cümhuriyyət qurulmasından sonra Türkiyə Böyük Millət məclisinə üzv seçilir. İstanbul Universitetində professor və Atatürkün mədəniyyət və siyasət məsələləri üzrə məsləhətçisi vəzifəsində çalışır. 1931-ci ildə "Türk Tarix Qurumu"nun yaradılmasında yaxından iştirak edir, 1932-ci ildən ölümünə qədər bu quruma rəhbərlik edir. 1935-ci ildə İstanbulda ürək xəstəliyindən vəfat edir.

Yusuf Akçuraoğlunun ən məşhur əsərlərindən biri 1904-cü ildə Simbirsk yaxınlığında yazdığı "Üç tərzi-siyasət" məqaləsidir. Məqalə Qahirədə çıxan "Türk" qəzetində nəşr edilmişdir. Az sonra Əli Kamalın, Əhməd Fərid və Əli bəy Hüseynzadənin cavab məqalələri də həmin qəzetdə nəşr olunur.

Amerikalı yazar Çarlz Hostler, erməni Zarevand türkçülər üçün bu əsərin əhəmiyyətini marksistlər üçün "Kommunist Partiyasının Manifesti"nə bərabər tutmuş, Akçuraya türk birliyi fikrinin qurucularından biri kimi baxmışlar. Fransız alimi Georgion bu məqaləni "pantürkizmin ilk dəfə sistematik biçimdə ortaya qoyulması" kimi təqdim etmişdir.

Həqiqətən Akçura bu məqalə ilə siyasi türkçülüyün, türkçülük nəzəriyyəsinin əsasını qoymuşdur. Türkçülük hərəkatının ən böyük tarixçilərindən və nəzəriyyəçilərindən biri kimi Akçura məqalənin yazıldığı dövrdə türkçülük cərəyanının artıq yayılmış olduğunu təsdiqləmiş, ancaq "Türk millətçiliyinin siyasətdə oynaya biləcəyi rolu və önəmini göstərən "Üç tərzi-siyasət"dən öncə yazılmış bir əsərin mövcudluğunu bilmədiyini" etiraf etmişdi.

"Üç tərzi-siyasət" adı ilə Yusuf Akçuraoğlu məqalənin yazıldığı dövrdə Osmanlı imperatorluğunun nicat yolu kimi düşünülən osmanlıçılıq, islamçılıq və türkçülük axımlarının hansının tətbiqinin mümkünlüyünü araşdırmış, tam qətiyyətlə olmasa da, bu üç cərəyan içərisində türkçülüyü yeganə nicat yolu, düzgün yol kimi əsaslandırmağa çalışmışdır. İlk dəfə olaraq osmanlıçılığın və islamçılığın deyil, türklük siyasətinin dövlət siyasətinə çevrilməsini irəli sürmüş, siyasi türkçülüyün əsasını qoymuşdur.

Yusuf Akçuraoğlu türklük siyasəti deyərkən Rusiyada, Osmanlı İmperatorluğunda yaşayan türk xalqlarının vahid türk milləti təşkil etdiyini nəzərə alır, türk amilinə dayanan bir dövlətin yaranmasını müdafiə edir, bütün türklərin bir-birlərini tanımalarını, sevmələrini, mədəni-kültürəl cəhətdən birləşmələrini istəyirdi. Zarevand kimi erməni müəllifləri və bəzi şovinist rus alimləri Akçuranı "pantürkizmin babası", "panturanizmin babası" adlandırmaqla onun guya bütün dünya türklərini vahid dövlətdə birləşdirmək istədiyinə işarə etmişlər. Əslində türkçülüyün Akçura tərəfindən irəli sürülən proqramı ən sonda ayrı-ayrı türk dövlətlərinin yaranmasını, türk xalqlarının

milli azadlıq əldə etməsini nəzərdə tuturdu. Türk xalqlarının müstəqil dövlətləri olmadan vahid dövlətdə birləşmələri ideyasının nə qədər absurd olduğunun isbata ehtiyacı yoxdur.

1904-cü ildən -"Üç tərzi-siyasət"dən keçən illər ərzində Akçura Rusiyada, həm də Türkiyədə ən görkəmli türkçülərdən biri kimi çoxplanlı fəaliyyət göstərmiş, heç vaxt siyasi anlamda türklərin bir dövlətdə birləşdirilməsi istiqamətində çalışmamışdır. O, Qafqaz, Krım, Kazan, Türküstan türklərinin liderlərini bir araya toplamış, Rusiya müsəlmanlarının birinci qurultayının keçirilməsinə nail olmuşdur. Azərbaycandan Əli bəy Hüseynzadə, Əhməd Bəy Ağaoğlu, Əlimərdan bəy Topçubaşov, Qara bəy Qarabəyov və b. da həmin nümayəndələrin arasında idilər. 1908-1912-ci illər arasında "Türk dərnəyi", "Türk bilgi dərnəyi", "Türk ocağı", "Türk yurdu" kimi cəmiyyətlərin hamısında Akçura qurucular sırasında olmuşdur. "Türk yurdu" dərgisinə uzun illər redaktorluq etmişdir. 1914-cü ilə qədər bu cəmiyyətlərin heç birinin fəaliyyəti siyasi fəaliyyət daşımamış, mədəni türkçülüyün prinsiplərinə dayanmışdır.

1915-ci ildə Akçuranın başçılıq etdiyi "Türk-tatar heyəti"nin fəaliyyəti də göstərir ki, o, türklərin milli istiqlallarına qovuşması tələbini irəli sürmüşdür. Azərbaycandan Əli bəy Hüseynzadə, Əhməd bəy Ağaoğlu də həmin heyətin tərkibində idilər.

1916-cı ildə heyət Amerika prezidenti Vilsona, ingilis, fransız, italyan dövlət başçılarına teleqram göndərir, Rusiya türklərinin müstəqil yaşama haqlarının tanınmasını xahiş edir. Leninlə Akçuranın görüşü də bu dövrə aiddir.

Əli bəy Hüseynzadə özünün ilk və ən məşhur əsərlərindən birini -"Məktubi-məxsus" məqaləsini Akçuranın "Üç tərzi-siyasət"inə cavab olaraq yazmış, bir çox türkçü cəmiyyət və dərnəklərdə onunla bərabər fəaliyyət göstərmişdir. Əhməd bəy Ağaoğlu, Məmməd Əmin Rəsulzadə də Türkiyədə olduqları zaman Yusuf bəylə müəyyən münasibətlər saxlamışlar. Akçuranın redaktorluğu ilə yayınlanan "Türk yurdu" Azərbaycanda da geniş rəğbət qazanmış, M. Ə. Rəsulzadənin təbiri ilə desək, "Azərbaycanda da pək atəşli müaqqiblər bulmuşdur".

"Türkçülüyün tarixi" əsəri ilk dəfə 1928-ci ildə "Türk yılı" adlı illikdə nəşr olunmuşdur. Yusuf Akçura "Türk ocaqları"nın himayəsi altında 1928-ci ildə İstanbulda nəşr olunan "Türk yılı" adlı illiyin həm naşiri, həm də baş yazarı idi. Əsər bu məcmuədə əski hərflərlə nəşr olunmuşdur. Bundan sonra "Türkçülüyün tarixi" uzun fasilədən sonra üç dəfə də latınn əlifbası ilə Türkiyədə yayınlanmışdır. İkinci dəfə "Türkçülük- türkçülüyün tarixi gəlişimi" adı ilə 1978-də Sakin Önər tərəfindən latın hərflərinə çevrilib sadələşdirilmiş və "Türk Kültür Yayını" arasında yer almışdır.

Əsərin üçüncü nəşri isə "Yeni türk dövlətinin öncülləri"/ 1928 ili yazıları" adı ilə, 1981-də Kültür Nazirliyi Yayınları tərəfindən gerçəkləşdirilmişdir. Əsərin bizə məlum olan üçüncü nəşri 1998-ci ilə aiddir. Biz "Türkçülüyün tarixi"nin bütün yuxarıda göstərilən nəşrlərinə nəzər salaraq əsəri son nəşr əsasında Azərbaycan türkcəsinə çevirdik.

Əsərdə türkçülük hərəkatının Tənzimatdan İkinci Məşrutiyyətə qədər keçirdiyi bütün mərhələlər ətraflı təhlil edilir. Müəllif Osmanlı İmperatorluğunda, Krımda, Azərbaycanda türkçülük hərəkatının tarixini vahid proses olaraq nəzərdən keçirir. Bu ərazilərdə türkçülüyün tarixi inkişafı xronoloji ardıcıllıqla, tarixi məxəzlərə dayanaraq izlənir. Ziya Göyalpın "Türkçülüyün əsasları" əsəri daha çox türkçülüyün proqramının, nəzəri əsaslarının tədqiqinə həsr olunmuşdursa, Yusuf Akçuranın əsəri hərəkatın İkinci Məşrutiyyətə qədərki tarixinin real mənzərəsini yaradır. Əsərdə Azərbaycan türkçülük hərəkatının təşəkkül, təkamül mərhələləri görkəmli Azərbaycan türkçülərinin həyatı və türkçülük fəaliyyəti haqqında da dəyərli məlumatlar verilir. Yusuf Akçura təkcə türkçülük hərəkatının bütöv tarixi haqqında deyil, Azərbaycan türkçülük hərəkatı haqqında da ilk dəfə sistemli elmi şəkildə məlumat verən müəllifdir.

Yusuf Akçuraoğlu bütün dünya türklərinə bağlı olduğu kimi, sıx tellərlə Azərbaycan türklərinə də bağlı bir şəxsiyyətdir və inanırıq ki, onun əsərləri Azərbaycan oxucusu tərəfindən maraqla qarşılanacaq.

Bu kitabın Azərbaycan oxucusuna çatdırılmasına göstərdiyi mənəvi dəstəyə görə Türkiyə Cümhuriyyəti Bakı Böyükelçiliyi Mədəniyyət və Tanıtma müşaviri, böyük türk sevdalısı, sayın **dr. Fethi Gedikliyə s**onsuz təşəkkürümüzü bildiririk

**Aybəniz Kəngərli**
Filologiya elmləri doktoru
10 fevral 2006-cı il.

# TÜRKÇÜLÜYÜN TARİXİ

## TEORİDƏ VƏ BATI TÜRKLƏRİNDƏ TÜRKÇÜLÜK

**Bir məsələ**

Türk milliyyəti fikri, türklər arasına nə zaman və harada girdi? İştə həlli çox da asan olmayan bir tarix məsələsi!...[1] Əsil məsələnin həlli yolunda çalışmağa başlamadan öncə, istifadə etdiyimiz iki ifadədən- türklər və milliyyət fikri ifadələrindən qəsd etdiyimiz mənaları açıqca təyin etməliyik.

**TÜRKÜN TƏRİFİ**

Türklər dediyimiz zaman etnoqrafiya, filologiya və tarixlə ilgisi olanların bəzən "türk-tatar", "türk-tatar-moğol" deyə andıqları bir irqdən gəlmə, adətləri, dilləri bir-birinə çox yaxın, tarixi həyatları bir-birinə qarışmış olan qövm və qəbilələrin tamamını nəzərdə tuturuq. Bu baxımdan iranlı və avropalı bəzi yazarların və onlara uyaraq bəzi Osmanlı yazarlarının tatar dedikləri kazanlılar, azərbaycanlılar... ilaxırı ilə bərabər, qırğızlar, yakutlar da türklər ifadəsinin içində deməkdir.

**Milliyyət fikri**

Hər qövm və hətta hər qəbilə, digər qövm və qəbilələrə qarşı öz fərqli xüsusiyyətlərini duymuş və əksərən özünün üstünlüyünü iddia etmişdir. Bu duyğu və iddia, milliyyət fikrinin içgüdü (instinkt) ilə meydana gələn ilk başlanğıcıdır. Türk qövm və qəbilələrində bu hiss və iddianın hər zaman mövcud olduğunu heç qorxmadan təsdiqləyə bilərik.[2]

Ancaq haqqında danışılan milliyyət fikri, bu duyğu və iddianın çox inkişaf etmiş mərhələsidir. Qəbilə və qövmiyyət hissinin milliyyət fikri dərəcəsinə yüksəlməsi, Doğuda deyil, Batıda meydana gəlmişdir. Avropa qövmləri, bir çox faktorun təsiri altında, özəlliklə XV-ci yüzillikdən etibarən milliyyət məsələsini işləyərək, nəhayət XIX yüzilin ortalarına doğru, bu gün anladığımız mənada milliyyət fikrini təyin etdilər. Zamanımızda milliyyət fikrinin, digər bir deyimlə milliyyət əsasının əsas mənası budur: "Bir millət meydana gətirmiş olan insan topluluqları,

---

[1] Biz bu önəmli tarix məsələsini, bu məqaləmizlə tamam həll etmək iddiasından çox uzağıq. Məsələyə dair kiçik bir qələm təcrübəsi edirik. Və "Yıl"ın bu nüsxəsində bu təcrübəni də ancaq 1908-ci ilə qədər gətirə bildik. Sonrasını Tanrı nəsib edərsə, gələcək "Yıl"larda tamamlamağa çalışacağıq.

[2] İslam dövründə türklər milli duyğularını, milli qürurlarını nümayiş etdirmişlər? Şüubiyyə hərəkatına türklərin qatıldığı kəsindir. Milli türk qürurunu çox açıq ortaya qoyan "Divanu-lüğətit-türk" sahibinin şüubiyyəçilərdən olduğunu bəzi şərqşünaslar yazırlar.

bağımsız bir dövlət halında təşkilatlanaraq yaşamaq haqqına sahibdir". Bu cümlənin açıq anlaşılması üçün millət təbiriylə ifadə olunan reallığın yaxşı bilinməsi lazımdır.

**Millətin tərifi**

Millət nədir? Gerçəkdə millətlər var olmasına rəğmən, millətin tərifi o qədər də asan deyildir. Millətlərin gerçəkdə ortaya çıxmasına olduğu kimi, teoridə tərifinə də siyasi mənafelərin müdaxiləsi, təsiri olmuşdur. Bu gün millətin tam elmi deyə biləcəyimiz bir tərifini tapıb göstərə bilmərik. Millətin bir neçə cür tərifi vardır: təşkilat halında bulunan hər millət, mövcud şərtlərə və qarşıya qoyulan məqsədə görə milləti tərif etmişdir. Məsələn, almanlar və slavyanlar irq və dili (yəni tarixi zərurəti) fransızlar arzu və iradəni (yəni fərdi azadlığı), italyanlar ərazi və dili (yəni coğrafi və tarixi zərurəti) millətin meydana gəlməsində və davamında ən əsaslı amil olaraq almışlar. Biz mümkün olduğu qədər obyektiv qalmaq arzusuyla, milləti böylə tərif etmək istəyirik: "Millət irq və dilin əsasən birliyindən dolayı sosial vicdanında birlik və bərabərlik meydana gəlmiş bir insan toplumudur". Millət bu şəkildə tərif olununca, müxtəlif təriflər az-çox birləşdirilmiş və milliyyət fikrinin nədən ibarət olduğu da xeyli açıqlanmış olur.

Məhz, bu şəkildə mənasını təyin etdiyimiz milliyyət fikri sərhədlərini və mahiyyətini bir az öncə açıqladığımız türklər arasına nə zaman, nerədə və nasıl nüfuz etdi?

### Milliyyət fikrinin türklər arasında yayılması

Fikir Avropadan gəlmiş olduğuna görə, Avropa ilə ən sıx təmas və ilişkiləri olan, Avropa mədəniyyətindən az-çox faydalanmağa başlayan türk qövmlərinin, digərlərindən öncə bu fikirlə tanışmış olmaları lazımdır. Bu şərtlərə sahib türk qövmləri, əskidən Osmanlı türkləri deyilən Batı türkləri ilə Krım türkləri və Quzey türklərinin İdil hövzəsində yaşayan qisimləriylə Kafkasiyada oturan Azəri türkləridir. Gerçəkdən, XIX yüzilin sonlarına doğru, türklərin bu dörd küməsinin dördündə də milliyyət fikrinin ortaya çıxaraq yayılmaqda olduğunu görürük.

### Milliyyət fikrinin ortaya çıxma şəkli

Milliyyət fikri Batı, Azəri, Krım və Quzey türklərindən əcəba hansına daha öncə nüfuz etmişdir? Bu sualın cavabını araşdırmadan öncə milliyyət fikrinin bir qövmdə varlığını sezdirən fikri fəaliyyətləri müəyyənləşdirməyə çalışaq: milliyyət fikrinin təsiri altına girməyə başlayan bir qövm dərhal bu fikri reallıqda tamamən gerçəkləşdirməyə qalxmaz, qalxa bilməz. Məqsədə çatıncayadək keçiləcək bir xeyli mərhələ, görüləcək bir çox iş vardır. Milliyyət fikri aşılanmış bir qövm öz milləti ilə ilgili kültürəl olaylara böyük bir dəyər verməyə başlar. Kültürəl olayların ən önəmlisi dildir. Öz dilinin ciddi incələmələriylə uğraşan, öz dilinin bağımsızlığı və gəlişməsinə lazımınca çalışan qövmlərdə milliyyət fikrinin varlığına, heç olmazsa milliyyət duyğusunun çox qüvvətli olduğuna hökm edə bilərik. Ciddi dil incələmələri, orta çağdakı kimi “sərfiyyun və nəhviyyun” (dil bilginləri) tərzində cılız incələmələrlə qalmaz, zamanımızın filoloji üsullarına qədər gedər. Yəni dil incələnməsi, qövmün qaynaqlarını araşdırmaya sövq edər. Filoloji ilə qövmün ən əski həyat dövrü, ən əski kültürəl və dastani olayları tapılır və müəyyənləşdirilir. Filoloji və tarix araşdırmaları, etnoqrafiya və arxeologiya incələmələrini zəruri edir. Bu bilgilər sayəsində qövmün bütün keçmişi, ilk dövrlərinə qədər aydınlanır. Qövmün maddi və mənəvi kültürü anlaşılır. Eyni zamanda, qövmün mövcud durumuna aid coğrafi, demoqrafik, etnoqrafik və iqtisadi bilgilər toplanır, düzənlənir. Bütün bu bilgi sayəsində qövmün kültür xəzinələri, iqtisadi qüvvəti, mədəniyyət səviyyəsi öyrənilir. Qısası, qövmün özəlliyi, mənliyi, şəxsiyyəti açıqlanır və aydınlanır. Əgər bu özəllik milliyyət fikrinin meydana çıxmasına yetərli şərtləri daşıyırsa, milliyyət fikri mütləq meydana çıxar. Yoxsa fikrin meydana çıxması, yetərli şərtlərin meydana çıxmasına bağlı qalır və milliyyət düşüncəsi tərəfdarları və qövmün liderləri bu şərtlərin meydana çıxmasına çalışıb çapalarlar.

Yuxarıdakı açıqlamaya görə, türk qövmlərindən hansında ilk öncə milliyyət fikrinin özünü göstərdiyini təyin edə bilmək üçün, bu qövmlərdən hansının dilinə, kültürünə, tarixinə və b. aid

incələmələrə təqvim etibariylə daha öncə başlanmış olduğunu müəyyən etmək lazımdır. Bu məsələyə dair əlimdə bir qədər material var. Ancaq bu qaynağın məsələni qəti şəkildə həll etməyə yetərli olmadığını etiraf edək. Hökmlərim, təbii mövcud materiala görədir. Xətalı hökmlərim, mənə məlum olmayan qaynaqlara dayanılaraq düzəldilirsə, milli tariximizə xidmət edilmiş olar.

**Batı türklərinin Avropa ilə ilişkiləri**

Batı, yəni Səlcuq və Osmanlı türklərinin Avropa ilə ilişkiləri çox qədimdir. Ancaq Avropa mədəniyyətinin, Avropa fikirlərinin Batı türklərinə təsiri və nüfuzu, ancaq XVIII yüzilin ortalarından etibarən duyulmaya başlar. Bu olay, islam mədəniyyətiylə Avropa mədəniyyəti arasındakı müvazinətin ancaq XVII yüzil başlarından etibarən islam mədəniyyəti zərərinə pozulmasıyla açıqlana bilir. Batı türklərinin çoxu, XIX yüzil boyunca belə, Avropa mədəniyyətinin üstünlüyünü tamam qəbul etməmişdilər. Bununla bərabər, Osmanlı dövlətinin qorunması və idarəsini üzərinə götürənlər, XVIII yüzilin ortalarından başlayaraq, Avropa mədəniyyətinin, heç olmasa maddi mədəniyyətinin üstünlüyünü, çox qəti dəlillər önündə təsdiq və qəbul zorunda qalmışlar. Maddi mədəniyyətin mənəvi mədəniyyətlə sıx bağlılığı da çox keçmədən sezildi. XIX yüzilin ortalarına doğru Osmanlı dövlətinin idarəsi altında bulunanlar, bəzi Osmanlı gənclərini yalnız maddi mədəniyyətin texniki yönlərini öyrənmək üçün deyil, Avropa mədəniyyətinin digər qisimlərindən də yararlanmaq üçün Fransaya, İngiltərəyə göndərdilər. İkinci Mahmud zamanında başlayan bu hərəkat, ondan sonra taxta keçənlərin zamanında da, gedənlərin sayısı artaraq davam etdi. Avropanın orasından-burasından tale arayaraq Osmanlı ölkəsinə, Osmanlı başkəndinə gələn və islamiyyəti qəbul edərək dövlət məmuriyyətlərində xeyli yüksək mərtəbələrə qədər çıxan bir qisim yabançılara Osmanlı tarixinin hər dövründə rastlanır, bunların içində dəyərli adamlar da yox deyildi. XIX yüzilin ortalarına doğru Lehistan ihtilaliylə Avstriya-Macarıstan qarışıqlıqları, sığınanların miqdarını artırır və yüksək sosial təbəqələrə mənsub, ciddən elm və sənət sahibi bəzi kimsələri Osmanlı ölkəsinə atar. Osmanlı aydınları, bunlarla tanış olur. Danışır, onlardan dil öyrənirlər. Və bu tanışlıqdan Avropa mədəniyyəti haqqındakı bilgiləri artır. Bəzi gənclərin Avropaya getməsi, bəzilərinin Avropadan gəlməsi, bəzi sığınanların Osmanlı əsgərləri və məmurlarının arasına getməsi, osmanlıların oxur-yazar, elm adamı, əsgər və məmur təbəqələri arasında Avropa fikirlərinin yayılmasına xidmət edir. Yenə o sıralarda Tibbiyyə məktəbi, Mühəndis məktəbi, Hərbiyyə məktəbi, nəhayət Qalatasaray açılır və Avropadan müəllimlər gətirdilir.

Avropa fikrinin Osmanlı türkləri, daha doğru bir deyimlə, müsəlman osmanlılar içinə yayılmasında müsəlman olmayan Osmanlı əhalisinin də təsirləri olduğunu sanıram. Məsələn, əski Osmanlı təşkilatında yüksək məqamlara sahib olan Fənərli bəylər, XVIII, bəlkə XVII yüzillərdən

bəri Avropa mədəniyyətindən feyz almaqdaydılar. “Divani-humayun” tərcümanlığının, Eflak və Buğdan bəyliklərinin adətən gediklisi sayılan bu Rum əsilzadələri və dövlət böyükləriylə, hökumət məmurlarıyla təbiatıyla təmasda bulunurdular; yönətici məmurlardan gözü açıq, qulağı dəlik olanlar, bu təmaslardan meydana gələn müşahidələr üzərində düşünməkdən və beyin yormaqdan uzaq qala bilməzdilər.

İştə, belə müxtəlif yollarla Avropa mədəniyyəti, Avropa fikirləri müsəlman Osmanlılar arasına girir və nüfuz edirdi.

XIX yüzilin ilk yarısı Avropada bir çox yeni fikrin qaynadığı və bu fikirlərin fəaliyyət sahəsinə keçməsi üçün millətlərin, zümrələrin çarpışdığı bir dövrdür. Yüzilliyin başlarında fransız ihtilalı, Napolyon imperatorluğu bütün Avropanı qarışdırmışdı. Milliyyət fikrinə dayanan almanlar, italyanlar, ispanlar, Napolyon zorbalığının son dövrlərində imperatora qarşı milli üsyanlar hazırlamış və həyata keçirmişdi. Milliyyət fikrinin tarix, hüquq və ədəbiyyat cəbhələrində çox ciddi çalışan almanlar, italyanlar və slavyanlar alman birliyini, italyan birliyini, Avstriya ayrılmasını, slavyan birliyini hazırlayırdılar. Hürriyyətçilik, xalqçılıq və soaialistlik məzhəbləri düşüncəsi də, bu yarım yüzildə daha yaxşıca işlənmişdi. Yüzilin ortasına doğru, özəlliklə mərkəzi Avropada, Osmanlı səltənətinin əski qonşusu Habsburqlar məmləkətində bu dəyişik fikirlərin gerçəkləşdirilməsi arzusundan doğan böyük bir qasırğa qopmuşdu...

Osmanlı dövləti yönəticilərinin, aydınlarının bu olayları eşitməmiş, öyrənməmiş və bunların səbəblərini araşdırmamış olması qəbul edilə bilməz. Özəlliklə, Avstriya və Macarıstan qasırğası, sovurduklarından bəzilərini Osmanlı ölkəsinin sərhədləri içinə qədər fırlatmışdı, özəllilklə o olaylara çox bənzəyən Eflak və Buğdan qarışıqlıqları, Mora üsyanı, Serblərin hərəkətləri göz önündə cərəyan etmişdi və ya edib durmaqda idi. Bununla bərabər, çox qəribədir ki, Tənzimat dövrünə qədər Osmanlı yazılı əsərləri içində, Osmanlı dövlətinin həyatı və gələcəyi ilə ilgili bu çox önəmli olayların fikriyyatını açıqlayan və bu fikriyyatı Osmanlı dövlətinin əsas ünsürləri haqqında tətbiqə çalışan heç bir əsərə rast gəlmədim.

## Tənzimat və Yeni Osmanlılar

Tənzimat dövründədir ki, bəzi işlərlə bəzi yazılar Avropada qaynayan hüquqi, siyasi, sosial, ədəbi bəzi fikirlərin, nəhayət müsəlman Osmanlıların beyinlərinə qədər gəlib yetişdiyini göstərir. Ümumiyyətlə, türklərin milli ruhiyyələrini incələdik iddiasında bulunanlar, bu qövmün düşüncələrdən çox işə dəyər verdiyini söyləyərlər... Bu hökm çox da xətalı olmasa gərəkdir. Gerçəkdən türklərin teori və fikriyyat ilə uğraşıb yorulmaqdansa, başqalarının teorik düşüncələrindən çıxan praktik nəticələri tətbiq ilə işi asanlaşdırmağı üstün tutduqlarını göstərən

tarixi hadisələr çox çoxdur. ...Haqqında danışdığımız sahədə də eyni psixoloji durumun təzahürlərini görməkdəyiz. Avropa fikirləri əsaslarından yaxşıca incələnib, o əsaslara görə Osmanlı sosial həyatının incələnməsi ilə əldə olunacaq əsil nəticə düşünülmədən, yəni teori və düşüncə vadisində zehin yorulmadan səthi olaraq öyrənilən bəzi Avropa düşüncələrinin Avropaca kəsinləşmiş bəzi praktik nəticələri Osmanlı sosial həyatına, yuxarıdan və aşağıdan, yəni hökumətin idarəsini əldə tutan dövlətin yönəticiləri ilə hökumətin idarəsini bəyənməyən aydınlar tərəfindən tətbiqə qalxıldı ki, bunun yuxarıdan başlayanı "Tənzimat", aşağıdan gələni "Yeni Osmanlılıq" hərəkatı adını aldı. Hər iki hərəkat da iş və düşüncədən çox uzaqdır. Hər iki hərəkatın düşüncələrinə dair ciddi əsərlər axtarıb tapmaq çox çətindir...

1865-ci ildə yəni Əbdüləzizin taxta çıxmasından dörd il sonra qurulan "Yeni Osmanlılar" cəmiyyətinin quruluş oturumunu, şəxsən cəmiyyətə daxil olması səbəbiylə əsli qaynaqlardan öyrənmiş olması gərəkən Əbüzziya Tofiq bəy "Yeni Osmanlılar tarixi " adlı əsərində belə nəql və hekayə edər: "İlk toplantıya cəmiyyətin qurucularından Sübhipaşazadə Ayətullah bəy[1]" Karbonari cəmiyyəti və Lehistan Gizli Cəmiyyəti ilə ilgili iki mühüm kitabı ilə birlikdə gəlir. Toplantıda şair Namiq Kamal bəy də hazırdır. Ayətullahın gətirdiyi kitablar oxunaraq inqilab cəmiyyətinin quruluşuna təşəbbüs haqqında müzakirə aparılır." "Yeni Osmanlılar" Cəmiyyəti üzvlərindən Əbüzziya Tofiq bəy, ilk toplantını anlatdıqdan sonra belə bir görüş bəyan edir: "Bu altı vətənpərvər adam o Karbonari qanunlarını, o Sardonya kimi kiçik bir dövləti... bir İtalya dövləti halinə gətirən Kömürçü adlı fədakar gənclərin qərarlı girişimlərini və baş ucalığı işlərini oxuduqca, kim bilir milliyyətçiliyin necə kükrəmiş arslanı, hürriyyət şərabının necə bir nəşəli keyfli sərxoşu kəsilirdilər". Bu ilk toplantının təsviri və təsvir edən Əbüzziya bəyin səmimi düşüncələri çox açıq göstərmirmi ki, bu çox hürriyyətçi, idealist aristokrat balalarının, o zamanlar Avropanı qarışdıran fikir axımları və o axımların praktiki ortaya çıxışları haqqında o qədər açıq bilgiləri yoxdur. Öz məmləkətlərinin durumlarını və olaylarını təhlil edib görəcək dərəcədə nəzəri hazırlıqları da yoxdur. Nə özləri, nə onlardan öncə gələnlər, Osmanlı sosial həyatını incələmək üçün Avropanın incələmə metodlarından istifadə edərək, bir düşüncə sistemi, bir ideoloji hazırlamışdılar. Karbonarilər cəmiyyətinin nizamnaməsini çevirmək və onun hökmlərinə görə fəaliyyətə keçməklə hər şey olub bitər, istənən nəticələr əldə edilir sanmışlardı!..

Fransız siyasi yazarlarından Enqelhard "Türkiyə və Tənzimat" adlı məşhur əsərində "Yeni Osmanlılar" fransızca adıyla "Le Jeune Turquie" (Gənc Türkiyə)yə[2] dair məlumat verərkən bu siyasi axımın proqramı olmaq üzrə Tunisli Xeyrəddin Paşanın 1868-ci ildə basılmış olan "Reformes necessaires aux Etats musulmans" ("İslam hökumətlərinə gərəkli islahat") adlı risaləsini göstərir və

---

[1] "Türk ocaqları" Mərkəz Kurulu başkanı Həmdullah Sübhi bəyin kiçik qardaşıdır.

[2] Bu fransızca addan "Gənc Türklər" ifadəsi ortaya çıxmış və bu ifadə, "Yeni Osmanlılar" və "Gənc Osmanlılar"ın sinonimi olaraq işlədildiyindən, bu ifadə "Yeni Osmanlılar" axımında türk milli fikrinin varlığını göstərməz.

qısaca təhlil edir. Bu risalədə Osmanlı dövləti, əhalisinin din və irqi dəyişik bir islam səltənəti olaraq ələ alınmışdır. Tunisli Paşanın görüşünə görə, bu səltənətin islahı üçün gərəkli tədbirlərin əsası, Qanuni Sultan Süleymanın "Qanuni-Siyasi"sini genişlətmək və islah etməkdən ibarətdir. Osmanlı səltənətinin o əski qanunu genişləndirilərək və islah edilərək uyğulanırsa, elm adamları və vəkillərin siyasi vəzifələri Avropanın anayasalı (konstitutsiyalı) hökumətlərindəki Məclisi-Məbusan səlahiyyətlərinin eyni olur.

Enqelhard belə hesab edir ki, Xeyrəddin Paşanın irəli sürdüyü görüşlər, o zamanlar müsəlmanlar arasında yayılmaqda olan, məqsədi və təşkilatı gizli bir siyasi cəmiyyətin -"Gənc Türkiyə"nin düşüncələrinin tərcümanıdır. Mən Enqelhardın yanıldığına inanıram: Əbdüləziz dövrü Gənc Osmanlıların proqramı, Xeyrəddin Paşa risaləsində görülən açıqlığa sahib deyildi; və bu açıq olmama durumu, Gənc Osmanlılıq hərəkatının Osmanlı səltənətinin də son təcəllisi olan "İttihad və tərəqqi" dövründə də davam edib getdi. Yeni osmanlıların içində Sultan Süleymanın XVI yüzildən qalma "Qanunnamə"sini genişlətmə və islah yoluyla XIX yüzilin son yarısında tətbiq etmək istəyənlər tapılsa belə, çoxluq daha radikal yollardan yürümək tərəfdarı idi. Əbüzziya bəyin "Yeni Osmanlılar Tarixi"ndə göründüyü kimi, Namiq Kamal kimi, Ayətullah kimi gənc aydınların əsil ilham qaynaqları fiqh və "Qanunameyi-Süleymani" deyil, Avropa dövlətlərində tətbiqini gördükləri və ya eşitdikləri əsas qanunlardı, bununla bərabər, iki ayrı inkişaf tərzinin nümunəsi olan hüquqi və siyasi quruluşları bir-birinə qarışdırmaqdan da tamam vaz keçə bilmirdilər. Bu yöndən Yeni Osmanlıların sırf hüquqi bir baxımdan belə işlənmiş bir ideologiyaları, açıq bir proqramları olduğu söylənə bilməz.

Tənzimatın düşüncə sistemi ilə "Gənc Türkiyə"ninkindən bir az daha artıq uğraşılmışdır. Xarici dövlətlərin təzyiqindən doğan zərurətlərə qarşı Osmanlı dövləti rəhbərləri tərəfindən alınmış praktik və empirik, siyasi, idari və iqtisadi tədbirlərin bütünüdür ki, Osmanlı tarixində Tənzimat adını alır. Tənzimatın ayrıca özəlliyi təqliddir. Tənzimat ilə Avropa təqlid edilmək istənmişdir. Dəniz kapitanı Xəlil Paşa 1830-cu il tarixində bu sözləri söyləmişdir: "Rusiyadan qayıdıram. Dönüşümdə hər zamandan çox inandım ki, əgər Avropanı təqlidə sürətlə girişməsək, bizim üçün Asiyaya dönmək məcburiyyətindən başqa çarə yoxdur".[1]

Tənzimatda təqlid olunan şey, əsaslardan və metodlardan çox praktik nəticələrdi. Tənzimat Nizami-Cədidin (yeni nizamın) davamıdır. Nizami-Cədid Avropanın silahlarını satın aldı. Avropavarı əsgər paltarları tikdirdi, Avropanın hərbi təlimatlarını tərcümə etdirib tətbiq etməyə çalışdı. Tənzimat da Avropanın müasir libaslarını hər kəsə geydirdi. Cəza və ticarət qanunlarını tərcümə etdirdi, Avropa dövlətlərinin maliyyə və idarə təşkilatını belə təqlidə çalışdı. Tənzimat axımı, sonra bir az daha incələşərək, düşünmək, düşüncəsini ifadə etmək, düşüncəsini yazmaq

[1] "Türkiyə və Tənzimat", (Əli Rəşad bəy çevirisi), s. 6

tərzlərinə də təsir göstərdi. Bu hadisə, müsəlman Osmanlı sosial həyatında dünyaya baxışın dəyişilməyə başlaması demək idi. "Türkiyə və Tənzimat" yazarı, "Tənzimatın ümumi məqsədi islami sosial həyatı, yüzillərlə zamandan bəri mənən və siyasətən ayrı yaşamış olduğu xristian sosial həyatına yaxınlaşdırmaqdı" -deyir. Bu məqsədin xariclə və alışqanlıqla ilgili yönü, ümumiyyətlə itaətə alışmış müsəlman Osmanlı əhalisi üzərinə az bir çətinliklə tətbiq edildi. Fəqət içsel, fikri və vicdani sahələrdə başarı, ancaq düşünsel çalışmaların təsiri ilə əldə edilə bilərdi. Bu ideoloji nöqsanın mənfi nəticələri yaxın zamanlara qədər özünü göstərmişdir.

Yeni Osmanlılar hərəkatı, nəzəri yöndən Tənzimatı tamamlayır. Yeni Osmanlılar, Tənzimatın idarə hüququ ilə ilgili tədbir və qanunlarından çox da irəli getmək istəməyən ehtiyatlı addımlarını cəsarətlə anayasa hüququ sahəsinə keçirərək hökmdarın və hökumətin hüquq və yetkilərini məhdudlaşdırmaq və xalqın hüquq və hürriyyətini genişlətmək əməlini daşıyırdılar. Yeni Osmanlılar, bir baxımdan Tənzimatçıların radikalları idi, fəqət bu radikallıq bəzən geriçi idealizmlə qarışırdı. Anlaşılmazlıqlarının əsas ağırlıq mərkəzi, hökumət və hökmdarın hüquq və səlahiyyətləri ilə millətin hüquq və hürriyyətinin qarşı-qarşıya gəlməsi məsələsi idi.

Yeni Osmanlıların siyasi ədəbiyyatında "vətən", "millət", "hüquq", "hürriyyət" kəlmələri çox-çox işlənər. Tənzimatın rəsmi sənədlərində isə, mənaları etibarı ilə Batıdan gəlmiş bu sözlərin çox istifadə olunmasından çəkinilir.

**Tənzimatçılarla Yeni Osmanlılarda Milliyyət qavramı**

Tənzimatçıların və Yeni Osmanlıların dilində millət sözünün mənası çox önəmlidir. Bu sözü fransızcanın "La Nation"u qarşılığında istifadə etmələrinə baxmayaraq, fəqət birləşmiş fransız milləti ilə Osmanlı dövlətinin əhalisi olan müxtəlif qövmlər kütləsinin, milliyyətə baxış açısından çox fərqli olduğuna diqqət yetirməmiş kimi görünürlər. Avropadakı fikirlər və reallıq, yuxarıda söylədiyimiz kimi, əsaslarından araşdırılıb Osmanlı sosial həyatı bu əsaslara görə incələnmədiyindən, Osmanlı sosial həyatında milliyyət məsələsi lazımi səviyyədə təhlil edilib aydınlaşmamış, millət kəlməsinə açıq bir məna verilməmişdir. Tənzimat və yeni Osmanlılıq düşüncəsinin yaxşı işlənməmiş olduğuna açıq bir dəlil də, millətin tərifsiz qalmış olmasıdır.
Millət sözünün teoridə tərifinə girişmək, Osmanlı sosial həyatının praktikdə pozulmasına yol açacağından Tənzimatçıların və Yeni Osmanlıların bundan şüurlu olaraq qaçındıqları savunula bilir. Ya da Osmanlı təbəəsinin bütününü gerçəkdə var olan bir millət təsəvvür edərək, millət təbirini də o gerçəyi ifadə etmək üzrə qullandıqları söylənilə bilir. İkinci bir görüş olaraq Tənzimatçıların da, Yeni Osmanlıların da Avropada bütün siyasi həyatı qarışdıran milliyyət hərəkatını, Osmanlı ölkəsində olub-keçən milli ihtilalları ya eşitməmiş, ya da bu olayların mahiyyətini haqqıyla

anlamamış olmaları düşünülə bilir ki bu görüş, əlbəttə yanlışdır... Ancaq gerçəkdə var olmayan milləti, fikrən mövcud kimi təsəvvür edərək bu təsəvvürün gerçəkləşməsi ümid və amalı ilə millət ifadəsinin təhlil və tərifindən qaçınmış olmaları görüşü daha tutarlıdır. Bu durumda Yeni Osmanlıların müsəlman-qeyri-müsəlman, türk, qeyri-türk, bütün Osmanlı dövləti əhalisini, gerçəkdən deyilsə belə, düşüncə olaraq bir millət fərz etmiş olduqlarına hökm etmək lazımdır. Yəni Yeni Osmanlılar da, Tənzimatçılar kimi, indi istifadə etdiyimiz ifadələrə görə, Osmanlıçı idilər. Bu zümrənin fransızca adları "Les Jeunes Turqes" (Gənc Türklər) olduğu halda[1] türkcə özlərinə "Yeni Osmanlılar" adını verməleri də qayələrindən irəli gəlməkdədir. Fəqət bizim bu hökmlərimiz əsərlər və qaynaqlardan çox, məntiq yürütmə yolu ilə çıxardığımız nəticələrə əsaslanır, əsərlər və sənədlərlə təsdiqlənməsinə gərək vardır.

Millət təbiri belə anlaşılmaz və ümumi qaldıqca, belə anlaşılmaz və ümumi qalması gərəkli sayıldıqca, siyasi sahədə türklük təbiətiylə müzakirə mövzusu ola bilməzdi. Gerçəkdən Tənzimat dövründə "türk", "türklük", "türk milləti", "türk milliyyəti" kimi ifadələrə rast gəlinməz[2]. Və bu gün bu ifadələrlə ifadə edilən qavramın da o zamanlar açıqlıqla bilindiyini isbat edən dəlil və faktlar tapılıb göstərilə bilməz. Ancaq milli duyğu və düşüncənin büsbütün yox olmadığına dair dil, ədəbiyyat, filologiya və tarix sahəsində bəzi faktlar vardır.

---

[1] Bu təşkilatın adı olan "La Jeune Turquie"ün o sıralarda Avropanın hər tərəfində bilinən "Gənc İtaliya", "Gənc İsveçrə" kimi hürriyyətçi və xalqçı təşkilatlardan ilham alınaraq qoyulduğu qətidir.

[2] Tənzimat dövrünün sənədləri qarşılaşdırıldığında "Türküstan" kəlməsinin ara-sıra işləndiyi görülürsə də, bunun, fransızca "La Turquie" təbirini eynən çevirmə arzusundan doğduğuna şübhə ola bilməz.

**Tənzimat ədəbiyyatında türkçülük izləri: Şinasi və Ziya Paşa**

Məsələn, Tənzimat ədəbiyyatının babası olan Şinasi tərəfindən Tərsanə naziri Zivər Əfəndiyə təxminən 1845-ci il tarixində yazılan bir təbrik məktubunun ön sözü balaca bir qitədir ki, birinci misrası fransızca, ikincisi sırf türkcə, üçüncü və dördüncüləri isə ərəbcə və əcəmcədir. Şairin bu əsərində türkcəyə də, fransızca, ərəbcə və əcəmcə kimi bağımsız bir yer vermək istədiyi sanıla bilir. Şinasinin bu misrası, o zamana qədərki çoxlu türkcə Bəktaşi nəfəsləri, aşıq türküləri, xalq mahnıları kimi içgüdü ilə meydana gələn bir nəğmə deyildir. Milliyyət fikirlərinin Avropa həyat və siyasətinə önəmli, hətta fəci təsiri görülürkən, Parisdə olan Avropa düşüncəsi və elmləri haqqında geniş bilgi sahibi olmuş, Parisin elm adamları və ədiblərinin toplantılarına girə bilmiş çox şüurlu bir türkün düşünərək, çalışaraq yazdığı bir sətirdir:

“Ululuğun dənizində görəməz kimsə qara...”

İndi bu misracığı Şinasinin ikinci dəfə Parisə getdiyi zaman türkcənin bir sözlüyünü yaratmaq cəhdi ilə qarşılaşdıracaq və sonra o zamanlar “Lisani-osmani” deyilən dili, danışılan türkcəyə yaxınlaşdırmaq üçün çəkdiyi əməklərlə sadə türkcə bəzi mənzumələr (məsələn, “Qaraquş yavrusu ilə qarğa hekayəsi”) yazmağa uğraşmasını da xatlırlayacaq olursaq, Batı düşüncəsini və durumunu Avropaya gedən digər yoldaşlarından çox daha yaxşı anlamış olan bu mütəfəkkir(düşünür) yazarı, dil və ədəbiyyat sahəsində türkçülüyü ilk sezmiş bir Osmanlı türkü deyə qəbul edə bilərik görüşündəyəm. Və bu görüşümüzdə yanılmırıqsa, Batı türklüyünün dil və ədəbiyyatında ilk türkçülük bəlirtisi, XIX yüzilliyin ortalarında ortaya çıxmış olur -deməkdir.

Tənzimat dövrü şairlərindən Yeni Osmanlılar siyasi zümrəsinə də qatılmış olan Ziya Paşanın dil və ədəbiyyat sahəsində türkçülüyü Şinasidən daha açıqdır. Məşhur “Şeir və inşa” məqaləsi, bu mövzuda bir dəlil kimi göstərilə bilər. Ziya Paşa bu məqaləsində Osmanlı təbirini türk qarşılığında, yəni Tənzimatdan öncəki mənasında işlədərək əski Osmanlı şairlərinin əsərlərini xatırlatdıqdan sonra deyir ki: “...Xeyr! Bunların heç birisi Osmanlı şairi deyildir... Əcəba, bizim mənsub olduğumuz millətin (yəni türk millətinin) bir dili və şeiri varmıdır və bunu islah mümkündürmü?” “İçlərində üçdə bir türkcə kəlmə tapılmayan və çox zaman zehin yormadıqca məna çıxarılmasına müqtədir olunamayan” əski əsərləri bəyənmir, türkcə imlasının sistemsizliyini, türkcədə işlənilən kəlmələrin sınırsızlığını, türkcə və ya osmanlıca qaydalarının düzənlənməmiş olduğunu tənqid etdikdən sonra türklərin təbii şeirinin Baki, Nəfi, Nədim və Vasiflərin mənzumələri, türklərin təbi-inşasının Veysi və Nərgisilərin nəsrləri olmadığını qəti şəkildə ifadə edir: “...Xeyr! Bizim təbii şeir və inşamız əyalət xalqıyla İstanbul əhalisinin xalq təbəqəsi arasında hələ durmaqdadır. Bizim

şeirimiz hanı şeirlərimizin ahəngsiz deyə bəyənmədikləri xalq şərqiləri və saz şairləri arasında "deyiş", "üçləmə" və "qayabaşı" adlanan parçalardır və bizim təbii inşamız "Mütərcimi-qamus"un işləndiyi yazı yazma tərzidir. Hələ bir kərə rəğbət o yönə dönsün, az vaxt içində nə şairlər, nə katiblər yetişir, ağla heyrət verir".

Sonradan dildə türkçülük məsələsi ilə məşğul olan nəzəriyyəçilər Paşanın XIX yüzil sonralarında qoyduğu bu məsələlərə çox bir şey əlavə edə bilmiş deyillər...

Dildə türkçülüyü bu qədər yaxşı qavramış, Osmanlı ilə türk ifadələrini bərabər anlamlı olaraq istifadə etmiş şair və ədib Ziya Paşanın Yeni Osmanlılar cəmiyyətinin öndərlərindən siyasi Ziya Paşanı çox işlətdiyi millət və milliyyət ifadələrinin siyasi mənalarını incələmə və aydınlaşdırmağa sövq etməmiş olması çətin qəbul edilər, bununla bərabər Ziya Paşanın əsərlərindən siyasi türkçülüyünü çıxaracaq heç bir ipucu tapıb çıxara bilmədim.

**Dildə, "Bütün türkçülük"ün ilk izləri: Əhməd Vefiq Paşa**

Dildə türkçülük Ziya Paşadan sonra dildə incələmə sahəsinə keçir. Dildə incələmə Osmanlıca ləhcəsindən başqa türk ləhcələrinin öyrənilməsinə sövq edər. Türkçülüyün bu mərhələsini Əhməd Vefiq Əfəndidən (Paşadan) etibarən görürük. Şinasinin toplamağa başlayıb da tamamlamağı bacarmadığı "Sözlük"ün hazırlanmış qismləri Osmanlı ölkəsi sərhədləri xaricində qalmışdı. Türkcə kəlmə toplama işini Əhməd Vefiq Paşa davam etdirdi. Əhməd Vefiq Paşanın *"Ləhceyi-Osmani"*si bu çalışmanın dəyərli nümunəsidir. Paşanın *"Ləhceyi-Osmani"*yə yazdığı dəyərli ön söz bütün türklüyü düşündüyünü göstərən bir sənəddir.

"Ləhcəyi-Osmani"nin birinci nəşrini görə bilmədim; basım və yayın tarixini müəyyən edə bilmirəm. Əlimdə olan "yeni basım"ın basılış tarixi 1306-dır. Bu yeni nəşrin tarixsiz ön sözünün sonlarında yazar deyir ki: "Türk dilləri içində ən öncə yayılan oğuz şöbəsi, Tatarıstan və Türküstanı bir zaman Bəhre-Şərqidən Macarıstana qədər qavrayıb, hələ "Quz dili" deyilir. Onun yenisi olan türkmən dili İranı və Suriyanı əhatə edib Anadoluya enmiş, zamanla *ləhceyi-osmaniyi* [1] doğurmuşdur. Fərqanədən, Hində qədər yayılıb Xalacı Əfqan dilinə qarışmışdır. Əski şöbələrdən qıpçaq dili Xivədən Siber, Qırğız, Kuman və Bolqar kimi Kazan çevrəsini istila etmişdir. Və Uyğur dili Çin tərəflərindən Kaşğara doğru yayılıb ondan, 700 tarixlərində Çingizxan qövmləri türk və islamiyyətə girdiklərində Cığatay dili doğub, 800 illərində çox yayılmışdır. Bu gün uyğur, qıpçaq və Cığatay katibləri "Məhbubul-qülub" ("Könüllərin sevgilisi: böyük türk şairi Əlişir Nəvainin əsəri) kimi gözəl əsərləri və xüsusən 600-dən 800-ə qədər meydana gələn Səlcuqlu türkmənləri və Osmanlı katibləri dönə-dönə basılıb, bunların yaxşıca incələnməsi ilə dilimiz şöbələrinin ayrılıqları

---

[1] Kursiv mənimdir -(A. Y.)

anlaşılmışdır. "Himmətül-rical taqlaül-cibal" ("Bacarıqlı insanların himməti dağları yerindən sökər"), Əhməd Vefiq"[1].

Bu ön sözdən Əhməd Vefiq Paşanın türk dilinə çox geniş -"bütün türklər" kimi baxdığı anlaşılır: əsl dilimiz həmən bütün Asiya ilə Batı Avropaya yayılan böyük dildir; "Ləhceyi-0smani", "Ləhceyi- Cığatay"... və b. bu dilin şöbələrindən, ləhcələrindən ibarətdir. Bu ləhcələrin yaxşı incələnməsi ilə "dilimiz şöbələrinin ayrılıqları" anlaşılır və ayrılıqlar anlaşıldığı kimi birlik nöqtələri də meydana çıxır. Qısacası, Əhməd Vefiq Paşa, dil vasitəsi ilə çox geniş türk birliyini görmüş və göstərmişdir, deyə bilərik.

Vefiq paşa "Ləhceyi-Osmani"sində ilk dəfə əsli ərəbcə və farsca olmayan türkcə yazıları əsli ərəbcə və farsca olanlardan ayıraraq ayrı bir bölüm halında düzənləmişdir. Bu şəkildə sərhədsiz Osmanlı dil dənizində boğulmuş dəyərli türk kəlmələrinin çoxluğunu və önəmini göstərmişdir. Və türk dilinin ərəbcə və əcəmcəyə məğlub olan Osmanlı ləhcəsindən başqa ləhcələri olduğunu meydana qoyaraq gerçək elmi maraqları onların incələnməsinə təşviq etmişdir.

Əhməd Vefiq Paşanın bütün əsərləri onun dil sahəsində çox şüurlu bir türkçü olduğunu göstərir. Məsələn, Fenelonun "Telemax"ını Veysi və Nərgisi ləhcəsi ilə çevirmiş olan Yusif Kamil Paşaya qızaraq çox sadə bir türkcəylə çevirdiyi kimi, Molyerin bəzi əsərlərini o zamankı Osmanlı həyatına uyduraraq İstanbulda danışılan türkcə ilə türk səhnəsi üçün çevirmişdir.

Əhməd Vefiq Paşanın türkçülüyü dildən tarix sahəsinə də keçmişdir. Paşa, daha Əfəndi ikən Əbülqazi Bahadır xanın "Evsali-şəcəreyi-türki" adlı məşhur əsərini Cığatay ləhcəsindən Osmanlı ləhcəsinə çevirmişdir.

Bu əsər qismən Şinasinin "Təsvire-əfkar"ında hissələr şəklində yayınlanıb, sonra bir risalə halında ayrıca basılmışdı.[2] "Şəcəreyi-türki"nin "Təsvire-əfkar"da təfriqə olunması da Şinasi Əfəndinin türkçülüyə ilgisini göstərən əlamətlərdən biri sayılsa, xəta edilmiş olmaz.

Əhməd Vefiq Paşanın yazarlıqla bərabər, professor olaraq çalışdığı da bilinməkdədir. Əbdüləziz səltənəti dövrünün ilk illərində açılan darülfünunun ilk ümumi tarix professoru odur. O zamanlar Divani-Müsahibat başqanı olan atufetli Əhməd Vefiq Əfəndi həzrətləri ilk dərsini 1279 şabanının 27-si, bazar günü (şubat 1863) vermişdi.[3] Tezliklə kəsilən bu ümumi tarix dərslərinin əsasları da kiçik bir risalə halında nəşr olunmuşdur.[4] Ümumi tarixin ən əski dövrlərinə aid bəzi

[1] "Ləhceyi-Osmani", Təbe-cədid Əsər Hameyi Əhməd Vefiq Paşa", Mahmud bəy mətbəəsi, İstanbul, 1306.
[2] "Evsali-Şəcəreyi-Türki". Əbülqazi Bahadır xan bin Arab Məhəmməd xanın əsəridir. (Bir mərifətli şəxs tərəfindən İstanbul türkcəsinə çevrilmişdir) Birinci dəfə olaraq nəşrinə təşəbbüs göstərildi. Tarix və mətbəə adı yoxdur. 152 səhifə, yarımçıq. (Bab və ya fəsil nəhayətinə belə gəlinmiş deyildir.)
[3] "Darülfünun dərsləri"- "Münif məcmuəyi-fünun", birinci sənə, №8, şaban 1279, s. 331.
[4] Atufətli Əhməd Vefiq Paşa Əfəndi həzrətlərinin darülfünunda verdiyi Hikməti-tarix dərsinin özətidir. *Kitabe- əvvəl, kismı quruni müqəddimə, cüzi-əvvəl.* Kuruni-məchulə, tarix və mətbəə adı yoxdur. 44 səhifə. Yarımçıq. (Son səhifədə cümlə belə tamamlanmamışdır). Münif Paşa mərhum, darülfünun dərslərindən bəhs edən məqalədə Əhməd Vefiq Əfəndinin dərsinə ümumi tarix adı verirsə də, bu yarımçıq risalənin başında "Hikməti-tarix" deyilməkdədir.

bilgilərdən ibarət olan bu özətdən Paşanın tarixə türkçülük baxımından baxıb-baxmadığını anlamaq mümkün olmur.

Əhməd Vefiq Paşa, bəzilərinə görə, Osmanlı türklərinin ilk türkçüsüdür. Həqiqətən Şinasi və Ziya Paşaya nisbətən, Əhməd Vefiq Paşanın türkçülüyü daha açıqdır, bütün yazılarında, hətta mənkibevi bir şəkil alan həyat tərzində türk milləyətçiliyi gözə çarpır.

"Ləhceyi-Osmani"nin ön sözündəki görüşlərindən, "Şəcəreyi-türk"ü İstanbul türkcəsinə çevirməsindən anlıyırıq ki, Əhməd Vefiq Paşa bütün türklük fikrinə də meyllidir. Bu, belə olmaqla bərabər, Əhməd Vefiq Paşadan öncə gəlmiş Şinasi Əfəndi ilə Ziya Paşanın da türkçülük fikrinə ilgisiz olmadıqlarını, qeyd etdiyimiz bir neçə hadisə göstərməkdədir.

**Filologiya və tarixdə türkçülük: Mustafa Cəlaləddin Paşa**

Ədəbiyyat və dil sahəsində görülən və müəyyən olunan türkçülük axımı, Osmanlı türkləri arasında çox keçmədən filologiya, etnoqrafiya, tarix və xarici siyasət sahəsinə də keçmişdir. Gerçəkdən 1869-cu ildə, yəni Şinasinin ölümündən iki il öncə, Mustafa Cəlaləddin adında bir zat fransızca "Əski və yeni türklər" ("Les Turcs ancients et modernes") adlı bir əsər nəşr etdirir.

Bu əsər, Sultan Əbdüləziz xana ərməğan olunmuşdur. İstanbulda "Courrier d'Orient" qəzeti mətbəəsində basılmış olan 362 səhifəlik bu kitab, Osmanlı dövlətinin yaşamasını qüvvətləndirmə və Osmanlı əhalisinin rifahını təmin üçün dövlət tərəfindən nələr yapılması lazımlılığına dair Sultana təqdim olunmuş uyğulamaya yönəlik bir rapora bənzəməklə bərabər, türkçülük baxımından çox diqqətəlayiq məsələləri əhatə etməkdədir.[1]

"Əski və yeni türklər" kitabının tarih hissəsində bütün türkçülüyün tarixindən fransız, alman, rus və leh qaynaqlarına dayanaraq bəhs edilmiş və göstərilən olaylara dayanılaraq türklərin ümumi tarixdə fövqəladə önəmləri, insanlığın mədəni yüksəlişində çox önəmli payları olduğu isbata çalışılmışdır. Cəlaləddin Paşaya görə, türklər bu gün Avropada yaşayan qövmlərin mənsub olduqları irqdəndir. Yazar bu irqə Türo-Ariyen (Touro Arienne) adını verir; bu münasibətlə Türo-Ariyanizm (Touro Arianisme) dediyi etnoloji nəzəriyyəsinə dalaraq, filologiya və linqvistika sahəsinə keçir.[2]

Kitabın üçdə birindən artığını təşkil edən bu məsələ, ilk baxışdan sırf nəzəriyyədən ibarət kimi görünürsə də, bir az diqqət etsək yazarın siyasi və praktik iki qayə məqsəd qoymuş olduğu seçilə bilir: 1. Osmanlı ölkəsindəki xalqın çoxluğunu və əsil ünsürünü təşkil edən türklərə irqlərinin

---

[1] Mustafa Cəlaləddin Paşanın bu əsərində Avropa dövlətlərinin Osmanlı səltənətinə qarşı necə bir siyasət güdmələrinin mədəniyyətin mənafeyinə uyğun gələcəyinə dair avropalılara yönəlmiş ihtar və təlqinlər də vardır.

[2] "İndo Germanizm", "Ural Altayizm" teorilərinə bənzər olaraq kitablaşdırılan "Türo-Aryanizm" nəzəriyyəsini, son zamanlarda Praqa və Sofiyada oturan mühacir ruslar arasında meydana gəlmiş olan Euro-Arizm (Euro-Arizmə) axımıyla qarşılaşdırmaya dəyər.

qüdrət, qiymət və böyüklüyünü bildirərək onların güvənlərini qüvvətləndirməklə bərabər, özlərini türklərə yad sayan, o sıralarda milliyyət əsasına dayanaraq türklər əleyhinə ayaqlanan və ya ayaqlanmaya hazırlanan ulahlara, bolqarlara, hətta serb və rumlara türklərlə eyni irqdən olduqlarını təlim və təlqin etmək; 2. Özlərini Ariyani sayaraq Ariya irqinə xarüqüladə xüsusiyyətlər yaraşdıraraq digər irqləri, yəni sami, turani və hamiləri insanlığın aşağı cinsindən sayan avropalıların bu eqoist teorilərinə qarşılıq olaraq ortaya atılan və ariyanilərlə turanilərin əsasən eyni irqdən olduqlarını göstərib isbat etməsi gərəkən Turo-Ariyanizm nəzəriyyəsi sayəsində Avropa hökumətlərinin və Avropa xalqının türklərə irqi düşmənliklərini azaltmaq.

Yazarın Türo-Ariyanizm nəzəriyyəsini qurarkən sağlam mənbələrdən istifadə etdiyini iddia etmək zordur; dillə ilgili dəlillərinin bir çoxu səthi bir tənqidə belə dayana bilməz. Mustafa Cəlaləddin Paşanın hökmlərində və təhlillərində də elmi metodlara uyduğunu söyləyə bilmərik. Kitabın bu qismi təkrarlarla, sistemsizliklərlə, bəyənilməyən görüşlərlə doludur.[1] Bununla bərabər, kitabda çox diqqətəlayiq nəticələrlə oxucunun düşüncəsini çox uzaqlara çəkib gətirən geniş görüşlər də az deyildir.

Bizcə, əsərin əsl böyük dəyəri bütün türklük və türkçülük haqqında Avropa qaynaqlarından alınıb, təxminən Avropa metodları izlənərək Osmanlı türkləri arasında ilk yazılan əsər olmasındadır. Bu əsərdə ilk dəfə türk irqinin qüvvət və genişliyinə, bu irqin insanlıq tarixində oynadığı böyük rola, türk dilinin digər dillərdən yardıma möhtac olmayacaq dərəcədə zənginliyinə, türk dilinin başqa dillərə etdiyi yardımlara, Asiya və Avropada geniş bir sahəyə yayılmış olan türklərin ilişkilərinə, Osmanlı dövləti daxilində türklük fikrinə dəyər verilməməsindən doğan sakıncalara, müsəlman olmayan Osmanlı əhalisini irqi və dil cəhətdən türk kütləsinə bağlamaq gərəyinə dair görüşlərə rast gəlirik. Yəni, türkçülüyün dil, tarixi, siyasi qismlərinin hamısından bu kitabda az-çox bəhs edilmişdir. Sırf türkçülüyə aid bu məsələlərdən başqa, bu gün belə aydınlarımızın günlük məşğuliyyətlərini təşkil edən türk dilinin sistemləşdirilməsi və yabançı sözlərdən təmizlənməsi, hərflərin düzənlənməsi və dəyişdirilməsi, qadınların başıaçıq gəzməsi, Batı mədəniyyətinə girməyə layiq olmaq kimi mövzular da "Əski və yeni türklər"in çeşidli məsələləri arasında yer tutmuşdur.

Türo-Ariyanizm nəzəriyyəsini yaradan yazar, türklərin Batı mədəniyyətinə girmələrini, o nəzəriyyənin məntiqi bir nəticəsi kimi qəbul edir, zatən Batı mədəniyyətini meydana gətirən Türo-Ariyanilərdir; yəni Batı mədəniyyəti Arilərin olduğu qədər turanilərin də, dolayısıyla türklərin də əsəridir. Turanlıların bir qismi islamiyyəti qəbul edincə, sami bir mədəniyyətlə birləşmişlər. Avropa mədəniyyəti dairəsinə girmələri, əski irqi mədəniyyətlərinə dönüşdən başqa bir anlam daşımaz.

---

[1] Yazarın iddialarından birisi Yunan və Roma mifologiyasında işlədilən Allah adlarının əsasən türkcə olması davasıdır. Bu iddia zamanımızda -qaliba "Əski və Yeni türklər"dən yararlanaraq- bəziləri tərəfindən təkrar ortaya atılmışdır. Mustafa Cəlaləddin Paşanın oğlunun damadı olan şəxs də türk dilinin dünyada ən əski dil olduğuna və səslərlə səslərin ifadə etdiyi əşya arasında əlaqələr olduğuna dair məşhur kəşfini böyük qaynatasının kitabından alınmış ilhama borcludur -qənaətindəyəm.

Mustafa Cəlaləddin Paşa, dilin təmizlənməsi, hərflərin islahı məsələlərində də hökmlərini bu nöqtədən başlayaraq yürüdür.

Əksi isbat edilincəyə qədər, bu məsələyə dair Osmanlı ölkəsində basılmış və yayınlanmış əsərlərin birincisi olaraq qəbul etməmiz gərəkən "Əski və yeni türklər", təəssüf olunur ki, türkcə deyil, fransızca yazılmışdır.[1]

"Əski və yeni türklər" yazarı Mustafa Cəlaləddin Paşa, Ziya və Əhməd Vefiq Paşalar kimi Osmanlı tarixinin bilinən simalarından olmadığı üçün, tərcümeyi-halına dair bu qısaca bilgini verməyi gərəksiz saymamaqdayam:

Mustafa Cəlaləddin Paşa 1848-ci il inqilabı hadisələrinə qatıldığından vətənini tərkə məcbur olmuş Leh əsilzadələrindən Konstantin Bojenskidir (Konstantin Borzetski). Konstantin 10 aprel 1820-ci ildə Kleçofda (Kleszow) doğulmuş və orada Vlottslavek (Violawek) seminariyasında klassik və dini bir təhsil almışdır. Hələ 22 yaşında ikən vətəni Lehistanın qurtulması qayəsi ilə 1848-ci il inqilabına Poznaniyada qatılmış, inqilab məğlub olduqdan sonra bir neçə həmvətənləri ilə bərabər, o zamanlar polyak və macar mühacirlərinə çox səxavətlə qucağını açan Osmanlı ölkəsinə sığınmışdır (1849). Osmanlı hökuməti gənc polyak mühacirinin ümumi və əsgəri bilgilərini, özəlliklə xəritə çəkməkdə məharətini nəzərə alaraq, onu ərkani-hərbiyyə yüzbaşılığı rütbəsi ilə Osmanlı ordusuna qəbul və xəritə şöbəsinə məmur etmişdir. Yüzbaşı Bojenski o sıralarda islamiyyəti rəsmən qəbul edərək şəxsən şeyxülislam əfəndi tərəfindən "Mustafa Cəlaləddin" adlandırılır. Və ərkani-hərbiyyə tuğgenerallarından (mirlivalarından) Ömər Paşanın qızını alıb tam bir türk, müsəlman ailəsi meydana gətirir; səfərdə olmadığı zamanlar Üsküdarda Qaracaəhməd məzarlığına baxan sadə bir evdə qapalı türk ailə həyatı yaşayır. Vaxtı ilə çox sevdiyi musiqi və rəqsləri, Mond (kübar) həyatını büsbütün unutmuş görünür: Bəyoğlu aləmi və Avropa mühacir dairələri ilə münasibətləri olmamışdır.

Bu polyak əsilzadəsinin ən böyük istəyi və həvəsi savaşdı. Hələ çox gənc ikən ilk vətənini qurtarmaq əməliylə, 1848-ci il inqilabına bir Polşa inqilabçısı kimi qatıldığı kimi, ikinci vətənini qorumaq məqsədi ilə 1850-dən 1876-ya qədər davam edən bir çox savaşa bir türk əsgəri kimi girmiş, bir neçə dəfə yaralanmış və nəhayət 1876-da Qaradağ savaşında əsgəri qolordu kapitanı rütbəsinə sahibkən qarnından aldığı bir yara ilə şəhid olaraq ölmüşdür. Sipozdakı məscid həyətindəki qəbristanda gömülüdür. (Allah qəni-qəni rəhmət eyləsin!).

Əsgərlik həyatına aid bu bir neçə sətir belə şəhid Mustafa Cəlaləddin Paşanın seçdiyi yeni vətəninə nə qədər dərin bir səmimiyyətlə bağlanmış olduğunu açıqlamaya və isbata yetərlidir.[1]

---

[1] Nüsxələri tükənmiş olan "Əski və yeni türklər"in əsli və türkcə çevirisi, basılmalı və yayımlanmalıdır. Türkçülük tarixinin və ümumiyyətlə çağdaş Osmanlı tarixinin incələnməsində önəm verilməməsi mümkün olmayan bu əsərin basım və yayımını Türkiyə Təhsil Nazirliyinin və "Türk ocağı"nın himmətindən gözləyirik.

Mustafa Cəlaləddin Paşa hərbdən, səfərdən uzaq olduğu zamanları təmsil etdiyi yeni milliyyətin, türklüyün, qəbul etdiyi yeni dinin, müsəlmanlığın, seçmiş olduğu yeni vətənin- Osmanlı ölkəsinin faydasına xidmət edən əsərlər meydana gətirməklə keçirmişdir. Mustafa Cəlaləddin Paşa yaradılışdan gələn istedadına əlavə olaraq aldığı yüksək təhsil və tərbiyə sayəsində ana dili olan polyakcadan başqa latınca, fransızca, almanca və rusca yaxşı bilirdi. Hafizəsinin gücü tarixi bilgisinin genişliyinə səbəb olmuşdur. Anadangəlmə sənətkarlıq qabiliyyəti vardı, ciddi məşğul olmadığı halda yaxşı rəsm çəkər, mükəmməl xəritə cızardı. Osmanlı hərbi məqamları ilk əvvəl xəritə cızmaqdakı bacarığını təqdir edə bilmişdilər. Yağlı boya rəsmlərindən bəziləri vaxtı ilə Dolmabaxçə sarayında asılı dururmuş. Evində olan zamanlar əsgərliyə, tarixə, filologiyaya dair bilgi və araşdırmalarını genişləndirməyə çalışırdı. Bu məsələlər üzərində bir neçə əsər yazmışdırsa da, əsərlərindən yalnız ikisi basılmış və yayımlanmışdır; "Les Turcs anciens et modernes" ("Əski və yeni türklər"), "La Guerre moderne" ("Zamanımız hərbi"). Bizcə önəmli və dəyərli olan birinci əsərdir ki, mövzusunu yuxarıda bir az təhlil və açıqlamaya çalışdıq. Mustafa Cəlaləddin Paşa bu əsərlərindən başqa dostlarından Bəsirətçi Əli Əfəndinin "Bəsirət" qəzetinə[2] və dostlarından Jean Pietrinin "Courrier d'Orient" qəzetinə imzasız bir çox siyasi məqalə də yazmışdır.

Təəccüblüdür ki, yeni vətəninin xeyrinə yalnız fikri ilə, qələmi ilə deyil, başı ilə, canı ilə də xidmət etmiş olan bu əsil adamın istedad və bilgisi, əxlaq və səciyyəsi bəzilərinin qısqanclığına yol açmış və qoruyucusu sərdari-əkrəm Ömər Lütfi Paşanın ölümündən sonra sərəsgər Hüseyn Avni Paşa tərəfindən hələ 44 yaşında və tuğgeneral rütbəsində olan Mustafa Cəlaləddin Paşa təqaüdə göndərilmişdir (1870). Hüseyn Avni Paşanın sürülməsindən sonra təkrar zabit sinfinə alınmış və serblər üzərində qazandığı qələbəyə mükafat olaraq, şəhid olmasından az öncə ferik (tümgeneral) rütbəsinə layiq görülmüşdür.[3]

**İlk türkçülərin ümumi xüsusiyyətləri**

Yuxarıda göstərdiyimiz hadisələrlə irəli sürdüyümüz görüşləri xülasə etsək, gələcək mövzularımız təsbit edilmiş olar: dil sahəsində türkçülük fikrinin şüurlu izləri İbrahim Şinasi Əfəndinin

---

[1] Mustafa Cəlaləddin Paşa müxtəlif rütbələrlə aşağıdakı savaşlarda iştirak etmişdir: Qaradağ (1852), Rus səfəri (1853-56), Bağdad (1857), Qaradağ (1861), Girit (1867), Hersek (1875), Qaradağ (1876). Bu savaşlarda başından, boynundan, sağ əlindən, sağ ayağından yaralanmış və son Qaradağ davasında aldığı yara şəhid düşməsinə səbəb olmuşdur.

[2] "Bəsirət"çi Əli Əfəndi "İstanbulda yarım yüzillik vəkaiyeyi-mühimmə" adı ilə 1908-də yayımladığı risalənin 4 və 5-ci səhifələrində Mustafa Cəlaləddin Paşanı "Bəsirət"in redaksiya heyəti üzvü kimi təqdim edir. (Əhməd Rasim bəyin şəxsi bir məktubundan).

[3] Mustafa Cəlaləddin Paşanın oğlu, Ərkani-hərbiyyə əməkli feriklərindən (tümgeneral) Ənvər Cəlaləddin Paşa olub, hələ sağdır. Ənvər Paşa atasına ithaf etdiyi "Fikirlərim" adlı nəşr olunmamış əsərlərindən istifadə etməyimə icazə verdilər. Mərhumun tərcümeyi-halını oradan xülasə etdim. Ənvər Paşaya bu yardımları üçün təşəkkür edirəm. Ənvər Cəlaləddin Paşa, babalarının yolu ilə getməyə çalışaraq və mərhumun bəzi sənədlərindən, kağızlarından da yararlanaraq türklüyün tarix və filologiyasına dair vaxtı ilə "Ədəbiyyati-ümumiyyə" dərgisində bəzi məqalələr yayımlamışdır. Bu məqalələrin bir araya toplanıb bir kitab halında basılması və yayımlanması arzu olunur.

əsərlərində görülür.[1] Şinasinin türkçülük fikri, dilin ədəbiyyat şöbəsində Ziya Paşa, lüğət şöbəsində Əhməd Vefiq Paşa, filoloji araşdırmalarında Mustafa Cəlaləddin Paşa tərəfindən işlənir. Əhməd Vefiq Paşada bütün türklük (Panturquisme) meylinin bəzi izləri görülməkdədir; Mustafa Cəlaləddin Paşa isə türk filologiyasından başqa, türk (yalnız Osmanlı türkü deyil, bütün türklər) etimologiya və tarixi ilə də məşğul olur. Osmanlı ölkəsində ilk dəfə Batı qaynaqlarından alınaraq türk tarixinə, türk etimologiyasına dair yazılan əsər, Mustafa Cəlaləddin Paşanın "Əski və yeni türklər" adlı filologiya, etimologiya, tarix və siyasətdən bəhs edən kitabıdır; elmi xüsusiyyətləri tamamən daşımayan bu əsər, türk ruhuyla, türk faydalarını müdafiə etmək amacıyla yazılmış olmaqla bərabər, fransızcadır.

Şinasinin türkcə kəlmə toplamağa başladığı tarix- bu məsələdə əldə edə bildiyim yeganə əsil qaynaq olan Əbüzziya Tofiq bəyin dediyinə görə, 1865-ci illə 1870-ci illər arasıdır. Ziya Paşa "Şeir və inşa" haqqında türkçü fikirlərini yenə bu tarixlərdə ortaya atmışdır. "Emil" tərcüməsinin ön sözü, "Cenevrə, 15 iyun, 1871" tarixlidir. Əhməd Vefiq Paşanın "Ləhceyi-Osmani"sinin ilk basım və yayımı da o zamanlar olmalıdır. Mustafa Cəlaləddin Paşanın "Əski və yeni türklər"i 1869-cu ildə nəşr olunmuşdur. Bu bilgiyə görə, Osmanlı türkləri arasında türkçülük fəaliyyətinin ilk dövrünü, 1865-1870-ci illər kimi qəbul edə bilərik.

**Türkçülüyə şərqşünasların təsiri**

Türkçülük və türklük düşüncəsinin Əbdüləziz dövrü səltənətinin ortalarına doğru Batı türkləri arasında görünməsinə, yuxarıda işarə etdiyimiz kimi, türklərin ümumi bir şəkildə Batı fikir və ruhuyla yaxınlaşmasından başqa, Batıda doğaraq Doğu aləmini, özəlliklə türkləri hər yönü ilə incələyən Du Gunis (De Guignes) kimi, Saci (Silvestre de Sacy) kimi, Abel de Remusat kimi, hətta Artuq Lumley Davids kimi şərqşünasların əsərləri ilə tanış olmalarının təsirini də mütləq görməkdəyik. Şinasi şərqşünas Silvester dö Saci ailəsinin dostluğunu qazanmışdı. Cəlaləddin Paşa "Əski və yeni türklər" kitabında De Gunisin "Histoire des Huns" əsərindən çox istifadə etmişdir. Artur Lumley Davidsin "Kitabül ilmü'n Nafi fi Tahsili sərfi-nəhvi-Türki" adlı kitabının fransızcaya

---

[1] Əhməd Midhət Əfəndi mərhumun, ölümü münasibəti ilə "Türk yurdu" üçün tərcümeyi-halını yazarkən də Şinasinin Osmanlı ədəbiyyatında ilk şüurlu türkçü olduğu görüşünü ifadə etmişdim.
"Şinasinin əsərlərində iki məslək ədibinin toxumları bəzən qarışaraq , bəzən ayrı-ayrı saçılmış olurdu. Bu toxumların bəziləri inkişaf edib böyüyərək və çiçək açaraq namiq kamallar, əbdülhəq hamidlər, tofiq fikrətlər, xalid ziyalar və nəhayət "Fəcri-ati"cilər kimi meyvələr toplandı; digər qismi isə böyüyüb çiçək açaraq Əhməd Midhət, Şəmsəddin Sami, Məhəmməd Əmin, Nəcib Asim, "Türk yurdu", "Gənc qələmlər" kimi yemişlər verdi. Şinasi iki məktəbin də ustadıdır... Şinasidən türkçülər ilə ədəbiyyati-cədidəçilər və övlad və nəvələri də törəmişdir... "Atalar sözü"nü toplayan, barmaq hesabı ilə şeir yazan, yabançı sözləri dilimizdən qovmağa çalışan Şinasi yeni həyatda türklük məzhəbinin imamıdır... (Akçuraoğlu Yusif, "Əhməd Midhət Əfəndi", "Türk yurdu", c. 3, s. 170).
Osmanlı mətbuatı üzərində əsaslı və ciddi incələmələr aparan yazar və tarixçi Əhməd Rasim bəydən türklük fikrinin nə zaman və kimlər tərəfindən ortaya atıldığı barədə fikrini soruşmuşdum. Lütfən verdikləri cavabda belə deyirdilər: "Mətbuat tarixi baxımından ilk dəfə Osmanlı cəmiyyəti altında millət kəlməsini açıqdan-açığa işlədən, Şinasi və Kamal, onların yolunda gedənlərdir. O tarixlərdə, yəni 1278-dən, yəni "Təsvire-əfkar"ın yayımlanmaya başlamasından etibarən milləti-Osmaniyyə tərkibinin açıq qarşılığı "türk" idi.

çevirisi[1] Lumleyin anası tərəfindən Sultan II Mahmuda 1833-cü il tarixində təqdim edilmiş olduğundan, XIX yüzil ortalarında yaşayan Şinasi və Vəfiq Paşalar kimi aydınların bu əsərdən də xəbərsiz olmalarına ehtimal vermirəm. XIX yüzilliyin sonlarına doğru şərqşünaslardan Vamberi, Radlov və Kahunun (Leon Cahun) əsərlərinin bütün türklər arasında türklük fikrinin güclənməsinə təsir etdiyini görəcəyik.

Türkçülük firkir axımının özəlliklə, 1865-1870 illərində Osmanlı türkləri arasında özünü göstərmiş olmasına daha başqa səbəblər də tapılıb göstərilə bilməzmi?...

**Türkçülük fikri və ingilis-rus əlaqələri**

Bilinməkdədir ki, 1860-cı illərə doğru rusların Asiyada yayılmaları, ingilisləri ürküdəcək qədər sürətini artırmışdır: Batı türkləri, Yəni Osmanlı səltənəti əleyhinə yüzillərdən bəri davam edən istilaçı rus siyasəti, XIX yüzilliyin ortalarında Batı Avropa dövlətlərinin silahlı müqaviməti ilə məğlubiyyətə uğrayınca, Rus İmperatorluğu bu müqavimətin acısını almaq üçün Doğu türkləri, Orta Asiya xanlıqları üzərinə şiddət və sürətlə yürüdü. 1860-cı ildən etibarən ruslar Orta Türküstanla Doğu Türküstana hücum etdilər. General Cernayev 1865-ci ildə Orta Asiyanın ən böyük şəhəri və Aksak Teymurun başkəndi olan Daşkəndi alır. 1867-ci ildə Orta Türküstanın böyük qismi "Türküstan əyaləti" Rus Çarlığının ərazilərindən sayılır, "1868-də Buxara xanlığı rus tabeliyini (vassallığını) qəbul edir. Yenə o illərdə Doğu Türküstanın Kaşğar bölgəsi, Məhəmməd Yəqub bəyin başçılığı ilə Çin hakimiyyəti əleyhinə üsyan edərək ruslarla yaxşı münasibət qurmağa çalışır. Kulca bölgəsi 1865-ci ildə Çin tabeliyindən çıxaraq 1871-ci ildə rus tabeliyinə girir... Qısacası, bütün Orta Asiya türklüyü 1860-1870-ci illər tarixlərində rus təzyiqi ilə qaynaşmaqdadır. Rusların bütün Asiya genişliyincə doğu və güneyə doğru yayılmaları ingilisləri çox qəzəbləndirir, bir neçə addım sonra qazax süvarilərinin Hindistan sərhədlərində görünmək ehtimalı ingilislərin yuxusunu qaçırır. Məhəmməd Yəqub xana elçi göndərirlər; və digər kiçik xanlarla qeyri-rəsmi təmas qurmağa çalışırlar. Yəqub xan da Hindistan ümumi valisinə elçi göndərərək İngiltərənin ittifaqını axtarır...

O zaman Babi-Ali ilə çox sıqı dostluq əlaqəsində bulunan Sain James kabinəsinin Batı və Doğu türklərinin din və irq birliyindən irəli gələn bağlarından faydalanmağı xatırlamaması mümkün deyildir. Hindistanın 1857-ci il hərbi çevrilişində Sultan Əbdülməciddən xəlifə kimi müsəlman hindlilərin İngiltərə kraliçasına itaətini tövsiyyə edərək bir fərman çıxartmayı əhmal etməyən ingilis siyasətinin Orta Asiya, müsəlman türk xanlıqlarının vəziyyət və durumu ilə Osmanlı türklərini

---

[1] Arthur Lumley Davids ingiltərəli gənc bir yəhudi şərqşünasıdır. Əsər, əsasən, türkcənin sərfü-nəhvi (dil bilgisi) isə də, yazar əsərin başına bütün türk tarixinin və türk dili və mədəniyyətinin bir xülasəsini qoymuşdur. Bu özət o zamana qədər şəqşünasların əldə edə bildikləri tədqiqat sonuclarına dayanaraq türkçülük baxımından uyğun bir tərzdə yazılmışdır. Lumley bu tarix özətində, özündən əvvəl gələn şərqşünasların türk qəbilələrinin hamısına "tatar" adını vermiş olmalarını tənqid etməkdə, bu qəbilələrin ümumi adının "türk" olduğunu iddia və isbat etməkdədir.

maraqlandırmağa çalışmış olması çox ehtimal edilə bilər. Həqiqətən, Yəqub xan bağımsızlığını qazanınca ingilis nümayəndəsi Douqlas Forsaytın məsləhəti ilə Osmanlı səltənətinin himayə və tabeliyini rica vəzifəsi ilə Yaqub bəyi İstanbula elçi göndərmişdir (1871).

Elçi yüksək səviyyədə qarşılanaraq Osmanlı səltənəti tərəfindən Yaqub xana hərb silah-sursatı ilə əsgəri mütəxəssislər və bəzi hədiyyələrlə bəzənmiş "Nişani-Osmani, qılınc, ələm və nameyi-Humayun" göndərilir. Yaqub bəylə dönən bu özəl heyətə Hindistanın Türküstan sərhəddində bir ingilis elçilik heyəti qatılır (1873). Və bu tarixdən etibarən Kaşğar xanlığı daxilində oxunan xütbələrdə Osmanlı padşahı Əbdüləziz xanın adı çəkilməyə, sikkələr də onun adına basılmaya başlayır.[1]

Bu zaman İstanbul mətbuatı Kaşğar işləri və Yaqub xanın vəziyyəti ilə xeyli maraqlanır. "Şəcəreyi-türk"ün Cığataycadan osmanlıcaya çevrilməsi, Vefiq Paşanın Orta Asiya ləhcələrinə maraq göstərməsi də bu tarixlərdən az öncədir. Sami Paşazadə, Sübhi Paşa kimi, Şəmsəddin Sami bəyin təbiriylə "Çağın elm və ədəbiyyat adamlarından Doğu ədəbiyyatına, özəlliklə Batıya və yeni fənlər ilə Avropa dillərinə aşina" bir dövlət böyüyünün Əbdüləziz dövründə Cığatay dili öyrənməyə qalxması da[2] İstanbulun aydınlarından bəzilərinin zehinlərini, o zaman Orta Asiya, yəni Doğu türklüyünün işğal etmiş olduğunu göstərir.

Bir az öncə göstərilən hadisələrə görə, türkçülük hərəkatının 1820-ci illərə doğru İstanbulda ortaya çıxmış olmasına bir səbəb də, o tarixlərdə Doğu türklərinin başına gələn fəlakətli hadisələrlə rusların genişlənməsinə qarşı ingilis siyasətinin bu hadisələrdən Batı türklərini xəbərdar etməyə və təsirləndirməyə çalışması olmuşdur -deyərsək, xəta etmişmi oluruq?

## MACARLI VAMBERİ

Əsərlərinin Osmanlı türkləri arasında təsiri bir az sonralar görünməyə başlayan macar Vamberinin Asiya səyahətləri ilə ingilis və Osmanlı siyasətlərinin bağlantılarını görmək o qədər zor deyildir: Şərqşünas Vamberi 4 ilə yaxın İstanbulda qaldıqdan və o zamanın Osmanlı vəkillərinin iqamətgahlarında xeyli müsafirlik etdikdən sonra 1861-ci ilində məşhur Asiya səyahətinə çıxmışdır. Vamberi Rəşid Əfəndi adı ilə və dərviş qiyafəti ilə Orta Asiyada üç il dolaşdıqdan sonra yenə İstanbul üzərindən Macarıstana dönmüş, oradan Londona doğru getmişdir. Saxta dərviş, elmi və fənni incələmələrinin nəticələrini ilk öncə macarlara deyil, ingilislərə vermişdir. İngilislərin ona göstərdiyi rəğbət Vamberiyə Budapeşt Darülfünunun Doğu dilləri professorluğunu verdi. Professor

[1] Kaşğar hökmdarı Yaqub xanın yeni bir türk dövləti qurması ilə bağlı hadisə ilə ümumi bir şəkildə Orta Asiya durumuna dair xeyli mənbəyə dayanan məlumat, 1300-cü ildə İstanbulda basılmış və yayımlanmış olan Məhməd Atif bəyin "Kaşğar tarixi" kitabında vardır. Məhməd Atif. "Kaşğar tarixi" Mihran mətbəəsi, İstanbul, 1300 (1885).

[2] Bu hadisəni mərhumun oğlu Həmdullah Sübhi bəydən öyrəndim.

Vamberinin əsərləri 1864-cü ildən etibarən nəşr olunmağa başlamışdır. Əsərlərinin çoxu almanca, bəziləri macarca, bəziləri də ingiliscə yazılmışdır. Məsələn, "Bir saxta dərvişin səyahəti" -iki-üç sənəlik Orta Asiya səyahətinin hekayəsidir- eyni zamanda almanca, ingiliscə, macarca nəşr olunmuşdur. Vamberinin türkcə qısa bir tərcümeyi-halını yazan tələbələrindən doktor Mesarroş deyir ki: "Doğu dillərini və idarə tərzini tanımasına görə İngiltərəyə böyük xidmətlər etdi. Beləliklə, qeyrəti və zəkası sayəsində böyük bir sərvət sahibi oldu. Bu sərvəti ilə ömrünün sonunda maddi bağımsızlığa nail oldu..."[1]

Professor Vamberi bir gün mənə də Yavuz bəyə ("Gülüstan və Xaristan") yazarı, Osmanlı imperatorluğunun Peşdə Baş konsulu mərhum Əhməd Hikmət bəyə) söylədiyini [2] təkrar etmişdi: "İngilislər məni sevərlər, çünki onlara Asiyanı tanıdan ilk adam mən oldum. Onlar məni dinlədilər, anladılar. Hətta İngiltərə kral xanədanının ayrı-ayrı üzvləri ilə dost oldum. Onların iltifatlarını gördüm".

Vamberi haqqında bu qısa məlumatdan belə anlaşılır ki, gələcəyin məşhur şərqşünası, türkoloqu Orta Asiya səyahətinə ya ingilislərin təşviq və yardımı ilə çıxmış, ya da Bəni-İsrailə xas olan kəskin və praktik zəkası ilə Orta və Yaxın Doğuya dair tədqiqatların o zaman İngiltərə siyasət borsasında çox böyük gücdə olacağını öncədən sezmişdi.

---

[1] "Türk yurdu", c. 5, s. 974
[2] "Türk yurdu", c. 5, s. 964

## AZƏRİ TÜRKLƏRİNDƏ TÜRKÇÜLÜK

### Axundzadə Mirzə Fətəli

Batı türklərindən öncə, türkçülük fikri ilə, yəni türk milliyyətçiliyi fikri ilə dil, tarix və siyasət sahələrində məşğul olmuş digər türklər vardırmı? Quzey, Doğu və Krım türkləri arasında, 1870-ci ildən öncə bu günkü anlamıyla və şüurlu bir şəkildə milliyyət fikrinin dil, tarix və siyasət sahələrində görünmüş olduğuna dair məlumata rast gəlmədim. Ancaq Qafqazda yaşayan türklərdən bu gün Azəri türkləri adı ilə andığımız şöbədə diqqət və incələməyə dəyər bir hadisə vardır; 1811-ci ildə doğulub 1878-ci ildə ölən Axundzadə Mirzə Fətəli, 1850-1855-ci illərdə tam məhəlli türk şivəsi ilə və Avropa tərzində bir neçə komediya yazmışdır.[1] Yenə bu şəxs, 1863-cü ildə İstanbula gələrək, islam əlifbasının islahı haqqında yazdığı əsərini Sədrəzəm Keçəçizadə Fuad Paşaya təqdim etmişdir.[2]

Axundzadə yalnız zamanın sədrəzəmliyinə proqram təqdim etməklə qalmamış, hərflərin islahı məsələsi ilə bağlı İstanbulun aydın fikirli şəxsiyyətləri ilə də müzakirələr aparmışdır.[3]
Fəqət bu proqramdan və müzakirələrdən heç bir sonuc alınmamışdır. Hərflərin islahı təşəbbüsünün sonuclarını Mirzə Fətəli xatirələrində bu şəkildə qeyd etməkdədir: “1875-ci miladı tarixdə mən müsəlman əlifbasının islahı fikrinə düşdüm. Bunun üçün İstanbul və Tehrana getmək lazım idi. Bir

---

[1] Mirzə Fətəlinin sayısı yeddiyə çatan komediyaları 1859-cu ildə basılmış və nəşr olunmuşdur. Yeddisi də ruscaya çevrilərək türkcə əsillərindən altı il öncə Tiflisdə basılmışdır. 1871-ci ildə farscaya çevrilmişdir. “Türk yurdu”, c. I, s. 127 və Yusuf Vəzirovun “Azərbaycan ədəbiyyatına bir nəzər” adlı kitabçası, s. 46. Bu risalə İstanbulda basılmış və yayımlanmışdır. **(Y. Akçura M. F. Axunzadənin “Aldanmış kəvakib” povestini də onun komediyaları sırasına daxil edir. Bu yanlışlıq Yusuf bəyin Axunzadənin əsərlərini görməməsindən irəli gəlmişdir. Özü elə bu oçerkdə qeyd edir ki, “Mirzənin əsərlərini gözdən keçirə bilmədim.” Məlumdur ki, Axunzadənin 6 komediyası vardır - A.K.** )

[2] Yusuf Vəzirov. “Azərbaycan ədəbiyyatrına bir nəzər”, s. 47.

[3] Mirzənin İstanbul səyahətinə dair bir mənbə “Xəzineyi-fünun”un ikinci ilinin (1864) 14-cü nömrəsində var. Mirzənin hərflərin islahı haqqında yazıb sədrəzəm Fuad Paşaya təqdim etdiyi əsər, sədrəzəm tərəfindən incələnməsi üçün “Cəmiyyəti-elmiyyeyi-Osmaniyyə”yə həvalə edilmiş imiş. Bu cəmiyyət məsələni müzakirə etdikdən sonra “hüzure-maarifnəşur həzrəti Sədarət Pənahiyə” təqdim etdiyi layihənin surəti, Cəmiyyəti-elmiyyeyi-Osmaniyyənin orqanı olan “Xəzineyi-fünun”da “İslahı-rəsme-xəttə dair bəzi təsəvvürat” başlığı ilə eynən yayımlanmışdır (s. 70). “Cəmiyyəti-elmiyyeyi-Osmaniyyə”yə şəxsən Axundzadə minbaşı Mirzə Fətəliyi də (Mirzə Fətəli Axundov, Rusiya Qafqaz ordusunda o zaman minbaşı rütbəsinə sahibdir) dəvət edərək komissiya təşkil edilmişdir və məsələni üç əsasa bağlayaraq incələmiş və müzakirə etmişdir. Əsaslar bunlardır: 1. Mövcud üsul, islah və tamamlanmaya möhtacmıdır? 2. Bu əsas qəbul olunduğu halda, üsul tam olaraq istənilən surətə uyğunmudur? 3. Bu ağıllı islahatın düşünülməsi və yayılması mümkünmüdür? Əsaslardan birincisinə Cəmiyyət ümumiyyətlə müsbət cavab vermiş, ikinci əsasın müzakirəsi nəticəsində Fətəli islahatın “təbiət elmlərinə kifayət dərəcədə əlverişli olmadığına” qənaət gətirmiş. Üçüncü əsasa gəlincə, hərflərin islahının “son dərəcə çətin işlərdən” olduğu inancını önə sürmüşdür.
“Cəmiyyəti-elmiyyeyi-Osmaniyyə”, Mirzə Fətəlinin komediyalarını da oxumuşdur. Raporunun sonlarında həmin əsərlərdən bu şəkildə bəhs edir: “Və yazmış olduqları teatr hekayələri tamamən oxunmuşdur. Bunlar Doğu ölkələrində yayılmış bəzi batil fikirlərin çürüdülməsi və dəyərsizliyinin göstərilməsi məqsədi ilə təsəvvür edilmiş və düzənlənmiş hakimanə məsələləri içinə almış olub, oxunması faydalı olacağından, irəlidə Cəmiyyəti-acizanəmiz tərəfindən Osmanlı dilinə çevrilərək sürətlə basılıb yayınlanmasına çalışılacaqdır.” Raporun sonu Mirzənin təqdir və tərifidir: “Adı keçən yazar Doğu və Batı dillərindən dörd-beş dilə layiqi ilə aşina və təhsilin yayılmasına aid ən önəmli işə xidmətlə igidlik və vətənsevərlik mayasını göstərdiyi üçün təqdir və sayğıya əhliyyəti meydanda olduğundan, bundan dolayı Cəmiyyəte-acizanəmizin onunla bilgi qazanması və dostluq qurması öyünmə vasitəsi sayıldığı sədrəzəmin yüksək məlumları...” Axundzadə komediyalarının Osmanlı türkcəsinə çevrildiyini bilmirik.

çox adamlarla görüşdüm. Heyhat, müsəlman irəli gələnləri əlifbalarını dəyişdirəcək kimi deyillər, halbuki bu hər şeydən daha gərəklidir və daha öncə gəlir".

Axundzadənin əsərlərini gözdən keçirə bilmədim. Həyatı və əsərlərindən bəhs edən şəxslər, Mirzənin komediyalarını Azərbaycanda danışılan dil ilə yazdığını bildirirlər. Elə bir dil ki, xalq və yüksək təbəqə, kəndli və şəhərli hər kəs anlarmış, süsdən uzaq, saf və həqiqi Azəri ləhcəsindən Mirzə əsərlərində ustalıqla istifadə etmiş imiş. Bu vəziyyətdə Axundzadə Mirzə Fətəli dildə feilən türkçülük etmiş olur. Fəqət Mirzənin türk milliyyətçiliyi ilə bağlı düşüncə və görüşlərinə dair mənim əlimdə ciddi məlumatlar yoxdur. Axundzadənin tarix, fəlsəfə və siyasi elmlərlə məşğul olduğu və fəlsəfə barəsində "Həqqül-yəqin" adlı basılmış bir əsəri olduğu bilinməkdədir, fəqət bu əsərdə Mirzənin nə kimi görüşlər irəli sürmüş olduğuna dair də qaynaqlarımda bir şey tapa bilmədim.

Axundzadə haqqında mövcud məlumatlara görə, onu Göyalp Ziya bəyin "Türkçülüyün əsasları" adlı kitabında iddia etdiyi kimi, Qaspıralı İsmayıl dərəcəsində böyük bir türkçü saymaq doğru olmasa gərəkdir.[1] Zatən Ziya bəy mərhum, Mirzə Fətəli haqqındakı görüşlərini yetərli inceləməyə gərək görmədən yazmışdır: 1878-ci ildə, yəni Əbdülhəmidin taxta çıxmasından bir az sonra ölmüş olduğu halda, Ziya bəy onu Əbdülhəmid zamanında yetişənlərdən Qaspıralının çağdaşlarından[2] biri kimi göstərir: "Türkiyədə Əbdülhəmid bu qüdsi axımı durdurmaya çalışarkən, Rusiyada iki böyük türkçü yetişirdi. Bunlardan birincisi Mirzə Fətəli Axundovdur ki, azəri türkcəsi ilə yazdığı orijinal komediyalar bütün Avropa dillərinə çevrilmişdir".[3] Mirzənin komediyaları bütün Avropa dillərinə çevrilməmişdir, Axundzadə öz xatirələrində deyir ki: "Əsərlərimin yeddisi də ruscaya çevrildi, Peterburq və Berlin qəzetlərində onlara aid məqalələr yazıldı."[4] Komediyalarının hamısının farscaya çevrilməsi dəqiq isə də, hansılarının tamam və ya qismən fransızca, ingiliscə və almancaya çevrildiyi hələ araşdırmaya möhtacdır.[5]

Mirzə Fətəlinin türk fikir və ədəbiyyat həyatında ən böyük önəmi türkcə ilk teatro yazan bir yazar olmasıdır -sanıram. Mənim toplaya bildiyim məlumata görə, Batı türkləri arasında teatra aid ilk əsər Ziya Paşanın Molyerdən çevirdiyi "Tartüf"dür ki, Əbüzziya Tofiq bəyin şahidliyinə görə,

---

[1] **M. F. Axundovun türkçülüyü haqqında Yusuf bəyin qənaətləri Ziya Göyalpdan daha dəqiqdir, göstərdiyi tarif, fakt təhrifləri, üstəlik M. F. Axundovun bütün əsərlərinin incələnməsi Yusuf bəyin qənaətlərinin olduqca dəqiq olduğunu təsdiqləyir. Biz "Azərbaycan romantiklərinin yaradıcılığında türkçülük" (Bakı, Elm, 2002) adlı monoqrafiyamızda (s. 89-97) bu məsələdən təfsilatı ilə bəhs etmişik. Türk olduğu halda məktublarında özünü fars kimi qələmə verməsi Axundovda şüurlu türkçülüyün olmadığının ən böyük dəlilidir və belə olan təqdirdə onun Qaspıralı ilə yanaşı qoyulması qeyri-mümkündür -A. K.**

[2] İsmayıl bəyin ilk əsəri olan "Rusiya müsəlmanları", 1880-ci ildə, yəni Mirzə Fətəlinin ölümündən iki il sonra yayınlanmışdır.

[3] Ziya Göyalp, "Türkçülüyün əsasları", Mətbuat və İstihbarat mətbəəsi. Ankara, 1339, s. 8.

[4] "Türk yurdu", c. I, s. 130

[5] Yusuf Vəzirov, "Azərbaycan ədəbiyyatına bir nəzər", s. 48. Həm Yusuf Vəzirov, həm də "Türk yurdu"nda Mirzə Fətəli Axundov haqqında məqalə yazan müəllif, Köçərli Firidun bəyin "Mirzə Fətəli Axundov" adlı bioqrafik risaləsindən və Mirzənin ölümünün yüz illiyi münasibəti ilə ortaya çıxan materialdan yararlanmışdır.

1875-ci illərdə tərcümə edilsə də, Ziya Paşanın ölümünə qədər, basılmaq bir yana qalsın, kimsənin əlinə belə keçməmişdir.[1] Batı türkcəsində ilk orijinal teatr (dram) əsəri Namiq Kamalın "Vətən, yaxud Silistre" adlı dramıdır. 1872-ci ildə yazılmış, nəşr olunmuş və oynanmışdır. Halbuki Mirzə Fətəli yuxarıda söylədiyimiz kimi, komediyalarını 1850-1855-ci il tarixlərində yazmış və 1859-cu ildə nəşr etdirmişdir. Mirzənin Molyerdən və rus komediya yazarlarından, məsələn, çox sevərək oxuduğu Qoqoldan təsirlənmiş olduğunu ehtimal etmək olar. Batı türklərində Molyerdən adapte edərək komediyalar yazan Əhməd Vefiq Paşanın əsərləri Namiq Kamalın "Vətən" pyesindən sonra meydana çıxır. Qısası, Axundzadə Mirzə Fətəli türk həyatından alınmış və sadə Azəri türkcəsi ilə yazılmış ilk türk teatrosunu meydana gətirmiş olmaq şərəfinə sahibdir; və bu yöndən ədəbi türkçülüyə xidməti önəmlidir.

[1] Əbüzziya Tofiq, "Nümuneyi-ədəbiyyati-Osmaniyyə", Ziya Paşa, Mətbəəyi-Əbüzziya, İstanbul, 1330, s. 261.

## BATI TÜRKLƏRİNDƏ TÜRKÇÜLÜYÜN İKİNCİ DÖVRÜ

1865-70-ci illərdən, yəni Krım savaşı ilə ruslar tərəfindən Türküstanın işğalı arasında keçən ilk dövrdən sonra, Batı türkləri arasında türk milliyyətçiliyi fikrinin ikinci fəal dövrünü, 1877-ci il Türk-rus səfərindən öncə və onu izləyən 1876-1880-ci illər arasında görürük. Bu dövrün ən məşhur türkçüləri Süleyman Paşa ilə Özbəklər şeyxi Süleyman Əfəndi və Rumelili Əhməd Midhəd Əfəndi ilə Əhməd Cövdət Paşadır. Və bu dövr türkçülüyünün dil, tarix, təhsil və siyasət cəbhələri vardır.

Türkçülüyü belə dövrlərə ayırmaqla bərabər, dövrlər arasında fikri bir ara olduğunu qəbul etmək doğru olmaz. Ancaq fikrin bəlirtiləri zəifləmişdir, çünki Əli Paşanın ölümündən (1871) sonra, Sultan Əbdüləzizin təzyiqi şiddətlənmiş və sədrəzəmlik məqamını işğal edən Mahmud Nədim Paşa və ardıcılları padşahın özbaşına, kobud durum və davranışlarına qarşı qoymaq istəməmiş, və ya qoya bilməmiş olduqlarından, Tənzimat dövrünün nisbi hürriyyətçiliyi çok əskilmişdir. 1871-ci ildən etibarən bütün fikri hərəkətlər kimi, türk milliyyətçiliyi hərəkatı da zəifləmişdir.

1876-cı ilə doğru Osmanlı ölkəsinin xristian əhalisinin çoxluq təşkil etdiyi bəzi Rumeli vilayətlərində Avropa dövlətlərinin, xüsusilə Rusiya imperatorluğunun təsir və təşviqi ilə ihtilalların, üsyanların artması, genişlənməsi, sultan və vəzirlərin, səlahiyyət və etibarlarını ciddi surətdə qırmış olduğundan, xalqın səsi eşidilməyə başladı; hər cür düşüncənin daha sərbəst söylənməsinə imkan yarandı. O zaman Əbdüləzizin taxtdan endirilməsi, V Murad xanın ağlını itirməsi, II Əbdülhəmidin məşrutə elan etməyə söz verərək taxta çıxması kimi iç və Bosniya-Hersoqovina, Serbistan, Bolqarıstan üsyanları ilə onların ardınca gələn Rus-Türk hərbi (1877) kimi xarici hadisələr təzyiq və şiddətlə dayanan bir hökumət idarəsinin qurulmasını imkansız etdiyindən, Əbdülhəmid taxta yaxşıca yerləşib, arzu və keyfinə görə hərəkət edə biləcək bir səlahiyyət və iqtidar qazanıncaya qədər, düşüncə hürriyyəti və fəaliyyəti o qədər məhdudlaşıb təzyiq altına alına bilmədi. Məhz türkçülük fikrinin ikinci fəal dövrü də bu zamana təsadüf edir.

### Süleyman Paşa

Əbdüləzizin taxtdan endirilməsi zamanı hərbi məktəblər naziri olan Süleyman Paşa, bu dövrdə türk milliyyətçiliyi fikrinə xidmət etmiş önəmli adamlardandır. Süleyman Paşanın birinci dövrdəki fəaliyyətinə dair məlumat əldə edə bilmədim. Paşa 1838-ci ildə doğulmuş olduğuna görə, ilk dövrdə özünü hələ göstərməmiş olması ehtimal edilə bilər.

Süleyman Paşanın türkçülüyü, ümumiyyətlə təhsil və təlim sahəsində önəmli xidmətləri "Cəmiyyəti-tədrisiyyeyi-islamiyyə" üzvlüyündə, xüsusən əsgəri məktəblər nazirliyində görülmüşdür. Əbdüləziz dövründə əsgəri məktəblər naziri, yalnız hərbi məktəblərə deyil, bunlara

tələbə yetişdirən əsgəri litseylərə də, əsgəri rüşdiyyələrə də (orta məktəb) baxardı. Süleyman Paşanın nazirliyi zamanında, əsgəri məktəblər nazirliyi, Mülkiyyə məktəbləri nazirliyi demək olan maarif nazirliyi dərəcəsində əhəmiyyətə malikdi.

Süleyman Paşa hərbi məktəblər üçün bir neçə kitab yazmışdır: "Məbani-ül İnşa", (iki cild) "Kəbir İlmihal", "Sağır İlmihal", "Sərfi-türki" və "Tarixi-aləm". "Sağır ilmihal"ını mən hələ rüşdiyyədə ikən dərs kimi oxumuş və əzbərləmişdim. Bu kiçik "İlmihal" **(Şəriət dərsliyi -A. K.)** çox açıq və sadə bir türkcə ilə yazılmışdır. Bu kitabçada ərəbcə, əcəmcə kəlimə və ifadələrdən çəkinilmişdir. Məsələn, "Allahü-təala"nı tərif edərkən: "birdir, onun heç ortağı, yardımçısı və bənzəri yoxdur, dünyada gördüyümüz və bildiyimiz şeylərdən heç bir şey ona bənzəməz... Anadan, babadan, oğuldan, qızdan, qarıdan, yuxudan, yatmaqdan, yeməkdən, içmədən, gülmədən, ağlamadan, sevinmədən, təəssüfdən uzaqdır..." deyir. "Məbani-ül inşa"sı ilə "Sərfi-türki"sini axtarıb tapa bilmədim. "Tarixi-aləm"i isə gözümün önündə durur. Haqqında danışdığımız məsələyə dair ən önəmli əsəri də budur. Süleyman Paşa, Əbdüləzizin son zamanlarında sərəsgər Hüseyn Avni Paşa tərəfindən əsgəri məktəblərə xas bir ümumi tarix hazırlanmasına məmur edilmişdir. Bu məmuriyyətini yerinə yetirmək üçündür ki, adı keçən "Tarixi-aləm"i yazmağa başlamışdır. Planı geniş tutulan bu əsərin "İlk çağ" bölümü tamamlanıb tələbələrə paylanmış və oxudulmuşsa da, "Orta çağ" və "Yeni çağ" bölümünü yazmağa vaxt tapmadan, Süleyman Paşa ölmüşdür. "Tarixi-aləm"in "İlk çağ" qismi 1876-cı ildə, yəni V Murad zamanında basılmış və yayınlanmışdır. "Tarixi-aləm" II Əbdülhəmid dövründə yasaq kitablardan sayıldığı üçün, mövcud nüsxələri hərbiyyə məktəbi mətbəəsi kitab anbarına atılmış və uzun müddət orada yatıb qalmışdır.

II Məşrutiyyət dövründə hərbiyyə məktəbi naziri olan Tofiq Paşa ki, Süleyman Paşa mərhumun sadiq tələbələrindən və dərin hörmətkarlarından idi və sonra əsgəri edadilərdə oxunan "Tarixi-Osmani"sini də ustadından aldığı türkçülük ruhunu büsbütün itirməyərək yaza bilmişdir. "Tarixi-aləm"i çürüməyə məhkum olaraq buraxıldığı guşədən çıxararaq, yırtılıb-çürümüş bəzi səhifələrini qaydaya salaraq 1911-ci il tarixində basdırmış və nəşr etdirmişdir.

Bu ikinci nəşr "Tarixe-aləm"in başında yazarın yararlandığı Batı və Doğu qaynaqları göstərilmişdir. Qaynaqlar içində De Guiqnesin "Hunlar tarixi" və Raymondun "Tatar tarixi" ilə Əbülqazinin "Şəcəreyi-türki"si də vardır. Süleyman Paşaya qədər De Guines və Raymonddan yararlanaraq türkcə yazılmış bir tarix kitabının varlığını bilmirik, ancaq Mustafa Cəlaləddin Paşa fransızca əsərini yazarkən, De Guinesə müraciət etmişdir.

Süleyman Paşa "Tarixe-aləm"in ön sözündə kitabının yazılma səbəblərini anladarkən belə deyir: "Əsgəri məktəblərdə oxudulmaqda olan dünya tarixi xarici dillərdən eynən tərcümə olunduğu üçün islam əqidələrinə və milli əxlaqa qarşı olması ilə bərabər, əski çağ qisminin də ancaq bir neçə qismi çevrilmiş olduğu üçün, indiyə qədər məqsədə nail olunmamışdır... Və inanılan xüsuslara və

islami qaydalara, milli münasibətlərə, Doğunun önəmli hadisələrinə uyğun olmaq üzrə... tərtibinə cəsarət etdiyim bu kitab..."[1]

"Tarixe-aləm"in mündəricatı nəzərdən keçirilincə, dərhal gözə çarpan nöqtə o günə qədərki ənənənin əksinə, türk tarixinin "İlk çağ" qisminə çox səhifə ayrılmış olmasıdır: həqiqətən "Fəsli-sabi" (yeddinci fəsil): "Tavaifi türk" 144 səhifəni işğal etməkdədir ki, bütün "İlk çağ" tarixinə ayrılan səhifələrin 5/7-dən daha artıqdır. Halbuki "Tarixi-aləm"dən sonra basılıb Osmanlı məktəblərində oxudulmuş olan "Dünya tarixi" kitablarında Avropa məktəblərində oxudulan tarix kitabları təqlid edilərək türklüyün əski dövrünə bütün kitabın təxmini 1/20-inin ayrılması adət olmuşdur. Süleyman Paşa bu önəmli əsərində türklüyün keçmişindən sevgi və sayğı ilə bəhs edər; əsərdə yad və düşmən millətlərin türklərə yönəltdikləri gerçəklikləri şübhəli, şiddət və qabalıq iftiralarının tərcümə olunmasına gərək görülməmişdir, yazar çox uzaq keçmişdən bəri, bütün Asiyaya yayılıb hökm etmiş olan böyük bir türk irqinin varlığını, öyünüləcək qəhrəmanlıqlarını, türk gənclərinə öyrətmək və duyurmaq istəmişdir. *"Tarixe-aləm"*in bu özəlliklərinə görədir ki, mərhum Müşir Süleyman Hüsnü Paşaya, 1877-ci il savaşında Osmanlı türk ordusuna bir müddət baş komandanlıq etmiş olan bu "Şipka qəhrəmanı"na türkçülük tarixində önəmli bir yer ayırmaqdayıq.

Yazdığı dərs kitablarında ("İlmihal" və "Tarixe-aləm") dil və təhsil sahəsində türkçülük göstərmiş olan Süleyman Paşanın digər çalışmalarında da türkçülük fikrinin təsirinin görünməsi gərəkdir, ancaq bu gün əlimizdə başqa qaynaq olmadığı üçün, bu barədə fikir yürütmək səlahiyyətinə sahib deyilik. Göyalp Ziya bəy, "Türkçülüyün əsasları" kitabında [2] Əsgəri rüşdiyyələrdə oxudulmuş olan "Əsmayi-Türkiyə" kitabını Süleyman Paşanın əsəri olaraq qeyd edir, halbuki əlimdə mövcud "Əsmayi-Türkiyə" üstündə "Rıza bəyin əsəridir", deyə nəşr edilmişdir. Ziya bəy, Süleyman Paşanın üç dildən yaranan bir dil ola bilməyəcəyini anlayaraq, bu qənaətini "Təlime-ədəbiyyati Osmaniyyə" adı ilə bir kitab yazan Rəcaizadə Əkrəm bəyə yazdığı "Bir məktub"da açıqca ortaya qoyduğundan da bəhs edir. Belə bir məktub nəşr olunmuş "Təlime-ədəbiyyati-Osmaniyə"yə əlavə olunmuş təqdim yazıları arasında mövcud deyildir.[3]

---

[1] "Tarixe-aləm", qisme-əvvəl: "İlk çağ", məktəbi-edadiyyə, II sənəsinə məxsusdur. Yazarı ferik Süleyman Hüsnü, Məktəbi-Hərbiyyə mətbəəsi, İstanbul Panqaltı, basım tarixi göstərilməmişdir. Ancaq Məktəbi-Hərbiyyə mətbəəsi adına yazılan "İfadəyi-məxsusə"nin tarixi 20 iyul 1327-dir (1911).
[2] Ziya Göyalp, "Türkçülüyün əsasları", Ankara, 1339 (1923).
[3] Süleyman Paşanın belə bir məktubu olub-olmadığını ortaya qoya biləcək kişilərin başında Rəcaizadə mərhumun oğlu Ərcümənd Əkrəm bəy bulunmaqdadır.

**BUXARALI ŞEYX SÜLEYMAN ƏFƏNDİ**

Süleyman Paşanın türkçülük fəaliyyəti zamanında Buxaralı Şeyx Süleyman Əfəndinin də türk milliyyətçiliyi yolunda, dil, folklor və praktik siyasət sahələrində çalışdığı görülür. Süleyman Əfəndinin bu yolda çalışmasını ortaya qoyan, isbat edən mənbə, mərhumun *"Lüğəti-Cığatay və Türki-Osmani"* adlı kitabıdır. Bu kitabın Osmanlı və Cığatay ləhcələri ilə nəsr və nəzm halında yazılan ön sözlərindən yazarın fikirlərini və gördüyü bəzi işləri öyrənirik.

Şeyx Əfəndi, Cığataycanı "dünyadakı ana dillərdən biri" və "Lisani-Türki-Osmani"nin əsli və qaynağı" sayır. Buna dayanaraq Osmanlı ölkəsində "Təlim və etinaya dəyər olduğunu açıqlamağa gərək olmadığı" qənaətindədir. "Lisani Türki-Osmani" ilə yazılan ön sözündəki bu əsas fikrini "Müqəddimeyi Cığatay"ında digər ifadələrlə təkrar edir: "Bu gün Osmanlı ölkəsində işlədilən lisani-osmaniyə, lisani-Cığataydan, yəni Mavərəünnəhr ölkəsində hələ işlənilən dildən ayrılmışdır."

Yazar, Cığatay dili ilə Osmanlı dilinin əlaqəsini bu şəkildə təyin etdiyi kimi, etimologiya baxımından Osmanlıların, özəlliklə Osmanlı xanədanının türklüklərini təsdiqləməyə çalışır: "həqiqətən, bu xanədanın soy zənciri soydan-soya türk tayfasına mənsub olub, qaynaq və çıxış yerləri Mavərəünnəhr ölkəsidir" -deyir.

Sonra Orta Asiyada (Mavərəünnəhrdə) oturan "92 boy özbəklərinin" adlarını sayaraq bunların ata sözlərini və yüzdən artıq Orta Asiya şairinin nümunə şeirlərini topladığını söyləyir. Yazarın bu çalışmadan məqsədi, "ana vətəndə istifadə olunan dillərin mənəvi dünyalarını müəyyən etməyi arzulayan Osmanlı irəli gələnlərinə və xalqına yaraşır bir hədiyyə" təqdim etmək amalıdır.

Nəhayət, mənzum Cığatay ön sözündə, Cığatay dilini, Osmanlı dilinin əski şəkli olaraq qəbul etmək surəti ilə bu iki dilin və dolayısı ilə iki türklük şöbəsinin, yəni Cığatay və Osmanlı türklərinin birliyini iddiaya qədər irəliləyir: "İsmi, "Türki Cığatay lüğəti" -qədim Osmanlı lisanıdır", adı Cığatay türklərin əslidir...ilaxır" .

Dil və soy baxımından türklərin birliyini görən və göstərmək istəyən Özbək Şeyxi bu birliyi dil və soy tədqiqi ilə göstərməyə və isbata çalışmaqla qalmamış, Türküstan türkləri ilə Osmanlı türkləri arasında həqiqətən bəzi ilişkilərin qurulmasına da çalışmışdır.

Əbdülhəmid səltənətinin ilk illərində -Türk-Rus Savaşı zamanı olacaq sanıram- Buxaralı Şeyx Süleyman Əfəndinin "səfarətlə səyahət" etmiş olduğunu yenə mənzum Cığatay ön sözündən öyrənirik: Buxaralı Şeyx, Osmanlı padşahının elçisi sifatı ilə Hindi, Sərhindi, Əfqanıstanı, Buxaranı, Xivəni, Türkmənistanı dolaşır. Türkmənlər elində səyahətini bildirən bu beyti diqqətəlayiqdir:

"Türkmənin halını bir-bir bildim,

Cins və miqdarını dəftər qıldım...”

Şeyx Əfəndi, Orta Asiyaya Hind yolu ilə getdiyi kimi, dönüşü də eyni yolla olmuşdur. Səyahətin nəticəsini bu aydın olmayan işarələr ifadə etməkdədir:

“Gələrək xidmətim ifa etdim,
Nəyə məmur isəm, icra etdim.”

Əlimdə başqa qaynaq olmamaqla bərabər, Şeyx Süleyman Əfəndi Özbəkinin Türk-Rus savaşlarında, Osmanlı-Türk hökuməti tərəfindən, Türküstan türk hökumətlərinə və Türküstan xalqına elçi olaraq göndərilməsi, türkmənlərin cins və miqdarını dəftərə keçirməsi, Kabil, Buxara əmirləri ilə danışması, nəhayət İstanbula dönüb vəzifəsini tamamlaması- bütün bu hadisələr, Doğu və Batı türklərinin, həyat və gələcəkləri rus təhdidi altında olarkən irq, nəsil və dil birliklərini siyasi sahədə xatırlamaları və duymaları deyə təqdim edilir və mənalanırsa, çox xəta olmaz- zənnindəyəm. Diqqətəlayiqdir ki, Buxaralı Şeyx Süleyman Əfəndi bu səyahətdən sonra, Cığataylıları və Osmanlıları bir-biri ilə anlaşdırıb tanışdırmaq üçün “Lüğəti-Cığatay və Türki-Osmani”sini yazmağa və nəşr etdirməyə gərək görmüşdür.

Buxaralı Şeyx Süleyman Əfəndinin bəlkə İngiltərə hökumətinin tövsiyəsi ilə edilən Orta Asiya səyahətindən praktik bir siyasi uğur əldə edilmədiyi, hadisələrin şahidliyi ilə bilinməkdədir. Doğrusu, belə bir səyahətdən bir sonuc çıxa biləcəyinə ümid etmək, bir az artıq nikbinliyə qapılmaqdı. O zamanlar əfqan əmiri olan Şirəli xan, Şeyx Süleyman Əfəndiyə çox qonaqsevərlik göstərmiş olmasına baxmayaraq, rus siyasətinin inanılmış bir tərəfdarı idi. Buxara xanlığı isə, o tarixdə feilən Rusiyanın əmri və hökmü altına girmişdi. Olsa-olsa, həqiqətən Çar hökuməti ilə davamlı hərb halında olan cəngavər və cəsur türkmən qəbilələrinin fəaliyyətini şiddətləndirmək mümkün ola bilirdi. Ancaq bu şiddətlənən fəaliyyət də, Tuna və Qafqaz cəbhələrində Osmanlılarla çarpışan rus ordularına önəmli bir diversiyon mahiyyətində ola bilməzdi.
Bununla bərabər, Orta Asiya səyahətindən Osmanlı hökuməti məmnun qalmış olacaq ki, Şeyx Süleyman Əfəndi, İstanbula dönüncə mükafatlandırılmağa layiq görülmüşdür:

“Bunda (İstanbulda) bəzi yerə əza oldum,
Fəxri xidmətlərə sahpa oldum...”

-deyir. Və gerçəkdən Qazi Osman Paşaya iftixar qılıncını gətirən macarlara təşəkkür üçün Macarıstana göndərilmiş heyətlə Süleyman Əfəndi də məmur edilmişdir. Orta Asiyada əsil

vətəndaşlarını, Doğu türklərini ziyarət etmiş olan Özbək Şeyxi, Turan irqinə mənsub olduğu halda irqi topluluqdan uzaq qalmış ən batıdakı irqdaşlarının vətəninə də göndərilmiş və Şeyxin Orta Asiyalı olması macarlar içində ayrıca bir təsir buraxmışdır:

"Cümləsi bir-bir gəlib əl öpdü;
"Türk" diyə alqışla qiyamət qopdu.
Əski Osmanlı lisanı derlər,
Cığatay-türki zəbani derlər,
Asiyadan gəlişim anladılar,
Cığatay bildiyimi dinlədilər:
Çox kəlamı cümləsi dilədilər;
Bol lüğatla məşvərət eylədilər."

"Lüğəti-Cığatay və Türki-Osmani" ön sözlərindən çıxardığımız bütün bu hadisələr, Şeyx Süleyman Əfəndidə, qeyri-müəyyən şəkildə olsa da, "bütün türklük" fikrinin varlığını göstərdiyi kimi, İstanbulda bəzi topluluqların, hətta hökumətin bu fikirdən praktik siyasət sahəsində yararlanmaya çalışmış olduğunu göstərməkdədir[1]

**ƏHMƏD MİDHƏT ƏFƏNDİ**

Əhməd Midhəd Əfəndini də bu dövrün türkçü yazarları sırasında saymaq doğru olur -zənnindəyəm. Bu həddindən çox yazıların müəllifi və yazılarında eyni qayəni düzənli sürdürməyən Osmanlı yazarını türkçülər arasında təqdim etməmizə etiraz edənlər ola bilər... Fəqət dilində, üslubunda feilən ən çox türkçülük edən və bu məsləkində əsla şaşırıb-sürüşməyən ilk osmanlı yazarı, Əhməd Midhəd Əfəndidir desək, bilmirəm xəta etmiş olarıqmı? Milliyyət fikrinin ünsürlərindən birisi də xalqçılıq (demokratlıqdır). O zamanlar, struktur və üslub demokratlığında Midhəd Əfəndi ilə yarışmaya çıxıb, onu keçəcək hansı yazarımız vardır? Əhməd Midhəd Əfəndinin yapı və üslub baxımından türkçülüyünü daha öncə iddia etmiş və isbata çalışmışdıq: "Midhəd, Kamal və

---

[1] Buxaralı Şeyx Süleyman Əfəndinin "Lüğəti-Cığatay və Türki-Osmani" adlı əsərinin birinci cildi, 1298 (1882) sənəsində, İstanbulda "Mihran" mətbəəsində nəşr olunmuşdur. 320 səhifəlik bu cild, üç ön söz ilə Cığatay türkcəsindən Osmanlı türkcəsinə qısa bir lüğət kitabından ibarətdir, lüğətlər əksərən məşhur Cığatay şairlərinin beytləri ilə nümunələndirilmişdir. Bu əsərin özbək qəbilələrinin xalq ədəbiyyatı və Orta Asiya şairlərinin əsərləri ilə Mavərəünnəhr tarixinə dair bir çox qaynağı əhatə edəcəyi bildirilən ikinci cildi basılıb yayınlanmamış olsa gərəkdir. Çünki çox axtardığım və başqalarından soruşduğum halda tapa bilmədim (A. Y.).

arkadaşlarından daha açıqlıqla Avropa mədəniyyətini, son yüzilin Avropa mədəniyyətində ən önəmli mövqelərdən birini tutan milliyyət fikrini anlamışdı. Bu anlayış digər bəzi səbəblərlə bərabər, Midhədi xalqa, mühitimizin nankor bir təbiri ilə avama, daha doğrusu, türkçülüyə sövq etdi. Bu günkü Avropa mədəniyyətinin ruhu, elm və mərifəti, sənaye və ədəbiyyatı xalqa mal etməkdir (demokrasi). Əhməd Midhəd Əfəndi, məhz əsil bu ruhu kəşf etmişdi və bütün həyatını kəşf etdiyi bu əsasın tətbiqinə sərf etdi."[1]

Əhməd Midhəd Əfəndinin dildə xalqçılıq yönündən milliyyət fikrini anlamış olduğuna inansaq da, Tənzimat dövrünün mövcud və ya vücuda gətirilməsini mümkün sandığı "Osmanlı milliyyətinin" mahiyyəti etibarı ilə milliyyət fikrinə uyğun olmadığını, Əbdülhəmidin səltənətinin ilk anlarında hələ dərk edə bilməmiş olduğuna da şübhəmiz yoxdur. Baxmayaraq ki, Əhməd Midhəd Əfəndi, özünə o qədər düşmən qazandıran, məşhur "Üssi-inqilab"ında, "Milliyyəti-Osmaniyyə"nin sanki ideoloqu olmuş, o xəyalın nəzəriyyəsini qurmağa çalışmışdır: Əhməd Midhəd Əfəndiyə görə, "bir milləti-cədidəyi-Osmaniyə" vardır; "Osmanlılıq hazırda hökmdar olan padşaha tabe olmağı əsil siyasət olaraq qəbul etməkdən ibarətdir". Bu mənsubiyyət üçün hansı dində, hansı məzhəbdə, hansı milliyyət və qövmiyyətdə olurlarsa olsunlar, heç bir əngəl yoxdur.[2]

Əfəndinin bu görüşü, belə hesab edirik ki, zamanın keçməsi ilə hadisələrin "Osmanlı milliyyəti teorisi"ni ardıcıl təkzib etməsi nəticəsində dəyişmiş və Əbdülhəmid dövrünün ortalarında Əfəndi, siyasətən islamçılıq və türkçülük fikrinə meyl göstərmişdir. Əsərləri türk aləminin hər tərəfinə yayılaraq çox oxunan və türk aləminin dörd tərəfindən İstanbula gəlmiş və ya uğramış türk aydınları ilə fikir mübadiləsi etməkdən zövq alan Əhməd Midhəd Əfəndinin bütün türklük fikri ilə də zehninin uğraşmamış olması, qəbul edilə bilməz. Fəqət bu zamanlarda yayımlanmış əsərlərindən belə bir fikrin dəlilini tapıb göstərmək asan deyildir.

Bu qədər ki, İkinci Yunan hərbi öncəsində, yəni 1806-cı və 1807-ci illərə doğru adları eşidilməyə başlayan üçüncü dövr türkçülərinin, Əhməd Midhəd Əfəndi ilə Türkiyyat məsələləri barədə xeyli müzakirələr aparıb, Əfəndinin məsləhətlərindən feyz aldıqlarını dəqiq saya bilərik.[3] Qısacası, Əhməd Midhəd Əfəndinin milliyyət haqqındakı düşüncəsi, inkişaf edərək, nəhayət, türkçülüyə gəlib çatmışdır. İkinci Məşrutiyyət inqilabından bir müddət sonra (1908) onunla ilk dəfə tanış olduğum zaman, "Xaceyi-əvvəl"imizi, pedaqoji, dil, tarix və ilahiyyat sahələrində tamamilə türkçü görmüşdüm.

---

[1] Akçuraoğlu Yusuf, "Əhməd Midhəd Əfəndi", "Türk yurdu", c. III, s. 170
[2] Əhməd Midhəd Əfəndi. "Üssi-inqilab", Təqvimhanəyi-Amirə, İstanbul, 1294 (1878), s. 10-13.
[3] Akçuraoğlu Yusuf, "Əhməd Midhəd Əfəndi", "Türk yurdu", c. III, s. 178, Nəcib Asim, "Vələd Çələbi həzrətləri", "Türk yurdu", c. XII, s. 2471, A. Y.
"Nəcib Asim bəy sonradan mənə yazdığı bir tərcümeyi-hal məktubunda həmin məsələni bu şəkildə aydınlatmaqdadır: "Əhməd Midhət mərhumu və onun yanında görüşdüyüm Vələd Çələbini türkçü etdim..."

## ƏHMƏD CEVDƏT PAŞA

Ən görkəmli şəxsiyyətləri Süleyman Paşa, Şeyx Süleyman Əfəndi və Əhməd Əfəndidən ibarət olan türkçülük hərəkatının bu ikinci fəal dövründə, Əhməd Cevdət Paşanın da heç olmazsa, dil və siyasət yönlərindən türkçülük və "bütün türkçülük"lə bağlı bəzi görüşlərini xatırlatmamaq bir nöqsan olardı. Osmanlı türklüyünün XIX yüzilin son rübündə kəskin zəkası, hüquq, tarix və dil sahələrində geniş bilgisi və hədsiz çalışması ilə özünü göstərən bu fəqih (fiqh bilgini) və alim paşasını, hüquq, dil, tarix və siyasətə, türk milliyyəti fikrinə tamam tərəfdar və müdafiəçi deyə qəbul etmək doğru olmaz; ancaq türkçülük fikrinə ilgisiz və ya düşmən olduğunu sanmaq da səhvdir.

Əhməd Cevdət Paşa, islam fiqhini bir qədər türkləşdirmişdir, deyilmi? "Qısası-ənbiya"sı ilə dildə türkçülüyə gerçəkdən xidmət etdiyi inkar oluna bilərmi? "Tarixi-Cövdət"də əsil fikri, Əhməd Əfəndininki kimi osmanlılıq olmaqla bərabər[1] türklüyə, türk irqinə, irqə, öz ifadəsi ilə "cinsiyyətə" önəm vermirmi?

Osmanlı tarixinin bəzi önəmli olaylarını açıqlamaq üçün irəli sürdüyü görüşlərdə siyasi baxımdan cinsiyyətə verdiyi dəyər açıqdır; məsələn, Rusiyanın Krımı istilası münasibəti ilə Qanuni-Süleymandan etibarən alman səfərləri ilə artıq məşğul olmağı tənqid edərək deyir ki: "...Macarıstan və Xorvatiya fəthi ilə məşğul olmaqdansa, bu iki əyalətin (Kazan və Həştərxan xanlıqlarının tutulması və mühafizəsi dövləti-ali tərəfindən daha faydalı və Yavuz Sultan Səlimin yuxarıda açıqlanan məsləkinə[2] daha uyğundu; çünki Qafqaz, Həştərxan və Kazan əhalisi ilə alındığı təqdirdə yaxınlıq, soy birliyi və çoxunda din və məzhəb birliyi olması səbəbi ilə, təbiətiylə... Osmanlıya qatılmış sayılardılar. O durumda Krım da digər Osmanlı əyalətləri şəklinə girərdi. Həştərxan və Kazan vasitəsi ilə böyük Tatarıstan tərəflərində də Osmanlı dövlətinin nüfuzu keçərli olardı.."[3]

## OSMANLI MİLLİYYƏTİ, İSLAM BİRLİYİ VƏ TÜRKÇÜLÜK

İndiyə qədər türk milliyyətçiliyi fikrinin Batı (Osmanlı) türkləri içində 1865-1870 və 1876-1880 illərində daha çox göründüyünü olayların rəhbərliyi ilə gördük və müəyyən etdik. Və bunların müəyyən illərdə, digər illərə nisbətən daha çox işlənmiş olmasının səbəblərini də açıqlamağa çalışdıq. Osmanlı ölkəsi türklərinə türk milliyyətçiliyi fikrinin haralardan və hansı yollarla gəlmiş olması ehtimalına dair də bəzi fikirlər irəli sürdük. Ancaq "Osmanlı imperatorluğu içində əksəriyyəti təşkil edən türklərin ayrı bir millət halında təşkilatlanmalarını inkişaf etdirmək və

---

[1] Əhməd Cevdət Paşa, tərtibe-cədidi "Tarixe-Cevdət", Mətbəəyi-Osmaniyyə, İstanbul, 1302 (1886), c. I, s. 24-25.

[2] Həmin əsər, s. 34.

[3] Həmin əsər. s. 193.

yetişdirmək ehtiyacı hansı iqtisadi, sosial və siyasi şərtlərin təzyiqi nəticəsində meydana gəlmişdir?” məsələsini incələməyə hələ girişmədik.

Bu məsələnin lazımi səviyyədə həll edilməsi üçün öncə əlimizdə yetərli qaynaq olmadığını etiraf etmək lazımdır: Osmanlı imperatorluğunun XVIII yüzilliyin sonları ilə XIX yüzil başlarındakı iqtisadi və sosial durumu ciddi bir şəkildə incələnməyib, bu incələmənin nəticəsi ortaya qoyulmamışdır. Osmanlı imperatorluğunun bir az iç siyasət və idarəsi daha çox -ancaq xaricdən baxılmaq üzrə- xarici siyasi ilişkiləri məlumumuzdur. Buna görə, iqtisadi və sosial təcrübələrin təsirlərini araşdırmağa qalxmayaraq, yalnız siyasi və diplomatik amilləri göz önünə gətirə bilərik:

Yunanların, serblərin, Əflak və Buğdan ulahlarınınn bağımsızlıq qazanıb Osmanlı ölkəsindən ayrılmaları, Osmanlı təbəəsi olaraq qalan rumların müsəlman və türklərə düşmənçilikləri, xristian ərəblərin, bolqarların, hətta ermənilərin belə bağımsızlıq fikri ilə qımıldanmaları xristian Osmanlı təbəəsinin milli müstəqillik qazanmaları xeyrinə bütün Avropa xristian dövlətlərinin davamlı müdaxilələri, bütün bu hadisələr XIX yüzil ortalarında müsəlman və türk Osmanlılara artıq xristianlarla bərabər yaşaya bilməyin çox çətin olduğunu çox açıq göstərmişdir. Bu siyasi və diplomatik durum qarşısında, ümumiyyətlə, müsəlman Osmanlılar dini birliyin əhəmiyyətini daha çox duymuş və dərk etmişdilərsə də, siyasi hadisələrin dərinliklərinə baxışlarını endirə bilənlər bu birliyin belə yetərli olmadığını, qəti olmasa da əlbəttə, anlamışdılar; türklərin imperatorluqda hakimiyyəti qoruya bilmələrinin, hökmdar xanədanının da mənsub olduğu türk milliyyətinin güclü və inkişaf etmiş olmasına bağlı olduğunu, əlbəttə, sezmişdilər.

Bununla bərabər, imperatorluğun parçalanmasına qarşı qoymaq üçün baş vurulmaq istənilən ilk siyasi çarə, türklüyün qüvvətləndirilməsi olmamışdır. Türkün qüvvətinə tamamən güvənilmədiyindəndirmi, yoxsa Avropa dövlətlərindən bəzilərinin, xüsusilə Fransa imperatorluğunun xeyirxah görünən tövsiyyələrinə artıq güvənilmədiyindənmidir, nədir, türkün hakimiyyətinə türk olmayanları, xüsusən müsəlman olmayanları bərabər olaraq qataraq, Osmanlı dövlətini birlikdə idarə etmək surəti ilə dağılma böhranının önünün alına biləcəyinə ümid bağlanılmışdır. Osmanlı dövlətində Tənzimat və I Məşrutiyyət dövrlərinin iç və dış siyasətinə hakim olan, bu Osmanlı ünsürlərinin hamısını siyasət və idarəyə tamam və bərabər olaraq qatmaq fikridir. Türk ünsürünün iqtisadi və sosial yöndən kifayət qədər inkişaf etməmiş olması, xristian ünsürlərin isə artıq bağımsızlıq amalları ilə tamamən dolu olması, bu fikrin gerçəkləşdirilməsi yolunda sərf edilən çalışmadan gözlənən nəticələrin əldə edilməsinə əngəl olmuşdur. Bununla bərabər, “Osmanlı milliyyəti” siyasəti ilə türkləri türk olmayan müsəlman ünsürlərin qüvvətinə “islam birliyi” vasitəsi ilə dayandırmaq siyasətindən ilk və ikinci dövr türkçüləri, bir növ özlərini qurtara bilməmişdilər; Əhməd Vefiq, Mustafa Cəlaləddin və Süleyman Paşalar kimi türkçülükləri şüurlu və aydın şəxslər belə, siyasətdə “Osmanlı milliyyəti” və “islam birliyi” qayələrinə önəm

verməkdədirlər. *Qısası, bu iki dövrdə siyasi türkçülük, hələ "Osmanlı milliyyəti" və "İslam birliyi" siyasəti ilə qarışmış şəkildədir*.

**ŞEYX CƏMALƏDDİN ƏFQANİ**

Batı (Osmanlı) türkləri içində əlamətlərini gördüyümüz türk milliyyətçiliyinin siyasi qayəsi, hər şeydən əvvəl, Osmanlı imperatorluğunun bütünlük və bağımsızlığının qorunmasına xidmətdi; bu qayə xüsusən Mustafa Cəlaləddin Paşanın və Süleyman Paşanın əsərlərində açıqca seçilir. Osmanlı türkləri, XVIII yüzildən etibarən sarsılan səltənətlərini büsbütün yıxılmaqdan qoruya bilmək üçün "Tənzimat" ilə "Osmanlı milliyyəti" meydana gətirməyə çalışdıqları kimi, təcrübənin uğurlu olmadığını görən bəzi Osmanlı mütəfəkkirləri də ya dinə, islamiyyətə, ya türklüyə, real bir milliyyətə dayanaraq məqsədə nail olmağın mümkün ola biləcəyini düşünmüşdülər. Osmanlılıqda siyasi baxımdan belə bir qaynağa bağlanması mümkün olan milliyyətçilik, Asiyanın ortalarında ortaya çıxan bütün islam aləminə fikri təsiri olan bir şəxsin düşüncəsinə görə, daha geniş və ümumi bir istəyin əldə edilməsini təmin edən önəmli bir vasitə olur. Bəhs etmək istədiyimiz şəxs, Şeyx Cəmaləddin Əfqanidir. Bu məşhur şeyx, bütün islam aləminin yaşaya bilməsi üçün müsəlman millətlərin milli şüura sahib olmaları gərəyinə inanmışdır. Əfqani, islam aləminin hər tərəfinə düşüncələri ilə, sözləri ilə, işləri ilə çox bərəkətli toxumlar saçmış və Batı türklüyündə olduğu kimi Quzey türklüyündə də milliyyət fikrinin inkişafına xidmət etmişdir.

Ya İranda, yaxud Əfqanıstanda 1836-cı il tarixində doğulub, 1897-ci ildə İstanbulda ölən Şeyx Cəmaləddinin tərcümeyi-halı rəvayətlərlə doludur. Nəslən hansı müsəlman qövmünə mənsub olduğunu qəti olaraq bilmirik: bir kitabçanın ərəbcə tərcüməsinə [1] ön söz olaraq yazılmış bioqrafiyasında şeyxin nəslən ərəb olduğu, hətta Hüseyn ibn Əli ibn Əbu Talib sülaləsindən olduğu qeyd edilməkdədir. Fəqət peyğəmbər övladından olmaq iddiası, islam aləmində o qədər yayılmışdır ki, belə bir iddia insanda dərhal və daim şübhə və tərəddüd hissləri oyandırır. Şeyx Cəmaləddin Əfqaninin İstanbulda olarkən yoldaşlarına əslən türk olduğunu söyləməsi bu şübhə və tərəddüdü təbiətiylə artırır. Doğulduğu yer də mübahisəlidir; Əfqani soyadına baxıb Kabil ətrafında doğulmuş olduğunu qəbul edərsək belə, bu durum qövmiyyətini müəyyənləşdirməkdə bizə bir ipucu verə bilməz: əslən əfqan, fars, türk və ya ərəb olması mümkündür. Yalnız bu qətidir ki, Şeyx Cəmaləddin Əfqani ərəbcə, farsca və türkcəni yaxşı danışırdı. Əsərlərinin çoxunu farsca və ərəbcə yazmışdır. İslam aləminin hər tərəfində dolaşaraq dərs, öyüd və risalə halında fikirlərini yayan və təlqin edən Doğu ilə ilgili Avropa böyük dövlətlərinin mərkəzlərində fikirlərini qəbul etdirməyə və bəzi siyasi kombinezonlar etməyə çalışan bu səyyah alim və siyasiyə filan və ya filan qövmdəndir,

[1] T. Y. "Şeyx Cəmaləddin Əfqani", "Türk yurdu", c. IV, s. 2263-2267.

deməyə məncə gərək yoxdur. Batılıların "Un grande Europeen" dedikləri kimi, biz də Şeyx Cəmaləddinə "böyük bir müsəlman", və ya "Böyük bir doğulu" deyib keçə bilərik.

Bu böyük doğulunun fəaliyyət qayəsi, hətta həyat qayəsi, Doğu islamiyyətinin geriləmə və çöküş səbəbləri ilə bu çöküşün önünü ala biləcək çarələri aramaq, tapmaq və tətbiq etməyə çalışmaqdı. Araşdırmaları arasında müsəlmanların irqi məsələlərə və irqi birliyə önəm verməmiş olmalarının, geriləmə və çökmələrinin səbəblərindən olduğuna qənaət gətirmişdir; və bundan dolayı müsəlman qövmlərinə, irqə, milliyyətə, öz ifadəsi ilə "cinsiyyətə" önəm vermələrini tövsiyyə etmişdir. Demək olar ki, Şeyx Cəmaləddin Əfqani, islam aləminin yaşaya bilməsini, inkişafını, müsəlman qövmlərinin şüurlu milliyyətçi olmalarına və milliyyətləri (cinsiyyətləri) daxilində irəliləyib inkişaf etmələrinə bağlı görürdü. Şeyxin bu görüşünü isbat edən iki şahidə sahibik: birincisi "Məqalati-Cəmaliyyə" adı ilə farsca olaraq Hindistanda yayınlanan toplanmış məqalələrindən "Vəhdəti-Cinsiyə fəlsəfəsi" və "İttihadi-lisanın Mahiyyəti-həqiqiyyəsi" adlı məqaləsidir, ikincisi milli türk şairi Məmməd Əmin bəyə tövsiyyələridir.

Türkcə tərcüməsi "Türk yurdu"nda yayınlamış olan "Vəhdəti-cinsiyə fəlsəfəsi"nin tezi budur: "Cinsiyyət (yəni milliyyət) xaricində xoşbəxtlik yoxdur. Dilsiz cinsiyyət olmaz, bütün təbəqələrin və siniflərin ifadə və istifadəsini təmin etməyincə bir dil meydana gəlmiş olmaz."[1] Şeyxin düşündüyünə görə: "İnsanlar arasında qapsamı geniş olub bir çox fərdi bir-birinə bağlı edən iki bağ vardır: biri dil birliyi -digər bir ifadə ilə cins birliyi, ikincisi din. Dil birliyinin, yəni cins birliyinin (yəni irqin, milliyyətin) dünyada qalıcılığı və səbatı, heç şübhə yoxdur ki, dindən daha davamlıdır. Çünki az bir zamanda dəyişməz. Halbuki ikincisi belə deyildir: tək bir dildə danışan irqi görürük ki, min illik bir zaman içində, dil birliyindən ibarət olan cinsiyyətdə bir pozulma olmadığı halda, iki-üç dəfə din dəyişdirir." Bu ümumi ifadədən Şeyx Cəmaləddinin din birliyindən çox cins birliyinə və dolayısı ilə "ittihadi-islam"dan çox hər hankı cinsi, yəni irqi bir birliyə, məsələn, "bütün türklük"ə dəyər verdiyini anlamış oluruq.

Diqqətə dəyərdir ki, Şeyx Cəmaləddin Əfqani, cinsiyyəti, yəni irqi alman filoloqları kimi dil birliyi ilə tərif edir. Bu yöndən dilə, dil zənginliyi və təmizliyinə, yəni terminlərinin tamam olmasına və eyni zamanda millətin çeşidli təbəqələri tərəfindən anlaşılacaq şəkildə olmasına çox önəm vermişdir: "Müəyyən bir irqə mənsub olan çeşidli təbəqələrin ifadə və istifadəsini təmin edə bilməyən bir dil, o irqin bütünlüyünü qoruya bilməz..."

İrqi nəticələri təqdir edən alimlərin ilk vəzifələri öz dillərinin genişləndirilməsindən ibarətdir... dil məsələsindən bəhs edərkən ana dilinə üstünlük verilməsini, yetməzsə, "öz dilləri ilə sıx əlaqəsi olan digər dillərdən də ehtiyac və məcburiyyət olduqca kəlmələr alınmasını və artıq

---

[1] "Vəhdəti-cinsiyyə fəlsəfəsi", "Türk yurdu", c. III, s. 45. Məqalənin çevirəni Rəsulzadə Məhəmməd Əmin bəydir. Məqalənin tezi dediyimiz əsil iddialar farsca mətnin başında ərəbcə yazılmış və türkcəyə çevrilərkən də bu özəllik qorunmuşdur.

başqa çarə qalmadığı vaxt, yabançı kəlmələrdən gərəkli olanları alma yoluna gedilməsini" tövsiyyə edir. "Fəqət müəyyən kəlmələri öz dillərinin kisvəsinə sarmaq şərtdir; o qədər ki, yabançı olduqları anlaşılmasın..."

Görünür ki, türkçülüyün son dövründə türkcənin islahı məqsədi ilə ortaya atılan bəlli-başlı fikirlərin çoxunu, qüvvətli bir sezgi ilə yazılan bu məqalə qısaca əhatə etməkdədir. Nəhayət, Şeyx Cəmaləddin Əfqani, "dünyada səadət deyə qəbul olunan bütün xüsuslarda başarılı olmanın" "vəhdəti-cinsiyə"nin, yəni milliyyətin inkişafı və yetkinləşməsi ilə mümkün olduğu inancındadır. Təhlil etməkdə olduğumuz bu önəmli məqalənin ilk qismi belə ümumi mahiyyətdə, qiymətli görüşlərdən meydana gəlir; ikinci qismi doğrudan-doğruya hindlilərə xitabdır. Şeyx Cəmaləddin Əfqani, məqaləsində mücərrəd və ümumi bir girişdən sonra, konkret və real tənqidlərə, öyüdlərə keçmişdir. Hindlilərə öyüdləri arasında israrla üzərində durduğu nöqtə "vətəni-dil" dediyi Urdu dilinin genişləndirilməsi və inkişafının mütləq şərt olduğudur. Çox qüvvətli bir sezgi ilə yazılan bu məqalənin son sözləri həmişəki kimi peyğəmbəranədir: "Bəzi dar görüşlülərin bu bəyanatıma heyrətlə baxacaqlarını yaxşı bilirəm; ancaq zaman bu sözləri açıqlayıb mənalandırınca, ağıllı adamlar bu sözlərin nə qədər doğru olduğunu, əlbəttə, təsdiqləyəcəkdir."

Əfqanlı Şeyxin şair Məmməd Əmin bəyə söylədikləri də məqaləsində yazdığı əsas fikirlərinin təbii nəticələridir. Milli şairimiz hələ gənc ikən Cəmaləddinin Nişantaşındakı iqamətgahına gedirdi. Şeyx, şairə indi təhlil etdiyimiz məqaləsinin doğrultusunda bir xeyli öyüd və tövsiyyələr etmişdir. Bu öyüd və tövsiyyələri milli şairimizdən bəhs edərkən bir az genişlədərək ərz edəcəyik.

## QAFQAZ, KRIM VƏ KAZAN TÜRKLƏRİNDƏ MİLLİYYƏT FİKRİ

Türk milliyyəti fikrinin Batı (Osmanlı) türkləri arasında ikinci dəfə önəm qazandığı dövr ilə o dövrü təqib edən illərdə, yəni 1876-1883-cü illərdə bu fikrin, Qafqaz, Krım və Kazan türkləri içində ortaya çıxdığına şahid oluruq. Qafqaz, Krım və Kazanda milliyyət fikri, öz çevrəsəl şərtlərinin, yəni olduqları mühitdəki siyasi, sosial və iqtisadi şəraitlərin və eyni zamanda İstanbul və Rusiyadakı fikri faktorların təsiri altında doğulmuşdur. İstanbuldan gəlmə fikri amillərin, ruslardan gələn fikri amillərdən öndə gəldiyini sananlardanam; Rusiyada yaşayan türklər arasında milliyyət fikrinin ilk öncə Osmanlıya yaxınlığı, İstanbulla ilişkiləri daha çox olan Qafqaz və Krımda özünü göstərməsi də bunu göstərir. Qafqaz və Krımdan milliyyət, yəni türklük fikri, başlanğıcda İstanbulda olduğu kimi, digər fikirlərlə islamçılıq və yenilik fikirləri ilə qarışıq olaraq meydana çıxır. Azərbaycanlı Axundzadə Fətəlinin XIX yüzilin ortalarına doğru özünü göstərən fikri və ədəbi fəaliyyətindən yuxarıda bəhs etmişdik. Mirzə Fətəli açıqdan-açığa türk milliyyətçiliyi fikrini yaymış deyildir, ancaq komediyaları ilə, hərflərin islahı dərdi ilə bu qayəyə doğru yürümüşdür.

### Rusiyada ilk türkcə qəzet: Həsən Bəy Zərdabinin "Əkinçi"si

Axundzadənin ölümündən üç il öncə, yəni 1875-ci ildə yenə azərbaycanlı bir şəxs, Məlikzadə Həsən bəy Zərdabi bütün Rusiyada ilk türkcə qəzet olan həftəlik "Əkinçi" qəzetini Bakıda nəşr etməyə başlamışdır. Həsən bəy məmləkətində ana dili ilə bir az ərəbcə və əcəmcə oxuduqdan sonra, Tiflis gimnaziyasını və Moskva Universtiteti təbiiyyat fakultəsini bitirmişdir. Qəzeti çıxardığı zaman Bakı gimnaziyasında təbiət müəllimi idi. Təbiətçiliyindən təsirlənərək qəzetinə "Əkinçi" adını qoymuşdur, qəzetəsində əkinçiliyə, ümumiyyətlə, maddi və iqtisadi məsələlərə çox önəm verirdi; Həsən bəyin əsl millət tarlasına əkmək istədiyi toxumlar irəliləmə və yenilik toxumlarıdır. "Əkinçi" 1875-dən 1877-yə qədər davam edir. Türk-Rus hərbi zamanı, nəşri çar hökuməti tərəfindən yasaqlanmaq surəti ilə dayandırılır.

Bu iki-üç illik "Əkinçi" kolleksiyonu vərəqləndiyində, Həsən bəyin iqtisadi, sosial və siyasi həyata, hər şeydən öncə Darvinin kainat həyatında gördüyü "Struggle for Life" (yaşamaq uğrunda mübarizə -A. K.) düsturuna çox dəyər verdiyi və bu həqiqəti millətinə yaxşıca anlatmaq istədiyi gözə çarpır. Zərdabi, "həyat üçün mübarizə"ni "Zindəganlıq cəngi" deyə tərcümə edir və bütün məqalələrində "zindəganlıq cəngi" deyimi davamlı təkrarlanır. İstər ki, milləti, yaxud Zərdabinin deyimi ilə "müsəlmanlar" bu cəngdə məğlub olaraq məhv və pərişan olmasınlar!...

"Əkinçi" ümumiyyətlə, siyasətdən, xüsusən siyasi olaylardan az bəhs etmişdir. Buna bəlkə zamanın senzura şərtləri əlverişli deyildir. Bununla bərabər, "Əkinçi"də siyasi məsələlər getdikcə

çoxalmışdır; son nüsxələrinə doğru siyasi məqalələrində türk milliyyətçiliyi, müəyyən dərəcəyə qədər sezilir: məsələn, XIV nömrəsində türk dillərinin birləşdirilməsini nəzərdə tutan bir məqalə nəşr olunmuşdur (26 sentyabr, 1876); öz dilimizdə “elm və ədəbiyyat meydana gətirilməsi” istəyi ilə yazılmış digər bir məqalə də eyni nüsxədə mövcuddur. Bir neçə nüsxə sonra təkrarən dil məsələsindən bəhs edilərək elmin məktəblərdə, hətta gimnaziyalarda (yəni rus hökumətinin Azərbaycandakı gimnaziyalarında) ana dili ilə (türkcə ilə) təlim edilməsi zərurətindən bəhs edilməkdədir.

Türk-Rus savaşı başladıqdan sonra “Əkinçi”nin savaş xəbərlərini düzənli olaraq verə bilmədiyi gözə çarpır. Bu xəbərlər bəzi nüsxələrdə çox isə də, bəzi nüsxələrdə yox deyiləcək qədər azdır. Bu səbəblə Həsən bəy, çox qapalı bir şəkildə qəzetinin hürriyyətsizliyindən şikayət edir. Savaş xəbərləri arasında Osmanlı türklərinə tərəfdarlığını özündə ehtiva edən nöqtələr də yox deyildir.

“Əkinçi”, ilk nüsxələrindən etibarən, oxucu azlığından şikayətçidir. Qövmünün oxumağa həvəssizliyinə görə, çox üzgün olan Həsən bəyin qəlbindən, nəhayət belə bir şikayət də çıxır: “Ey qardaşlar, sizin can çəkişmənizdə bircə qəzetiniz ki, “Əkinçi”dir, o da ölsün!...” Gerçəkdən, qəzetin ilk ilində 600 müştərisi varmış; get-gedə 283 olmuş, nəhayət, savaş zamanında 200-ə enmişdir, qəzetin bu şərtlər altında yaşaya bilməyəcəyi təbii idi.[1]

**Ünsizadələr mətbuatı**

“Əkinçi” qapandığı zamanlarda (1877), Qafqasiyanın mərkəz idarəsi olan (Tiflis) şəhərində Ünsizadə Səid və Cəlal qardaşları tərəfindən bir mətbəə qurularaq “Ziyayi-Qafqaziyyə” adlı həftəlik bir qəzet nəşrinə başlanmışdır. Ünsizadə Səid Əfəndi, o zamanlar Şirvanda Şamaxı şəhərinin qazısı (hakim) idi; Ünsizadə Cəlal bəy Doğu elmləri ilə bərabər rus şəhər məktəblərindən birisində rusca oxumuş bir gəncdi.[2] “Ziyayi-Qafqaziyyə” 12 il yayınlanmış və yayıma başladığından 10 il qədər sonra sahibləri ona “Kəşkül” adlı həftəlik bir dərgi əlavə etmişdilər. “Ziyayi-Qafqaziyyə”nin iki nüsxəsi kitabxanamda var; “Kəşkül”ü tapmaq və görmək nəsib olmadı. Əlimdəki “Ziya” nücxələrindən, bu qəzetin Qafqazda yaşayan türkləri dünya durum və hadisələrindən xəbərdar etmək istədiyi, müsəlman və Osmanlı məmləkətlərinə aid xəbərləri öncəlik verərək yazdığı anlaşılır; fəqət dil, ədəbiyyat, tarix və siyasət sahələrində türk milliyyətçiliyi ilə ilgiləndiyinə dair bu

[1] “Əkinçi”yə dair məlumatı İsmayıl bəy Qaspıralının şəxsi kitabxanasında mövcud olan “Əkinçi” kolleksiyonundan aldım (A. Y.).

[2] Səid Əfəndi və Cəlal bəy, daha sonra Qafqasiyadan Osmanlı ölkəsinə sığınmışdılar. Alimlərdən Hacı Səid Əfəndi Məclisi-Kəbiri-Maarif və Məclise-Tədqiqata üzv təyin edilmişdi; 1912-ci ildə öldü. Cəlal bəy Mətbuat və Xariciyyə məmurluqlarında işləmiş və qəzetçilik etmişdir; son illərdə Ankara Mətbuat İdarəsində, yaşının çox olmasına baxmayaraq, bir gənc kimi nizam və nəşə ilə çalışdı. Ara-sıra ciddi və satirik şeirlər də yazardı.

nüsxələrdə bir işarə yoxdur. “Kəşkül” həftədə bir dəfə, 30-40 səhifəlik bir dərgi halında beş il qədər davam etmişdir. Ünsizadə Cəlal bəyin dediyinə görə, *“Kəşkül”* azəri şivəsini İstanbul türkcəsinə yaxınlaşdırmaq məqsədi ilə nəşr olunurmuş; bu dərgidə azəri, Cığatay, noğay və Osmanlı şivələrində türkcə məqalələrlə, ərəbcə və farsca yazılar nəşr olunurmuş; hətta Əbüzziya Tofiq bəy mərhumla O zamanlar İranın Tiflis baş konsulu olan Prins Ərfəüddövlə də məqalə yazıb “Kəşkül”ə göndərirlərmiş. Bu müxtəlif müsəlman dillərində yazılan məqalələri özündə əhatə edəcəyi üçündür ki, bu dərgiyə sahibləri “Kəşkül” adını vermişdilər. Azəri şivəsini, Batı, İstanbul türkcəsinə yaxınlaşdırmaq qayəsini təqib etdiyi üçün, “Kəşkül” və “Ziya”nın sahib və yazarlarının Çar hökuməti tərəfindən təqiblərə və sorğu-suala məruz qalmış olduqları da, Cəlal bəyin verdiyi məlumatlar arasındadır. Hətta iki qardaşın, Səid Əfəndi ilə Cəlal bəyin Qafqasiyanı tərk etməyə məcbur olmaları da, bu hadisənin bir nəticəsi imiş.

Qənaətimə görə, “Ziyayi-Qafqaziyyə” və “Kəşkül” türk milliyyətçiliyi fikrindən çox, o zamanlar da xüsusi bir dəyəri olan və adətən bütün türklük qayəsinə, bir mərhələ təşkil edən islam birliyi görüşünü yaymış və müdafiə etmiş olsalar gərəkdir; şəxsən Cəlal bəyin xüsusi bir məktubunda mənə bildirdiyinə görə, “Kəşkül”ün bütün müsəlman məmləkətlərindən, Osmanlıdan, İrandan, Hindistandan, Türküstandan, Şimali Qafqasiyadan gələn türkcə, ərəbcə, əcəmcə məqalələri içinə alması bu qənaətimin doğruluğunu göstərir. Məncə, Ünsizadələrin fəaliyyətinin türk milliyyətçiliyi ilə əsil ilgisi, Qaspıralı İsmailin ilk türkcə əsərlərini basmış olmasıdır. Gerçəkdən də, İsmayıl bəy rusca bir neçə qəzet məqaləsi yazıb nəşr etdirdikdən və Krımda daş basması ilə türkcə bir-iki yarpaq qaraladıqdan sonra, Ünsizadələr mətbəəsinə üz tutmuşdur.

Bu şəkildə XIX yüzil sonlarında bütün türkçülük hərəkatının ən önəmli və mərkəzi siması olan Qaspıralı İsmayıl bəyin həyat və fəaliyyətinə gəlib çatmış olduq.

## İSMAYIL BƏY QASPRİNSKİ (QASPIRALI): “TƏRCÜMAN”

Krımlı İsmayıl bəyin ilk fikri və yazılı fəaliyyətindən etibarən, görüş dairəsinin Krımla məhdudlaşmadığı dərhal gözə çarpır: rusca yazıb Krımın mərkəzi idarəsi Akməscid (Simferopol) şəhərində çıxan “Tavrida” qəzetində hissə-hissə nəşr etdirdiyi məqalələrinin hamısına “Russkoe musulmanstvo” (“Rusiya müsəlmanlığı”) adını vermişdir. 1881-ci ildə yayınlanan bu məqalələrin mövzusunu yalnız Krımda yaşayan müsəlmanlar deyil, bütün Rusiyada yaşayan müəlmanlar təşkil edir. Eyni ildə, yenə Akməsciddə daş basması ilə basılan türkcə “Tonquc”(ilk çocuq) qəzetində istər dil, istər mövzu etibarı ilə yalnız Rusiyada yaşayan müsəlmanları deyil, bir az qapalı bir şəkildə bütün dünyada türkcə danışan müsəlmanları, yəni bütün türkləri göz önündə canlandırır və bismillahla bərabər, bu qəzet də türk-tatarların dildə birliyi məsələsini ortaya atır, gerçəkdən hər

tərəfdə anlaşıla biləcək bir türk dili ilə yazar; yəni dil və ədəbiyyat sahəsində gerçəkdən bütün türkçülüyə başlar.

İsmayıl bəyin tərcümeyi-halını, türklük fikri ilə, türklük hərəkatı ilə əlaqəsi olanların hamısı az-çox bilirlər -zənnindəyəm. Bu yöndən həyat və fəaliyyətinin yalnız bir neçə əsaslı mərhələsini xatırlatmaqla kifayətlənəcəyəm:

1841-də [1] doğulan İsmayıl bəy, fövqəladə yaradılmış adamlardandır, türklüyə böyük xidmətini ən çox yaradılışına borcludur. Müntəzəm təhsil dövrü, bir-iki il əlifba və "Quran" oxumaqdan sonra Moskva Əsgəri Edadisində dörd-beş il rusca ikinci dərəcəli dərsləri təqib etməkdən ibarətdir. Milli hissi, milli şüuru, ilk əvvəl Rus Əsgəri Edadisində duymuşdur. Və buna səbəb, bazar günləri evlərində müsafir olduğu şəxslərlə, milliyyətçi bir rus ailəsində keçən söhbətlərlə, panslavistlərin rəislərindən Katkovun Girit inqilabı barəsində türklər əleyhinə yazdığı məqalələr olmuşdur. Bu zaman İsmayıl bəy, 14-15 yaşlarında idi. Mixail Katkovun Moskva qəzetində türk və müsəlmanlar əleyhinə yazdığı həyəcanlı məqalələr, gənc və hərarətli İsmayıl bəyi o qədər coşdurur ki, nəhayət, 1867-ci ilin yazında, Giritdəki türklərə dörd-beş illik hərbi edadidə öyrəndiyi biliklərlə yardım etmək üçün Giritə getməyə qərar verir və bir arkadaşı ilə (Mustafa MiRıza Davidoviç) bərabər yola çıxırlar; fəqət Odessada pasportsuz gəmiyə minmək istərkən jandarmlar tərəfindən tutulub ata-analarına təhvil verilirlər...

Bu macəradan sonra İsmayıl bəy bir daha Moskvaya, Əsgəri Edadiyə dönmədi; Krımda qaldı. Və Baxçasarayın Məngli Giray xandan qalma əski Zəncirli mədrəsəsində rusca müəllimi oldu; Krımda müəllimliyi 1871-ci ilə qədər davam edir. Bu zaman İsmayıl bəyin təkrar İstanbula getmək və orada türk əsgər və ya məmuru olmaq həvəsi daha da qabarır. Zatən qohumlarından biri İstanbulda məmur idi. İsmayıl bəy İstanbulda yaxşı bir məmur ola bilmək üçün fransızca bilmək zərurətinə inanmaqdadır. Buna görə, İstanbula Paris yolu ilə getməyi, yəni Parisdə bir müddət qalıb fransızcanı ağıllı-başlı öyrəndikdən sonra İstanbula gəlməyi planlaşdırar və 1872-ci ilin son baharında Parisə gedər və orada iki ilə qədər qalar. İsmayıl bəyin Parisdən ən böyük istifadəsi, Batı mədəni həyatını olduğu kimi- gözəllik və çirkinlikləri ilə, yaxşı və pis cəhətləri ilə öyrənmək, bu həyatın min cür əngəli və zorluğu ilə cəngləşə-cəngləşə yaşamaq oldu... Doğudan gələn bir yabançı üçün deyil, yerlilər üçün belə olduqca qarışıq və çətin olan Paris həyatında hələ 21-22 yaşında olan İsmayıl bəy, təmtək, sırf öz gücü ilə iki il yaşaya bilmişdir. O zamanlar Parisdə olan "Gənc Osmanlılar"la tanış olub-olmadığına dair əldə dəqiq məlumat yoxdur.

1874-cü ildə Osmanlı hökumətindən məmuriyyət istəyir. Bir aralıq Hərbiyyə Məktəbi rusca müəllimliyinə təyin edəcək olurlar, ancaq işi uzanır. Bir ilə qədər İstanbulda əzab-əziyyət çəkdikdən sonra, nəhayət yenə Krıma dönür... İsmayıl bəy bu bir il içində, İstanbulun rəsmi dairələrini çox

---

[1] **İsmayıl bəy, bütün mənbələrin yekdil qənaətinə görə, 1851-ci ildə anadan olmuşdur. Yuxarıda göstərilən tarix yəqin ki, texniki bir yanlışlıqdan başqa bir şey deyildir (A. K.)**.

dolaşdı, hakimlər və məmurlarla yaxşıca tanış oldu. Osmanlı mətbuatını ardıcıl izlədi. Osmanlı dövlətinin iç idarə üsullarını, dövlətlər arası vəziyyətini öyrəndi, qısacası İstanbulu, Türkiyəni və bunları idarə edənləri həyatda görmüş və incələmiş oldu.

İsmayıl bəyin ilk yazarlığı İstanbulda başlar: Moskva və Peterburqun bəzi rus qəzetlərinə İstanbuldan yazdığı doğulu rənglərlə süslü, yarı gerçək, yarı xəyali məktubları o qəzetlərdə basılıb çıxar.

Krıma döndükdən sonra, dörd ilə qədər müəyyən bir işlə məşğul olmadan, xüsusən millətdaşlarının müxtəlif təbəqələrinin həyat və durumlarını incələməklə vaxtını keçirdi.[1] Və 1878-ci ildə Baxçasaray şəhərinə bələdiyyə başkanı seçildi. Bələdiyyə başkanı olunca, 1879-cu ildə türkcə bir qəzet çıxarmaq üçün izin istəyərək əlaqədar məqamlara bir ərizə verdi. Bütün Rusiyada daha öncə çıxıb qapanmış "Əkinçi" ilə axsaya-axsaya hələ davam edən "Ziya" və "Kəşkül"dən başqa türkçə qəzet çıxmamışdı. İsmayıl bəyin ərizəsinə rədd cavabı gəldi. Bir tərəfdən qəzetə icazə almaq işinə çalışarkən, digər tərəfdən yuxarıda haqqında bəhs etdiyimiz "Rusiya müsəlmanlığı" məqalələrini rusca yazıb nəşr etdirmişdir. Bu məqalələr, Qaspıralının, o zaman, yəni 1881-ci ildə daşıdığı fikirləri, öz-özünə ortaya qoyduğu məsələləri, qəbul etdiyi qərarları açıq bildirdiyi kimi, gələcəkdəki düşüncə həyatının da bir növ proqramı mahiyyətindədir. Bu baxımdan İsmayıl bəyi anlamaq üçün cəmi 45 səhifəlik risalə olan bu kiçik əsər, böyük dəyərə sahib qaynaqdır.

Bu əsərdən açıqca anlayırıq ki, İsmayıl bəy bir *milliyyətçidir*. İsmayıl bəy mənsub olduğu milləti, yalnız Krımlılar olaraq almır, "türk-tatar" adı ilə anılan qövmlərin hamısını öz milləti sayır. Bu baxımdan İsmayıl bəyi bu andan etibarən *"bütün türkçü"* saymaqda xəta yoxdur.

"Rusiya müsəlmanları", milliyyətçilik baxımından olduqca önəmli bir durumu görür və bu səbəblə yenə eyni önəmdə bir məsələni ortaya qoyur: "Asiya və Avropanın bir qismində yaşayan böyük bir millət, türk-tatar milləti var. Bu millət, parça-parça, dağınıq, zəif, bu millət digər millətlərə nisbətən elm və mərifətcə, zənginlik və mədəniyyətcə çox geridə qalmış; belə davam edərsə, yaşama qovğası təbii-qanunu gərəyincə məhv olacaq, (xatırlayırsınız ki, bu fikir Zərdabidə vardı-A.Y.) başqa millətlər tərəfindən udulacaq... İştə, bu durumun görülməsindən əsil məsələ doğur: türk-tatarların bu zə'finə, belə geridə qalmasına səbəb nə? Türk-tatar millətini məhv olmaqdan qurtarmaq üçün nə yapmalı? Bu önəmli məsələ, İsmayıl bəyin düşüncə və iş həyatında

---

[1] İsmayıl bəy, yazdığı hekayələrində öz tərcümeyi-halından da bəhs edər. 1906-cı il "Tərcüman"da hissə-hissə olaraq nəşr olunmuş "Gün doğdu" hekayəsinin qəhrəmanı Danyal bəy, şəxsən İsmayıl bəydir. Bu hekayədən 1874-1878-ci illərdə İsmayıl bəyin nələr düşündüyünü, nələr etdiyini müəyyən dərəcəyə qədər anlaya bilərik: "Millətin halına aşina olmadıqca millətə xidmət mümkün olmayacağını anladığı üçün, Danyal bəy (yəni İsmayıl bəy) buna görə elm və mərifəti artırmağa qərar verib milləti arasına atıldı. Köy düyünlərində, dərviş və üləma məclislərində, bəylər və ağalar ziyafətlərində, mədrəsə hücrələrində və digər hər cür toplantıda olub, az söyləyib çox dinləyib bir il qədər gerçək dərslər aldı". "Hər sinfin yaxşı yönlərini və uyğunsuz hallarını görüb, öyrənib, milli zəifliyin nədən ibarət və millətin nəyə möhtac olduğunu anlamışdır." "Nə işləməli, işi haradan tutmalı, sönmüş qəlbləri nə ilə yandırmalı, işığı kəsmiş maneələri nə ilə göstərməli və qəflət səhrasında sərilib qalmış qoca bir milləti nə ilə ayağa qaldırmalı?" kimi suallarla çox zaman məşğul olmuşdur. ("Gün doğdu" "Tərcüman", №9, 1906.)

ölüncəyə qədər keçərli qalacaq və haqqında bəhs etdiyimiz şəxs, bütün həyatınca bu iki məsələyə cavab verməyə çalışacaqdır. İsmayıl bəyin düşüncə tarixi, bu böyük məsələyə müxtəlif zamanlarda tapıb verdiyi cavabların tarixidir, İsmayıl bəyin amallarının tarixi -şəxsi həyatı təbii olaraq məsələ daxilindədir- tapdığı cavabları həyata keçirmək üçün çalışmasının, mübarizəsinin tarixidir. Bu məsələnin ilk həlli forması "Rusiya müsəlmanlığı" kitabçasında görünür. Bizcə, əsil önəmli olan türklük görüşü baxımından İsmayıl bəyin tapdığı əsaslı nöqtələr bunlardır:

Türk-tatarlar öz məktəb və mədrəsələrində öz dillərində Avropa elmlərini və təhsilini, sənət və sənayesini öyrənməlidirlər. Yalnız məktəb və mədrəsələrlə kifayətlənməyərək, öz dillərində kitablar, risalələr, dərgilər və qəzetlər yazılıb yayımlanmalıdır. Qısacası, milli bir türk-tatar ədəbiyyatı (geniş anlamı ilə) meydana gəlməli idi.[1] İsmayıl bəy Qaspıralı "Rusiya müsəlmanlığı"nı rusları ürkütməmək üçün çox ustaca yazmaq istəmişsə də, bəzi rus tənqidçilər, bu əsərdə bütün müsəlman türkləri Batı mədəniyyəti ilə qüvvətləndirərək birləşmiş bir siyasi topluluq meydana gətirmək və bu şəkildə Rusiya dövlətinin başına böyük bir bəla açmaq, yəni "bütün türklük" yaratmaq qayəsinin gizli olduğunu tapıb göstərməyə çalışmışdılar.

İsmayıl bəydə fikir və iş- öz təbiri ilə, "niyyət və əməl" ayrılmazdır: millət üçün milli dildə davamlı (bəlli günlərdə çıxan) mətbuatın gərəyinə şiddətlə inanan İsmayıl bəy, çox çalışaraq, nəhayət, "Tərcüman" qəzetinin imtiyazını almağı bacardı. Və 1883-cü ilin aprelin 10-u günü, bir yazarın dediyi kimi: "bahar günəşi ilə dünya dirilib çiçəkləndiyi günlərdə, uzun illərdən bəri qarlı kəfənlərlə örtünüb ölü kimi yuxulayan Quzey türklərinin də ilk bəyaz bahar çiçəyi, "Tərcüman" açıldı".

"Tərcüman"ın ilk günlərdə ən önəmli məsələsi, millətə öz dilində elm vermək, Avropa elmlərini və təhsilini, sənət və sənayesini öyrətməkdir. Bunun üçün millətin balalarını oxutmaq, tez, asan və modern elm öyrətmək istiqamətində oxutmaq lazımdır. Buradan bütün Quzey türklüyünə yayılan üsuli-cədid məktəbləri yarandı. "Üsuli-cədid" deyimi Osmanlı türklərindən alınmışdır, bu ifadə o zamanlar İstanbul sosial həyatında istifadə olunan anlayışlardan idi. "Üsuli-cədid" əvvəlcə yalnız təhsil və təlimə məxsus kimi görünsə də, get-gedə ümumiləşərək bütün həyat tərzini əhatə edir. "Üsuli-cədid"in istər Osmanlı türkləri, gərəksə Quzey türkləri arasında gerçək mənası Batı elmlərini, Batı təhsil və təlim üsullarını, yaşayış formasını, Batı həyat tərzini mənimsəmək, qısa bir ifadə ilə "Batılılaşmaq"dır. İsmayıl bəy bütün türklük aləmində özəlliklə Quzey və Doğu türklüyündə batılaşmanın ən fəal bir təbliğatçısı oldu. İnanırdı ki, türklər milli dillərini qeyb etməmək şərti ilə batılılaşınca, türk millətinin həyat və davamı təmin olunmuş olacaqdır.

"Tərcüman"ın, hətta "Tərcüman"dan öncə onu müjdələyən yolda çıxardığı "Tonquc", "Şəfəq", "Ay", "Yıldız", "Günəş" kimi ardıcıl olmayan dərgilərin hamısında İsmayıl bəy Qaspıralı

[1] Görünür ki, elmləri, sənətləri və ədəbiyyatı əhatə etməklə işlənmiş milli bir dilə İsmayıl bəy Qaspıralı da Şeyx Cəmaləddin Əfqani kimi çox böyük bir dəyər verməkdədir.

“dil” məsələsinə çox önəm verir, türk dilinin zənginliyinə, inkişaf qabiliyyətinə, bu dilə yabançı kəlmələr qarışdırmağın gərəksizliyinə və zərərliliyinə, türk ləhcələri arasında fərqlərin azlığına, qısası, ümumi bir türk dilinin varlığına dair qırx dərədən su gətirərək əvvəlcə bir az qapalı, sonralar daha açıq şəkildə bir çox məqalə yazır. Məsələn, birinci türkcə əsəri olan “Tonquç”un Aqməsciddə daş basması ilə oxuna bilməyəcək qədər pis nəşr olunan ilk basımının ön sözü, yəni İsmayıl bəyin millətinə öz dili ilə ilk xitabı belə başlayır: “Millətimizin əsəri olan dilimiz, ədəbiyyatca işlənməmişsə də, təhsilə və qaydalara gələcək dildir. Qayət nazik tatar türkülərindən, Noğay çeklərindən (cünglərindən), Qırğız və türkmən cırlarından anlaşılır ki, əgər dilimizdə ustalıqla kəlmə alınıb işlənirsə, indikinə görə çox dərəcələr parlaq və qullanışlı olur. Muradımız dilimizi irəlilətməkdir[1]”

İbarəni, heç dəyişdirmədən eynən aldım. Senzura şərtlərindən çəkinərək Batı və Doğu türkcələrini saymağa cəsarət etmir. Rusiya idarəsi altında olan türk qəbilələrinin xalq ədəbiyyatını, işlənəcək dilin, ümumi türk dilinin qaynağından sayır. İsmayıl bəyin, dil sahəsində bütün türkçülüyü məhz ilk işə başladığı andan etibarən açıqdır.

İkinci dərgi olan “Şəfəq”də -bu adın simvolik mahiyyəti açıqdır- bir az da irəli gedərək məlum bir türkünün Kazanda və Krımda necə söyləndiyini yazar və bu iki ləhcənin yaxınlığını açıq örnəklərlə göstərir, eyni zamanda Kazan türklərinin yabançı dillərindən kəlmə almalarını tənqid edir, əsil məqsəd ruscadan alınma kəlmələr isə də, yenə senzura şərtlərini nəzərdə tutaraq bunu çox açıq edə bilməz.

“Kazanlılar öz dillərinə çuvaş, mordva kəlmələri qarışdırmağa alışqandırlar. Halbuki alaca-bulaca dil olmaz. Alaca-bulaca iş olmaz. Rakı içəcək isək, açıq-aydın içmək gərək; Sələm-kəlam olduqda “Kak pojivaeş” nə gərək?[2] Üzərində akça olduqda başqasına minnət nə gərək? Türkcə kəlmə olduqda, başqa kəlmə nə gərək?[3]”

Bu lətifə üslubunda yazılan məqalə, yenə ilk türkcə yazılarından etibarən türk dilini alaca-bulacalıqdan qurtarmaq istədiyini göstərir. Bu əsas fikri, İsmayıl bəy bütün həyatı boyu yayacaq və müdafiə edəcəkdir. “Tərcüman”ın Osmanlı ölkəsində ən çox yayıldığı zamanlarda məqalələrinin bir qismi Osmanlı türkcəsinin “alaca-bulacalığını” tənqid mövqeyindəndir. İsmayıl bəy bir məqaləsində Osmanlı ləhcəsinə tənqidi yanaşaraq “mənim ana dilim Daray (Drei) dildən qurulmuş (compose)dir.” deyirdi. Bu şəkildə bəlkə əvvəlcə İstanbulda ikən öyrəndiyi dili sadələşdirmək davasını yenə İstanbulda daha açıq və şiddətlə müdafiə etmiş olurdu. Görülməkdədir ki, İsmayıl bəy Qaspıralı dil sahəsində təsfiyyəçilik cərəyanının babalarındandır.

---

[1] *“Tonquc”*, “Ön söz”, Aqməscid Sipirio Daş basmaxanası, qanuni-sani (ocak), 1881.
[2] “Kak pojivaeş?” rusca: “Necəsən? Yaxşısanmı?” deməkdir.
[3] *“Şəfəq”*, “Lətaif”, Ünsizadələr mətbəəsi, Tiflis, 9 avqust, 1881.

Qaspıralının ideyalarından birisi də, türk qadınına hürriyyət və kişilərlə bərabərlik təmin etmək gərəkliliyidir. Bu ideyasını da israrla və davamla gerçəkləşdirmək istəyir. Onun gözündə millətin anaları, millətin birinci təhsil verənləri qadınlardır; qadınlar həyatı anlamayacaq olursa, uşaqlarını həyat qabiliyyətli olaraq yetişdirə bilməzlər. Millətin yarısı qadınlardır, onlar həyat və fəaliyyətdən uzaq qalırlarsa, millətin həyat və fəaliyyəti də yarımçıq qalır. Qadın məsələsinə dair İsmayıl bəyin gözəl bir əsəri vardır: *"Qadınlar ölkəsi"*.

Bütün türkləri Batı metodları ilə tərbiyələndirmək və aydınlatmaq, Batı həyat tərzinə qataraq yabançı kəlmələrdən mümkün olduğu qədər təmizlənmiş ümumi bir türk elm və ədəbiyyat dilini inkişaf etdirərək qadınları ümumi həyata cəlb edərək bütün türklüyün irəliləməsi və yetkinləşməsi çarələrini düşünən İsmayıl bəyin beynində və qələmində xaricdən gələn əkslərin də təsiri ilə digər bəzi məsələlər, xüsusən müsəlman türklərin həyatında çox dərin təsiri qəti olan din məsələsi önəmli bir mövzu təşkil edir. İsmayıl bəyin islama baxışı, milli həyata fayda verəcəyi nöqtəsindədir. XIX yüzilin sonlarına doğru Doğu islamının müəyyən yerlərində özünü göstərən yenilikçilərin davalarını məqsədinə uyğun bilir. İslam, Batı mədəniyyətinin meydana gətiricilərindəndir; İslam, Batı mədəniyyətinin bəzi şərtlər dairəsində qəbuluna əngəl olmaz. İslam, qadınların azadlıq və bərabərliyinə, həyatda kişilərlə əl-ələ çalışmalarına təşviq edicidir. İslam, müsəlman qövmlərin məzhəb ayrılıqlarını rədd edir... kimi əsasları mənimsəyər; və "Vakte-səadət"ə dönüş iddiası ilə ortaya çıxan bu "Yeni islamlıq"ı (Neo-islamizme) millətdaşları arasında yaymağa çalışır. Bu yoldakı çalışmanın ən mükəmməl nümunəsi "Darür-rahat müsəlmanları" adlı gözəl hekayəsidir.

İsmayıl bəy getdikcə inkişaf edən və yetkinləşən fikirlərini yaymaq üçün yalnız yazı vasitəsi ilə kifayətlənmirdi; hər il türk dünyasının bir tərəfinə səyahət edərək, Osmanlı ölkəsini, Qafqaz, Türküstan, Kazan, Kasım və Litvadakı türk-tatarların əmirləri, aristokratları, alimləri, zənginləri və fəqirləri ilə həyatın türk dünyasına qoyduğu məsələlər haqqında fikir mübadiləsi aparırdı və Çindən Almaniyaya, Quzey Buz Dənizindən Afrikaya və Hind Okeanına qədər türk və islam aləminin aydınları ilə eyni məsələlər barəsində yazışırdı.

Rusiyada 1905-ci il inqilabı baş verib düşüncə və mətbuat xeyli hürriyyətə qovuşduğu zaman, İsmayıl bəy Qaspıralı bütün türk millətinin, böyük millətlər arasında görülən həyat qovğasında Zərdabinin sözləri ilə "Məğlub, məqhur (yenilmiş) və nabud (yox olma)" olmaması üçün tapdığı çarələrin əsaslarını bir prinsip halında "Tərcüman"ın başına əlavə etdi: "Dildə, fikirdə, işdə birlik!"

1905-ci ildən sonra bu prinsip, bir şüar halında ifadə edə bildiyi bu üç böyük əsasın ünsürlərini inkişaf və tətbiqlə İsmayıl bəy, yuxarıda göstərdiyimiz kimi, 20-25 ildən bəri, israr və təqib ilə çalışıb dururdu. Bütün türklərin dildə, fikirdə və işdə birliyini təmin etmək üçün, oyanış və aydınlatmadan başqa, türk balalarına məxsus ilk və ikinci dərəcəli məktəbləri bu məqsədlərə görə

düzənləməyə çalışmışdı. Tövsiyyə etdiyi proqrama görə, "Üsuli-cədid", yəni Avropa tərzində düzənlənmiş ibtidai məktəblərdə təlim məhəlli ləhcələrlə olacaqdı; ancaq üç il qədər ibtidai məktəbdə oxuyanlar, mütləq "ədəbi dil" dediyi "ümumi türk dilini" öyrənəcəklər və *dördüncü ildən başlayaraq təlim artıq o ümumi türk dili ilə aparılacaqdı.*

İsmayıl bəyin "ədəbi dil" və ya "ümumi türk dili" deyimi ilə ifadə etmək istədiyi dil, çox sadələşdirilmiş İstanbul türkcəsidir. Məktəblərdə dil birliyi ilə bərabər, eyni qayəylə, "fikir və iş birliyi" də öyrəniləcək və aşılanacaqdı. Qaspıralının ümid və əməlinə görə, quzey və Doğu türklüyündə bir tərəfdən məktəblər, digər tərəfdən mətbuat, üçüncü tərəfdən xeyriyyə, elm və ədəbiyyat dərnəkləri ilə milli yardımlaşma qurumları sayəsində "dildə, fikirdə, işdə birlik!" idealı gerçəkləşə biləcəkdi...

İsmayıl bəy Qaspıralının millət xidmətinə başlar-başlamaz ortaya atdığı "batılılaşmaq", sonra elan etdiyi "islamı çağdaş bir şəkildə anlamaq" şüarları ilə həyatının sonlarına doğru ifadəsinə imkan tapdığı "dildə, fikirdə, işdə birlik!" prinsipi, bütün türkçülük hərəkatının, dil, ədəbiyyat, sosiologiya, hətta siyasət sahələrində indiyə qədər irəli sürdüyü əsasların hamısını birləşdirməkdə və özündə ehtiva etməkdədir –sanıram. Sonradan gələn türkçülər və bütün türkçülər, bu əsasları incələyəcək, açıqlayacaq, qüvvətləndirəcək və tətbiq edəcəkdir. Buna görə 15 il qədər əvvəl türklük haqqında yazdığım bir məqalədə dediklərimi, burada da eyni ilə təkrar edəcəyəm: "Zənnimcə, bütün türklük ideologiyasını ilk öncə meydana çıxaran, əski Krım xanlarının bu gün tərk edilmiş və unudulmuş, sanki dünyadan ayrı və uzaq kimi yaşayan kiçik başkəndlərində həftədə bir dəfə yayımlanan kiçik bir qəzet olmuşdur. Otuz il öncə Baxçasarayda çıxmağa başlayan bu kiçik qəzet **"**Tərcüman"dır. "Tərcüman"ın yazar və yayıncısı isə Krım miRızalarından Qaspıralı İsmayıl bəydir. İsmayıl bəy bütün türk aləmini göz önündə tutaraq ona görə çalışdı. "Tərcüman"a görə Kazan tatarı, Orta Asiya sartları, tarançılar filan yoxdur; bir dinə inanan, bir dildə danışan türklər vardır..."[1]

15 il əskimiş bu hökmə indi yalnız bir qeyd artırmaq istəyirəm: İsmayıl bəydən öncə bütün türklük qayəsini bir sistem halında gerçəkdən tətbiq etməyə, nəzəri cəhətdən sistemləşdirməyə çalışan heç bir kimsə olmadığını təkrar etməklə bərabər, bu qayəni, ara-sıra, uzaqdan görən kimi olanların varlığına inandım ki, onlar da yuxarıda adını çəkdiyimiz Vefiq Paşa, Şeyx Süleyman Əfəndi, Mustafa Cəlaləddin Paşa kimi Batı türklüyü içində çalışmış bəzi adamlardır. Ancaq bunların heç biri Krımlı İsmayıl bəy kimi bu fikri açıqlıqla, davamla və israrla təqib, tətbiq etməyə çalışmamışlar.

---

[1]Akçuraoğlu Yusuf, "Türklük", Bu məqalə əvvəlcə 1328-ci ildə "Salnameyi-Sərvəti-fünun"da sonra 1329-cu ildə "Türk yurdu"nun hədiyyəsi olaraq çıxan "Altun Ərmağan" 2-də yayımlanmışdır.

*Qısası, İsmayıl bəy Qaspıralını mən "Bütün Türkçülük" axımının mərkəzi siması saymanın doğru olduğuna inanıram.*[1]

[1] İsmayıl bəy Qaspıralı. 1914-cü il, sentyabrın 11-i günü, sabah saat yeddidə Baxçasarayda "Tərcüman" mətbəəsinə bitişik evində 63 yaş yarımında ikən ağciyər vərəmindən öldü.

## KAZAN TÜRKLƏRİNDƏ İLK MİLLİYYƏTÇİLİK SƏSİ: ŞƏHABƏDDİN MƏRCANİ

Krımlı İsmayıl bəyin bütün türk aləmində təsirli olmasından dolayı, Krım türkləri kimi Quzey və Doğu türkləri də onu özlərindən sayırlar. İsmayıl bəyin Azərbaycan türklüyü ilə də ilgisi böyükdür. İstanbul türkləri, 1904-cü il tarixlərində "Tərcüman" qəzetini adətən əldən-ələ keçərək oxuyurdular. Əbdülhəmid hökuməti "Tərcüman" qəzetinin sərbəstcə Osmanlı ölkəsi sərhədlərindən keçməsinə əksərən izin verməmişdir. Bununla bərabər, "Molla Abbas Fransəvinin Firəngistan səyahətnaməsi"ni ki sonra "Darür-rahət müsəlmanları" adı ilə nəşr olunmuşdur, hələ Qoca Mustafa Əsgəri Rüşdiyyəsində ikən (1888) oxuduğumu xatırlayıram. Qısası, "Tərcüman" qəzeti və belə demək mümkünsə, "Tərcüman" ədəbiyyatı, son zamanlarda türk dünyasına ən çox yayılan nəşrdir. Bu qədər ki, başda "Tərcüman" fikirlərinə ən çox ilgi göstərənlər xüsusən Quzey və Doğu türkləri olmuşdur.

Bir müddətdən bəri davam edən dini islahat cərəyanı ilə rus kültürünün bəlkə də "Tərcüman" fikirlərinin təsiri altında 1885-ci illərə doğru Kazan türklüyünün mərkəzi olan Kazan şəhərində milliyyət fikrinin tarix və etnoqrafiya sahəsində göründüyünə şahid oluruq. O zamana qədər özlərini sırf müsəlman sayan və şüursuz bir şəkildə dillərinə "türk dili" deyən kazanlılar içində yenilikçi elm adamlarından Şəhabəddin Mərcani, tarixi əsərlərindən birisini, "Kitabu-Müstəfadil-əxbar fi Ahval-i Kazan" adlı Kazan tarixini Kazan türkcəsi ilə yazır və o əsərində ilk dəfə kazanlı müsəlmanlara dindən başqa bir də milliyyətin varlığını acı bir dillə, sərt və açıq ifadələrlə xatırladır və elan edir. "Mustafadül-əxbar"ın bu barədəki məşhur cümlələri bunlardır: "Bəziləri tatar olmağı əskiklik sayıb o ismdən nifrət edib "biz tatar deyil, müsəlmanıq!" deyə qovğa və mücadilə edirlər... Ey miskin! Deyək ki, sənin müsəlmandan başqa bir adını dinin və millətin düşmənləri bilməsəydi, əlbəttə, səni "müsəlman" deyə ayırd edərdi. Tatar olmasan, ərəb və tacik və noğay deyil, hatay və rus və fransız, prussiyalı və alman daha deyil, indi kim olursan?"[1]

Şəhabəddin həzrətin millətinə bu hiddətli xitabı, kazanlıların öz tarixlərinə, öz soy və köklərinə dəyər və önəm vermədiklərini tənqid etmək üçündür: "...Tarix elminin böyüklüyü və insanların yaşayışına ilgilərinin azlığından qismətsiz və verimsiz olub, heç bir zaman olayların baş verməsini, macəralarını bəyan və zəbt edilməyərək cahan alimləri, hökmdarlar və böyük hakimlər kimi babalarımız, atalarımız və xalqımız tərəfindən bilinməyərək büsbütün bilinməzlik örtüyü altında qalmış, hətta qövmümüzün əksəriyyəti, əzəldən bəri bu yolda Rusiya hökumətinin idarəsi altında yaşayırıq -zənnindədir və Bolqar və Kazan əhvalından "Şəhri-Bolqar övliyaları" və ya "Əzizlər qəbri" və "Xan məscidi" və bir şeyi köhnəlikdə mübaliğə məqamında "Hao Xan zamanındakı iş" deməkdən başqa heç bir şey bilmirlər və bu sözün anlamını belə sağlam təsəvvür

---

[1] Şəhabəddin İbni Bəhaəddin Mərcani, *Əl qismül əvvəl, min kitabi "Mustafadil əxbar fi əhvali Kazan və Bulqar"*, Kazan Dövlət Mətbəəsi, 1885, s. 6

və dərk edə bilmirlər. Öz qəbilələrindən nə qədər şöhrətli hökmdarların gəlib keçdiyi haqqında bilgiləri yox[1]"

İstər yuxarıdakı xitab, istərsə də bu müşahidə yazarın milli şüur sahibi olduğunu açıq göstərməkdədir. Tuna bolqarlarının ilk milliyyətçi tarixçilərindən Paisi də 1762-ci ildə yazdığı "Slav bolqar tarixi" adlı əsərində bolqarları kəndi milliyyətlərinin adını tələffüz etməkdən çəkindikləri üçün çox acı sözlərlə qınayır və onlara "Ey ağılsızlar! Nə üçün öz milliyyətinizdən çəkinir, nə üçün bolqar deyə adlandırılmanızdan utanır və rumların hiyləgər siyasətlərinə tabe olursunuz?" -deyə xitab edirdi.[2]

"Əhvali-Kazan" və "Bolqar tarixi" yazarı ilə "Slavyan və bolqar tarixi" yazarının yüz ilə yaxın bir müddətdən sonra, ancaq eyni sözlərlə xitab edərək millətlərinə milli şüur və duyğu aşılamağa çalışmaları yalnız təsadüfdürmü? Yoxsa, Şəhab həzrət, rusca vasitəsi ilə Paisinin əsərini oxumuşdurmu? Bu məsələni Şəhab həzrətin həyatı və əsərləri üzərində dərin araşdırmalar aparan kazanlı gənc alimlər həll etsinlər.

Şəhab həzrətin tarixi və müəyyən dərəcəyə qədər siyasi milliyyətçiliyi, bütün türklük fikrinə qədər yüksəlməmişdir: həzrətin Quzey türklərindən kazanlıları çox açıq və qəti olaraq "tatar" deyə adlandırması bunun açıq bir əlaməti sayıla bilər.[3]

Şəhab həzrətin milliyyətçilik baxımından türk dil və ədəbiyyatı ilə ciddi olaraq məşğul olduğu da iddia edilə bilməz. Baxmayaraq ki, həzrətin şəxsi söhbətlərində "söz arasına rusca qarışdırmaqdan çəkinmək, mümkün olduğu qədər ana dilini qorumağa çalışmaq" tövsiyyələrini irəli sürdüyünü, Şəhri Şərəf Əfəndi nəql edir,[4] və bu deyilənlərin doğruluğuna şübhələnməli heç bir səbəb yoxdur. Quzey alimləri və mütəfəkkirləri, xalqın rus assimilyasiyasından qorunması üçün daima bu görüşü müdafiə etmişlər. Ancaq ruscaya qarşı müstəqilliyini qorumaq istədiyi Quzey türkcəsinin Doğu dillərinə, ərəbcə və əcəmcəyə qarşı müstəqilliyini müdafiə etmək meyli Mərcaninin yazılarından çıxarıla bilməz. "Türkcə" deyə yazdığı əsərləri, məsələn, indi gözümün qabağında olan "Mustəfadül əxbar"ı ərəb və əcəm kəlmələri ilə başdan-başa doludur. Şəhabəddin Mərcaninin üslubu, bəlkə Buxarada çox qalmış olmasındandır; Cığatay ləhcəsini andırır. Türkcəyə etinasızlığı zamanında bəzi tənqidçilərin, xüsusən Quzey türkcəsini elm və ədəbiyyat dilinə çevirməyə çox çalışan Qəyyum Nasirinin haqlı tənqidinə məruz qalmışdır.

Bununla bərabər, o zamana qədər bütün islam aləmində qüvvətli bir ənənə olan elmi və ciddi əsərləri ərəbcə yazmaq qaydasını qıraraq "Mustafadül-əxbar"ı türkcə yazmış olması və dostlarından

---

[1] Eyni yerdə.

[2] "Bulğarıstanda turançılıq fikri" (Bulğarıstandan məktub) "Türk yurdu", il XV, sayı 16, s. 450.

[3] Şəhabəddin Mərcaninin əsərlərini şəxsən incələmədim. Bu hökmlərim, rəvayət halındakı məlumatlara və həzrətin anadan olmasının 100-cü ildönümü münasibəti ilə Kazanda hazırlanmış və nəşr olunmuş "Mərcani" adlı kitabın içindəkilərə görədir. Bir yazı heyəti tərəfindən hazırlanan və Saleh Abdullin tərəfindən yayınlanan "Mərcani", 1333-də (1917) Kazanda Maarif Mətbəəsində basılmış, 639 səhifəlik ciddi və dəyərli bir əsərdir.

[4] Şəhabəddin Mərcani, s. 126-127.

Kısxanoğlu Hüseyn Əfəndinin tatarca qramerə aid əsərinə çox önəm verməsi, Mərcaninin milli dilin qiymətini qavramış olduğunu göstərir.

Şəhab həzrət, o zamanlar, "Rus tatar Darülmüəllimin" müdiri kimi Kazanda yaşayan məşhur şərqşünas Radlovun dostu və Darülmüəllimində ilahiyyat müəllimi idi. Radlov vasitəsi ilə rus tarixi, qədimiyyat (əski çağlar tarixi) və qövmiyyət (etnoqrafiya) alimləri ilə tanış oldu. Radlovun türk tatar dil və ləhcələri haqqındakı araşdırma və incələmələrindən xəbərdar olmaması mümkün deyildi. Həzrətin Avropa alimi ilə təmasından görüş dairəsini genişlətmiş, çalışma tərzini kamilləşdirmiş olmasına hökm etmək xəta olmaz.

Milliyyətçilk şüurunun Quzey türklüyü içində meydana gəlməsinə "Tərcüman" qəzetindən sonra ilk xidmət edən əsərin "Mustəfadül-əxbar" və ilk xidmət edən böyük adamın Şəhabəddin Mərcani olduğu üzərində bütün qənaətlər birləşməkdədir. Şəhabəddin Mərcaninin millətdaşlarına acı-acı xitabı çöldə bir nida kimi qeyb olub getmədi; şagirdləri ustadın yalnız dini sahədə yenilik fikirlərini deyil, tarixə dayanan milliyyətçiliyini də davam etdirdilər və inkişaf etdirdilər. Bu şəkildə Quzey türklüyündə XIX yüzilin son rübündən etibarən milliyyətçilik, türklük fikir və hərəkatları başlanmış oldu.

**Türklük şöbələri arasında ilişkilər**

İlk əvvəl İstanbulda Batı türkləri arasında görülən türkçülük və bütün türkçülük fikirlərinin bir qədər sonra Qafqaziyada Azərbaycan türkləri içində, daha sonra Krım türkləri, nəhayət Quzey türklərindən Kazanlılar arasında da meydana çıxdığını gördük. Azərbaycanda ilk milliyyətçilərdən saydığımız Axundzadə ilə Məlikzadənin İstanbulla bağ və əlaqələri çox deyildirsə də, bütün türklük görüşünü söz, fikir və işləri ilə qurmağa çalışmış olan Krımlı İsmayıl bəyin İstanbuldan xeyli təsirləndiyinə şübhə yoxdur. Başda panslavist Katkovların təsiri ilə milli hiss və şüuru duymağa başlayan Qaspıralı, sonralar Süleyman Paşaların, Şəmsəddin Sami bəylərin təlqinləri altında bu hiss və şüurunu inkişaf etdirmiş və kamilləşdirmişdir. Kazanlı Şəhab həzrət, Həcc ziyarəti səbəbi ilə 1881-ci ildə İstanbulda olaraq Cövdət və Münif Paşalar kimi alim vəzirlərlə görüşmüşdür.[1] "Tərcüman" qəzetini nəşr olunduğu gündən etibarən müntəzəm oxuyurdu: İstanbulun vəziyyətinə və düşüncələrinə, "Tərcüman"ın məqsəd və əməllərinə vaqif idi. Qısası, türk millətçiliyi Batı (Osmanlı) türkləri arasında ikinci dəfə fəaliyyət göstərdiyi zamanlar Qafqaziya, Krım və Kazan türkləri içində də türkçülük fikirlərinin meydana çıxması, məncə bir təsadüfün nəticəsi deyildir. Batı türklüyündə ortaya çıxan fəaliyyətləri ilə Türk-rus savaşının və ondan öncə gələrək, Rusiyada

[1] Abbas və Y. Akçura, "Kazan alimlərindən Mərcani Əfəndi", "Məlumat", 1312, (1897), c. III, sayı 69, s. 421. İlk nəşr olunmuş məqaləmdir (A. Y.). Eyni məqalə, "Mərcani", s. 422, 424.

türklük və müsəlmanlıq əleyhinə bir çox mətbuat orqanını doğuran Girit, Serb, Bolqar inqilablarının bu hadisədə təsiri olduğunu sananlardanam.

Batı türklüyünün milliyyət fikrinin inkişafında Azərbaycan, Krım və Kazan türklüyünə təsiri olduğu kimi, sonraları Azərbaycan, Krım, Kazan türklüyünün bu sahədə adını çəkdiyimiz çalışması da Batı türklüyünə təsir etmişdir. Yəni türk aləminin inkişaf etmiş qismində fikir mübadiləsi ola-ola, türklük və bütün türklük fikir axımı genişlənmiş və dərinləşmişdir.

Azərbaycanlı Axundzadə yeni əlifbasını və komediyalarını İstanbula gətirib o zamanın siyasət və elm böyüklərinə təqdim etmişdir. Krımlı İsmayıl bəy “Tərcüman”ın İstanbulda yayımlanması üçün davamlı çalışmışdır. Qısası, türklüyün müxtəlif şöbələri arasında fikri yaxınlıq vardı və bu yaxınlıq yaxın zamanlara qədər kəsilmədi.

**TÜRKÇÜLÜYÜN ÜÇÜNCÜ FƏAL DÖVRƏSİ**

1877-ci il Türk-rus müharibəsi dövründə, ondan əvvəlki və ondan sonrakı illərdə, yuxarıda göstərdiyimiz səbəblərə görə, Osmanlı ölkəsində hürriyyət havası əsmişdi. Fikri fəaliyyətlərə əlverişli siyasi və idari şərtlər meydana gəlmişdi. Ancaq bu əlverişli şərtlər uzun müddət davam etmədi; 1879-cu ildən başlayan irtica, getdikcə şiddətlənmək üzrə 1908-ci ilə qədər davam etdi. Hər cür fikri çalışmanın açıqca ortaya çıxmasına əngəl olan despotik və qanunsuz idarə ancaq 1897-1898-ci illərdə bir az xəfifləyən kimi oldu. Türk-Yunan savaşı (1897) dövründə Osmanlı sosial həyatı, xüsusən İstanbul aydınları daha artıq həyat və hərəkət əlaməti göstərdilər. Bununla bərabər, səksəninci və doxsanıncı illərdə heç bir fikir hərəkatı olmadığını iddia etmək mübaliğə olardı. Rus savaşı sonrası ilə Yunan savaşı öncəsi arasında türk milliyyətçiliyi fikri, Osmanlı məmləkətində heç işlənməmişdir- deyə bilmərik. Şəmsəddin Sami bəy, Nəcib Asim bəy, Vələd Çələbi Əfəndi, Bursalı Tahir bəy, Raif Paşazadə, Məhməd Fuad bəy, Əhməd Hikmət bəy, şair Əmin bəy, Tunalı Hilmi bəy, "İqdam" sahibi Əhməd Cevdət bəy, Əmrullah Əfəndi, Nəcib bəy kimi türkçülüyün üçüncü fəal dövründə, yəni 1897-1900 tarixlərində özlərinə və məsləklərinə diqqət çəkiləcək möhtərəm türkçülər bu arada hazırlanmışlar və bir miqdar əsər nəşr olunmasında da başarılı olmuşdular.

**Şəmsəddin Sami bəy**

Fraşerli Şəmsəddin Sami bəy, əslən arnavuddur. Fraşer, əski Yanya vilayətinin Ergiri sancağına tabe Pərmədi qəzasında nahiyyə mərkəzi olan bir kənddir. Əsasən, Bəratdan gəlmiş olan Fraşer bəyləri daima Osmanlı səltənəti xidmətində olar və Sami bəyin "Qamusül-aləm"də dediyinə görə,[1] qonaqlarında xüsusi xocalar tutub, övladlarına mükəmməl şəkildə ərəbcə və farsca oxudurdular; yəni bu bəylərdə elmə dəyər vermək ənənəsi var idi. XIX yüzilin son sülsü (üçdə birlik zamanı) başlarında bu ailədən arnavud milliyyətçiliyinə xidmət edən, latın hərfləri ilə arnavudcaya xas əlifba düzəldən arnavudçular (Fraşerli Əbdül bəy) çıxdığı kimi Vəfiq Paşanın "Ləhceyi-Osmani"sini inkişaf etdirərək "Qamusi-türki"ni yazan ən əski türklərlə Batı türklərini tanış etmək üçün Vamberinin nəqlinə görə "Qutadqu-bilik" əsərini və Radlovun nəqlinə görə "Orxon abidələri"ni Batı türkcəsinə çevirən türk ululları üzərinə diqqət çəkəcək şəkildə "Qamusül-aləm"i yazan, qısası, dil və tarix sahələrində türk milliyyətçiliyinə böyük xidmətlər edən Şəmsəddin Sami bəy mərhum da bu ailədən yetişmişdir.[2]

---

[1] "Qamusül-aləm", "Fraşer" kəlməsi, c.V, s.3352

[2] Oğlu Əli Sami bəydən aldığım əsaslı bilgiyə başqa tərəflərdən eşitdiklərimi əlavə edərək Şəmsəddin Sami bəy mərhumun qısa bioqrafiyasını nəzərinizə çatdırıram: Şəmsəddin bəy bir həziran (iyun) 1850-ci ildə Fraşer qəsəbəsində doğuldu. Atası Xalid bəyin ölümündən sonra Yanyaya gedərək, öncə oranın mədrəsəsində, sonra Rum (Zosimeos) gimnaziyasında oxudu və 1871-ci ildə gimnaziya təhsilini tamamlayaraq diplom aldı. 1872-ci ildə İstanbula gəldi və

“Qamusi-Fransəvi”, “Qamusi-türki”, “Qamusül-aləm” kimi çox gərəkli və çox faydalı əsərləri davamlı əlimizdən düşməyərək ona hər an rəhmət və şükran vəsiləsi olan Şəmsəddin Sami bəyin sırf nəslən türk olmamasına görə, türklüyə, türkçülüyə etdiyi böyük xidmətləri heç bir ciddi incələməyə dayanmayan yanlış düşüncələrlə örtməyə çalışılmamalıdır; məncə Fraşerli Şəmsəddin Sami bəy üçüncü dövr türkçülüyünün böyük simalarındandır. Şəmsəddin Sami bəyin türkçülüyünü, hətta bütün türkçülüyünü isbat üçün, digər dəlilləri bir yana buraxaraq, yalnız “Qamusi-türki” ön sözünü göstərmək yetərlidir. [1] Təkrar-təkrar oxunması çox faydalı olan bu “İfadeyi-məram”ı əvvəldən axıra qədər buraya daxil etmək istədim. Məqaləmizdə nəzərdə tutulan ölçüyə, bu dəyərli ön sözün hamısı sığmadığından bəzi nöqtələr üzərində durmaqla kifayətlənəcəyəm. Ümumi olaraq deyilə bilər ki, dildə türkçülük əsaslarından bir çoxu “İfadeyi-məram”da açıqlıq və qətiyyətlə ifadə olunmuşdur. Sırası gəlincə bir tərəfində deyilir ki: “dilimiz türk dilidir, dilə xas lüğət kitabına da başqa ad düşünmək əbəsdir. Dilimizdə işlədilən kəlmələrin hamısı da, hansı dildən alınmış olursa olsun, həqiqətən işlənmək və bilinmək şərti ilə, türkcədən sayılır.” Şəmsəddin Sami bəyə qədər,

---

mətbuat qələminə məmur oldu. Bir il sonra, yəni 1873-cü ildə Şəmsəddin Sami bəy “Hədika” adında bir dərginin baş yazarıdır. Demək Şəmsəddin Sami bəy, 23 yaşında bir dərginin baş yazarı kimi qələmi ələ alaraq mətbuat həyatına atılmışdır. Və ölüncəyə qədər, yəni 31 il o qələmi əlindən atmayacaq, mətbuat həyatından ayrılmayacaqdır. 1874-cü ildə Şəmsəddin bəyi Trablüsqərbdə də “Trablus” adlı türkcə, ərəbcə bir qəzetin sahibi və baş yazarı görürük. 1875-ci ildə isə İstanbulda ilk günlük qəzet olan “Sabah”ı yenə sahibi və baş yazarı olaraq çıxarır. Ancaq fikir və elm adamları, idari və iqtisadi işlərdə əksərən başarı göstərməzlər: Şəmsəddin Sami bəy də “Sabah”ın imtiyazını daha sonra mürəttib Mehran Əfəndiyə satmağa məcbur olur. Və bu erməni mürəttib mürəttibxanadan imtiyaz sahibi yazıxanasına keçir, Şəmsəddin bəy də əski işçisinin maaşlı bir yazarı olur! “Sabah” qəzetində meydana gələn bu qəribə dəyişikliklərdən sonra, məlumatı dəniz kimi geniş və əngin olan Şəmsəddin Sami bəy ölümünə qədər mürəttib Mehran Əfəndinin iqtisadi təzyiqi altında qalmışdır!!!

Şəmsəddin Sami bəyin rəsmi vəzifəsinə gəlincə, 1880-ci ildə Əskəri Təftiş Komisyonuna ikinci katibliyə və bir az sonra baş katibliyə yüksəldilən bu qoca yazar komisyonun baş katibliyi kimi kiçik bir işdə dözümlə xidmət edib durmuşdur.

Şəmsəddin Sami bəyin türk mətbuatında xidmətləri çox çeşidli və genişdir: müxtəlif tarixlərdə qəzet və dərgiyə baş yazarlıq etdikdən başqa, “Cib kitabxanası” adı ilə qurduğu seriyaya təbiət elmləri, tarix və yazı üsullarından bəhs edən 14 kitab yetişdirmiş, teatr ilə təlim üsullarına aid dörd kitab yazmış və bir çox seçmə söz və yazı toplamışdır. Unudulmamalıdır ki, bu həcmən kiçik əsərlər, “Qamusül-aləm” kimi, “Qamusi-Fransəvi” kimi, “Qamusi-türki” kimi böyük işlərin hazırlanmasına və tamamlanmasına əngəl olmamışdır. Şəmsəddin Sami bəy, bu şəxsi və ya toplama əsərləri yazmaqla məşğul ikən bir Fransa tarixi ilə beş fransızca roman tərcüməsinə də vaxt tapa bilmişdir. Bu romanlar arasında Hüqonun “Səfillər”i kimi dəyərli və uzun bir əsər də vardır. Sami bəy “Quran”ın tərcüməsinə belə girişmiş, Ancaq Osmanlı hökuməti bu təşəbbüsü qətiyyətlə qadağan etdiyindən tərcümə etdiyi hissələri məhv etməyə məcbur olmuşdur!

Şəmsəddin Sami bəyin yuxarıda göstərilən əsərləri nəşr olunmuşdur. Əsil türkçülük baxımından önəmli olan əsərləri isə hələ nəşr olunmamışdır. Bir an əvvəl basılması hökumətin və milli müəssisələrin himmətindən gözlənilən bu dəyərli əsərlər bunlardır:

1. “Qutadqu bilik” (Vamberinin 1870-ci ildə nəşr etdirdiyi mətnin tərcüməsi və qeydləri).
2. “Orhun abidələri”, (ön söz, mətn, tərcümə və açıqlama).
3. “Ləhceyi-Türkiyeyi Məmaliki-Misir”, (“Kitabül-idrak Lisanül-ətrak” ilə “Ettühfətiz-Zəkiyyə fil lüğətit Türkiyə”dən alınmış.).

Sami bəy mərhumun türkçülüyə aid bu əsərlərindən başqa, nəşr olunmamış doqquz əsərinin də olduğunu, bunlardan dördünün yarımçıq olduğunu oğlu Əli Sami bəyin lütfən verdiyi qeyddən öyrənirik. Bu qeyddə “Qutadqu-bilik” ilə “Orhun abidələri”nin tərcümə edildiyi və açıqlandığı tarix bildirilməmişsə də, belə ümumi bir ifadə vardır: “Şəmsəddin Sami bəy, son illərini əski türkcəni tədqiqə həsr etmişdir. Bu zaman ən çox görüşdüyü və işbirliyi yürütdüyü iki dostu Nəcib Asim bəylə Vələd Çələbi idilər.” “Qamusi-türki”nin də 1901-ci ildə basılmış, yayımlanmış olması, Əli Sami bəyin ifadəsini gücləndirməkdədir.

Şəmsəddin Sami bəy, bu yorulmaz qələm xadimi, 1904-cü ilin 18 iyununda Erenköyündə ölmüşdür. Ruhunun nur içində yatmasını Tanrıdan diləRkən, bizə verdiyi dəyərli məlumatlara görə oğluna təşəkkür etməyi bir vəzifə sayırıq.

[1] Şəmsəddin Sami, “Qamusi-türki”, “İfadeyi-məram”, “İkdam” mətbəəsi, İstanbul, 1317, (1901), s. 1

Osmanlıca deyilən dilin türk dili olduğunu bu qədər açıqlıq və qətiyyətlə ifadə edən bir kimsəni tanımıram.

Sami bəy, türkcə danışılan yerlərin genişliyini və çeşidli türk ləhcələri arasındakı yaxınlığı anladaraq dildə bütün türkçülük ideyasını məqsəd qoyarkən: "Doğu türkcəsi ilə Batı türkcəsi arasındakı fərq, sanıldığı kimi, italyanca ilə latınca, və ya ispanyolca ilə fransızca arasında olan fərq qədər, yəni hər iki türkcədən hər birini digərindən büsbütün ayrı və özbaşına bir dil sayacaq dərəcədə olmayıb, bu fərq ancaq Quzey ilə Güney almanca, və ya Toskana italyancası ilə Napolitan italyancası, yaxud Misir ərəbcəsi ilə Məğrib ərəbcəsi arasındakı fərq dərəcəsindədir; və Doğu türkcəsi ilə Batı türkcəsi tək bir dildir, ikisi də türkcədir" -deyir.

Biz Sami bəyin söz zəncirini qoparmadan və onun ön sözündən çıxardığımız bir sonuc olaraq, son cümləsinə, bu bir neçə kəlməni əlavə edə bilərik: "Və buna görə, Doğu türkləri ilə Batı türkləri bir tək millətdir, ikisi də türkdür." Bir an şübhə etmirəm ki, Sami bəy də belə düşünür. Doğu və Batı türklüyünü bir tanıyaraq "bütün türkçülük" fikrini qəbul edirdi... Bunun üçündür ki, "bizim tərəfimizdən önəm verilməyən və unudulan, Doğu türkcəsində işlədilməkdə olan xalis türkcə kəlmələrin, xüsusən bunlardan gərəkli, dəyərli olanlarının toplanması, bu surətlə bunların bizim türkcəyə də qəbul edilməsi ilə canlandırılmaları, yayılmaları (yəni iki ləhcənin birləşdirilməsi) xüsusuna xidmət etmək başlıca əməlim ikən, mücərrəd qövmiyyət və cinsiyyət (indi olsa milliyyət deyərdi) sevgisini təqdir edərək və gərəkli sayaraq bunları ərəbcə və farsca süslü təbirlərdən üstün tutacaq kişilərin hələ olmaması və əksəriyyətin bu fikrə müxalif olması qismən bu xidmətdən özümü məhrum buraxmağa məni məcbur etmişdir."

**Nəcib Asim bəy**

Osmanlı ölkəsinin bir ucundan, ən batısından İstanbula gəlmiş Şəmsəddin Sami bəy, lüğət və dil sahəsində türkçülüyə çalışarkən, digər ucundan, ən şərqindən gələn və ondan gənc olan Kilisli Nəcib Asim bəyin də dildə türkçülük sahəsində xidmətləri görünməyə başlayır.

Balhasanoğlu Nəcib Asim bəy milli duyğunu ən dərin hiss edən irqi siniflərdən birində, Kilisdə 1861-ci ildə doğulmuşdur. Ailəsinin mənsub olduğu sosial sinif, sipahi bəyliyi, ondakı milli duyğunu əcdadının ənənələri ilə qüvvətləndirmişdi. İlk edadi təhsilinə Şamda başladı. Beşinci Ordu Edadisinə girdi; və Şamın o zamanlar belə xüsusi olan "ərəblik" mühiti, gənc Nəcibə təsirdən uzaq qalmadı.[1]

[1] Nəcib Asim bəy, tərcümeyi-halından bəhs edən, mənə yazdığı xüsusi məktubunda da bu təsirlərə dair bir-iki hadisə göstərir: "Ərəblər, türkləri məmləkətdə yabançı kimi görürdülər. Hətta qır qəhvələrində ərəbcə bilənlər beş paraya, bilməyənlər on paraya qəhvə içərdilər. Ərəb xocalarımdan zülm gördüm." Ərəblərə olan hiddətini, sonradan "Məktəb" dərgisində yazdığı bir məqalədə qismən göstərə bilmişdir.

Nəcib Asim bəy bir türk sipahzadəsinə layiq təhsil və tərbiyəni əsgəri məktəblərdən alıb, piyada mülazimi oldu; ancaq əsgəri biliklərlə kifayətlənməyərək, hələ Kilisdə ikən şəxsi müəllimlərdən dərs almağa başlamış və İstanbula gəlib, Kuleli Əsgəri Edadisiylə hərbiyyə məktəbinə davam edərkən, xüsusi dərslərini də buraxmamışdır. Nəcib Asim bəy hələ edadi təhsili ilə məşğul olduğu zamanlar belə, kitabət və ədəbiyyat dərslərində türkçülüyə meyl göstərirdi: özünün anlatdığına görə, kitabət xocalarının türk ədəbiyyatına nümunə olaraq göstərdikləri və tövsiyyə etdikləri Telemaq tərcüməsi və "Rümuzül hikəm" kimi ərəb və əcəmcəsi türkcəsindən daha artıq qafiyəli əsərlərdən xoşlanmazdı; saf türkcə yazmağa çalışırdı.

Nəcib bəy, Kuleli Edadisi öyrəncisi ikən, yəni 1878-ci il tarixlərində Əhməd Midhət Əfəndi ilə tanış olaraq ondan faydalanmaya başlamışdır. Hərbiyyə məktəbinin son siniflərindən etibarən Midhət Əfəndinin qəzeti olan "Tərcümani-həqiqət"ə fənni məqalələr yazırdı.
Nəcib Asim bəy türk kəlməsini ilk dəfə özünün "terk" kimi yazmayıb "vav"la "türk" yazdığını söyləyir: "Tarixlərimizdə etraki-biidrak" yazıldığını gördüyümdən və Osmanlılardan bir çoxunun türkü təhqir etdiklərinə şahid olduğumdan "türk"ü vavla yazdım. -Niyə belə yazırsan? -deyənlərə: -"'Etraki-biidrak' yazılmasın!" deyə cavab verdim. Və Babiali caddəsində adım "Vavlı türk" oldu...[1]
Nəcib Asim bəy, 1897-ci illərdə hər cümə günü Əhməd Midhət Əfəndinin Bəykozdakı mülkünə gedərdi.[2] Sonradan türkçülük hərəkatında ayrılmaz yoldaşı olan Vələd Çələbi ilə Mithəd Əfəndinin yalısında tanış oldu. Nəcib Asim bəy, Mithəd Əfəndini də, Vələd Çələbi Əfəndini də özünün "türkçü etdiyinə" inanır.[3] Qəti olan budur: Nəcib Asim bəy ilə Vələd Çələbi, bu iki "Vav"lı türklər, Əbdülhəmid dövrünün ən tanınmış türkçüləri idilər.

1893-cü il tarixində Əhməd Cövdət bəy, İstanbulda "İqdam" qəzetini çıxarmaya başlamışdı. "İqdam" başlığına: "türk qəzetidir" deyə yazan ilk türkcə qəzetdir. Zatən "İqdam"ın türkçülüyü, ilk nüsxələrindən gözə çarpır: 22 il öncə yazdığım "Üç tərzi-siyasət"də "İqdam"ın türkçülük orqanı olduğunu qeyd və təsbit etmişdim; Əhməd Cövdət bəy, qəzetinin yazı heyətinə Nəcib Asim bəy, Vələd Çələbi və Əmrullah Əfəndiləri almışdı. Milliyyətini açıqdan-açığa elan etməkdən çəkinməyən bu türk qəzetində Nəcib Asim bəy, yoldaşı Vələd Çələbinin dediyi kimi: "ortaq mövzular ilə elmi mövzulu kitablar və lüğət fəlsəfəsi və sair gerçəkliyi məlum olan mövzularda yazılar yazmış"[4] və yazarlığına "bəhsə qadir olduğu məsələləri o fənnin mütəxəssislərinə gerçəkdən bəyəndirmək surəti ilə başlamış, get-gedə çalışmasının məhsulları artaraq islam fazilləri və Avropa şərqşünasları arasında bu günkü sahib olduğu dərəcəyə" çatmışdır. Həqiqətən, Nəcib Asim bəy,

---

[1] Haqqında bəhs etdiyimiz şəxsi məktubdan, Vələd Çələbi Əfəndi isə nəşr olunmamış bir əsərində "Türk" kəlməsini ilk öncə "vav"la onun yazdığını, Nəcib bəyin onu təqib etdiyini irəli sürür.
[2] "O tarixdə Əfəndi mərhumun mülkünə mənim kimi onsuz darıxanlar çox gəlirdilər, məclisə şənlik gətirirdilər." Nəcib Asim, "Vələd Çələbi həzrətləri", "Türk yurdu", c.VII, s.2471.
[3] Özəl məktublarından.
[4] Nəcib Asim bəy "İqdam" qəzetindən öncə "Maarif" dərgisində dil elminə dair məqalələr yazdığı kimi, bir aralıq "Mədrəsətül-ədəb" adlı bir dərgi də çıxarmışdır.

1890–cı illərdə Avropa tərəfindən tanınmışdı; bir rus şərqşünası Nəcib bəydən bəhs edərkən deyir ki: "Nəcib Asimin adı Avropa ədəbiyyatında məchul deyildir. Türkiyədə yeni tapılan yazıları, yaxud Osmanlıcanın Anadolu ləhcələrindən birini tərif edən yolda yazılmış məqalələri *"Keleti Szemle"* dərgisində nəşr olunmaqdadır.[1] Nəcib Asim bəy uzun müddət, həmvətənləri ilə Avropa elm aləmi arasında əlaqəni təmin edən yeganə Osmanlı alimi idi.[2] Peştenin "Keleti Szemle"sindən başqa Parisin *"Journal Asiatique"*ində də Nəcib Asim bəyin bəzi məqalələri yayımlanmışdır.[3] Hətta bu dərgini çıxaran fransızların "Asiya cəmiyyəti" (La sosiete Asiatique) bir türk alimini 1895-ci ildə üzvləri arasına seçmiş və qəbul etmişdir.

Balhasanoğlu Nəcib Asim bəy, bir tərəfdən elmi incələmələrlə məşğul olub incələmələrinin nəticələrini Osmanlı ölkəsində və Avropada nəşr etməyə çalışarkən, digər tərəfdən hərbi məktəblərdə təlim və təhsil yolu ilə əsgəri vəzifəsini yerinə yetirməkdən də uzaq qalmamış və nəhayət, Osmanlı ordusunda miralay rütbəsini əldə etmiş, Məşrutiyyətin elanından sonra İstanbul Universtitetinin "Türk dili tarixi" kafedrasına müdərris təyin olunmuşdur. Son seçimdə (1927) Türkiyə Böyük Millət Məclisinə üzv seçilmişdir. Nəcib Asim bəyin fənnə, əsgərliyə, tarixə və dilə aid iyirmidən artıq nəşr olunmamış əsəri vardır. Türkçülük baxımından ən dəyərli əsərləri "Ural və Altay lisanları", "Ən əski türk yazısı", "Orhun abidələri" və "Türk tarixi"dir.[4] "Türk tarixi" haqqında özü deyir ki: "Leon Cahunun tarixini[5]" genişlədərək tərcümə etdim. Bunun səbəbi də tarixi bir millət olduğumuzu göstərməkdi."[6]

Nəcib Asim bəyin türkçülüyə xidmətləri, xüsusilə dil və tarix sahəsindədir; və Nəcib Asim bəydir ki, ilk öncə türklərin dil və tarix sahəsində Avropa metodları ilə çalışmaqda olduqlarını Avropaya tanıtmışdır.

Bütün türklər arasında, əski türk dilinə, əski türk əlifbasına, müstəqil türk tarixinə türklərin diqqətini açıq bir şəkildə ilk çəkən türkün Nəcib Asim bəy olduğunu iddia edə bilərik.

Nəcib Asim bəy, türklüyə aid bir neçə önəmli əsərin *"İqdam"* sahibi tərəfindən basıldığına işarə edərək, keçmiş mədəniyyətimizin canlanmasına ciddi bir xidmət etmişdir; bu doğrultuda Əlişir

---

[1] Nəcib Asim bəy, "Keleti Szemle"də Kilis, Bosniya və Ərzurum ləhcələri haqqındakı incələmələri ilə "Hibət-ül həqayiq"i yayımlanmışdır. Və öz dediyinə görə, Avropa dərgilərində fransızca yayım yapmasından əsil məqsədi, türklərin də bu kimi işlərlə məşğul olduqlarını avropalılara göstərməkdi.

[2] V.Qordlevski, "İstanbuldakı "Türk dərnəyi" haqqında qeydlər", Moskva. 1912, s. 2

[3] "Journal Asiatique"də Nəcib Asim bəy, türk milli əruzu haqqında "La Versification nationale Turquie" adlı bir məqalə nəşr etdirmişdir. Asim bəydən öncə, milli əruz haqqında misraların sayını göstərərək bölgü məsələsini göz önünə almamışdılar. Bu yönü ilk dəfə Nəcib Asim bəy, "Journal Asiatique"də çıxan yuxarıda göstərilən məqaləsində təyin və təsbit etmişdir. Bu məqalə, Məşrutiyyətdən sonra İstanbulda çıxan fransızca "Bosphore" dərgisində təkrar basılmış və yayımlanmışdır.

[4] Nəcib Asim, "Türk tarixi", yayımlayan Həsən Fərid və Əhməd Şəmsəddin, mətbəəyi-Amirə, İstanbul. 1316 (1900); "Ən əski türk yazısı", "Türk dərnəyi" yayını, Nəcmü-İstikbal mətbəəsi, ikinci basım, İstanbul, 1327 (1911); "Orhun abidələri", Türkiyə Cümhuriyyəti Təhsil Nazirliyi yayınlarından, Mətbəəyi-Amirə, İstanbul, 1341 (1925).

[5] Leon Cahun, "İntroduction a l' Histoire de l' Asie", Armand Colin et Cie Paris, 1896.

[6] Nəcib Asim bəyin şəxsi bir məktubundan

Nəvainin “Mühakimətül-lüğəteyn”ini, kitaba böyük türk şairinin tərcümeyi-halını da əlavə edərək Vələd Çələbi Əfəndi ilə bərabər nəşr etdirmişdir.

“İqdam” qəzeti ilə “Məlumat” dərgisində sırf türkcə məqalələr yazmağa çalışdığı kimi, “conk” (cünk)lərdən toplanma şarkılar və manilər də nəşr etdirdi.

Nəcib Asim bəy Osmanlı dilinin türkcələşməsinə çalışdığı qədər deyilsə belə, Doğu musiqisinin milliləşməsinə də xeyli əmək sərf etmişdir. Osmanlı aydınları arasında mötəbər olan Doğu musiqisinin milli türk musiqisi olmayıb, əsil türk musiqisinin, çoban və xalq havalarından motivlər alınaraq, Batı musiqi texnikası ilə macarların etdiyi kimi, düzənlənməsi gərəkdiyi fikrini ortaya atan da Nəcib Asim bəydir. Zamanın musiqi ustadlarından sayılan Rauf Yəkta bəy, Nəcib Asim bəyin bu fikri əleyhinə şiddətlə çıxmışdı. Bu musiqi mübahisələri Əbdülhəmid dövrünün son illərinə təsadüf edir. Keçən iyirmi, iyirmi beş il bu məsələdə kimin haqlı olduğunu göstərməyə kifayət etdi.

Nəcib Asim bəyin bütün xidmətlərinin məncə ən dəyərlisi, Leon Cahunun “Asiya tarixinə giriş”ini, Doğu qaynaqlarından aldığı məlumatla genişləndirərək tərcümə etmiş olmasıdır, bu kitab, Göyalpın “Türkçülüyün əsasları” adlı əsərində dediyi kimi, “hər tərəfdə türkçülüyə dair meyllər oyandırdı”; türk milliyyətçiliyi hərəkatının inkişafında, önəmli fikri amillərdən oldu.

Osmanlılar və bəlkə bütün türklər içində ilk “Bütün Türk Tarixi” yazarı olmaq şərəfi Nəcib Asim bəyindir.[1]

**Vələd Çələbi**

Türkçülüyün dilçilik elmi və ədəbiyyat sahəsində Nəcib Asim bəydən bir az sonra özünü göstərən Vələd Çələbi Əfəndi, 1868-ci ildə Konyada anadan olmuşdur. Şərqin ən böyük şair, mütəsəvvüf və əxlaqçılarından Mövlana Cəlaləddin Ruminin on səkkizinci göbəkdən oğludur. Konyada ənənəvi mədrəsə təhsili gördü; ancaq bununla kifayətlənmərək kitabxanalardan farsca, türkcə ədəbiyyatı öyrəndi və incələdi. Osmanlı imperatorluğunda vilayətlər soylularının ənənəsinə uyğun olaraq, hökumət məmurluğuna girdi, eyni zamanda ədəbi bilgisindən həmvətənlərini faydalandırmaq arzusu ilə ərəbcə və farscadan tərcümələr edərək vilayət qəzetində nəşr etdirməyə başladı. Bu zaman Məhməd Vələd Əfəndi, tam klassik bir müsəlman-Osmanlı elm və ədəbiyyat maraqlısıdır; ərəbcəyə, ərəb ədəbiyyatına, dini elmlərə çox önəm verir; və bu sahədə bilgisini artırmaq üçün İstanbula, Ərəbistana getmək, hacı olmaq həvəsinə düşür.

Ancaq Çələbinin hələ Konya həyatında diqqətəlayiq bir hadisə var: türkcənin Osmanlıcadan başqa ləhcələrini öyrənmək istəmiş və Cığatayca *“Abuşka”* lüğətini tapıb üzünü köçürmüşdür. Bu

---

[1] Nəcib Asim bəyin 1908-ci il inqilabından sonrakı fəaliyyət və xidmətlərindən irəlidə bəhs edəcəyik. Nəcib Asim bəyin qısa bioqrafiyası, “Türk yurdu”nda nəşr olunmuşdur. “Türk yurdu”, c. II, s. 624-626.

hadisəni Vələd Çələbi Əfəndi şəxsən, hələ nəşr olunmamış bir risaləsində belə hekayə edir: "...Sultan Vələd mədrəsəsində oxuyarkən, "Hüzuri-Pir" kitabxanasında həzrəti Mövlananın *"Divane-kəbir"*ini oxumuşdum. Təbii olaraq, az anlayırdım. Ancaq böyük bir eşq və cazibə ilə davamlı oxuyurdum. Ara-sıra anlaşılmaz bir türkcəylə bir qat daha üzünü köçürənlər tərəfindən pozulmuş bəzi beytlər gördüm. Bunlardan bəziləri də rəng-rəng idi. Məsələn:

Ruzi-nişəstə hava him, yalnız senünün qatında:
Həm min çağır içər min, həm min yetiş bilir min!...[1]

beyti kimi çox xoşuma gələn bu beytlərdən bəhs etdiyim kitabxanaçı Xalid Dədə: "Sultan Vələd həzrətlərinin məsnəviyyatında daha çox türkcə beytlər var"-dedi. Gərək məsnəvilərindəki, istərsə də divanındakı beytləri oxudum və yazdım. Bir də "Xarabat"ı oxuduğum zaman Əmir Əlişir Nəvainin, Sultan Hüseyn Baykaranın və Molla Lütfinin Cığatayca şeirlərini görmüşdüm. O yüksək sənətin bu qaba dillə ifadəsi mənə çox qəribə gəlmişdi. Kitabxanada Nəvai lüğətlərini əhatə edən "Abuşka" kitabını gördüm: üzünü köçürdüm. Bizim dilimizdən başqa türkcənin şöbələri olduğunu öyrəndim."
Vələd Əfəndi 1880-ci ildə İstanbula gələr-gəlməz, Doğuçu və Batıçı aydınların toplantılarına girə bilmişdir; əslində hələ Konyada ikən Müəllim Naci Əfəndi ilə yazışırdı. Bir tərəfdən "Buhari-şərif" öyrənməyə çalışarkən, digər tərəfdən Müəllim Nacinin qayınatası Əhməd Midhət Əfəndinin məclislərində iştirak edirdi. O sıralarda "Mətbuati-daxiliyyə" yazı işləri idarəsinə məmur da olmuşdu.

İstanbul həyatının ilk dövründə Çələbi Əfəndini şeir və mövləvi ədəbiyyatı ilə məşğul görürük. Mövlananın vəsiyyətnaməsini açıqlayaraq "Xeyrül-kəlam" adlı bir əsər yazır, bir "Mövləvi tarixi"ni yazmağa başlayır; "Vələd Bahai" və ya sadəcə "Bahai" imzası ilə mənzumələr, mərsiyələr düzənləyir; qısası hələ Konyada ikən başlayan türk dil elmi marağından doğan ciddi bir əsər meydana çıxarmır. Ancaq Füzulinin "Su" qəsidəsinə, "Aynül-həyat" adlı bir şərh yazır ki, bu şərh üç dilə aid eyni kökdən gələn, anlaşılması çətin olan sözləri və hər üç dildən bir çox seçmə nümunəni göstərir. "Türk yurdu"nda qısa tərcümeyi-halını yazan dostu Nəcib Asim bəy, Çələbi Əfəndinin dil sahəsində türkçülüyünün əsasən 1897-ci il tarixlərində başlamış olduğunu belə anladır: "Aynül-həyat"ın incələnməsindən həzrətin türkcə bilgisini və yetənəyini anladım; özü üçün inkişaf və millət üçün xeyir səbəbi olur ümidi ilə türk kəlmələrini toplamağa təşviq etdim. Yazma, basma, əski, yeni, bir çox kitabımı ona verdim. O da bunları tamam oxuyub kəlmələrini və şahidlərini

[1] Bəzi nüsxələrdə sonu "həm min kopuz çalır min"dir. (Vələd Çələbinin qeydi).

dəftərlərinə qeyd etdi. Özündə olan kitabları və kitabxanadakıları da beləcə elədi...*”Türk dili”* adlı böyük lüğət kitabını hazırlamağa başladı.”[1]

Çələbi əfəndi, nəşr olunmamış risaləsində, öz tərcümeyi-halından yeri gəldikcə bəhs edərkən, dostunun bu hekayəsini belə anladır: “Mətbuat aləmində Nəcib Asim ustadımızla görüşdüm. Onu hədsiz bir türkçü gördüm. Osmanlı ədəbiyyatının ən yaxşı şeirlərini, nəsr əsərlərini təbii və məqbul bilmir, “Türklərin ən həqiqi ədəbiyyatı xalqdan doğan və xalqa xitab edən əsərlərdi”- deyirdi. Mən bu açıqlamaları o vaxt lazımi səviyyədə qavraya bilməmiş olduğum halda, yaradılışımda olan, 16-17 yaşımda “Abuşka”nı kopya etməyə məni yönəldən fitri qabiliyyətim, məni artıq türkçü etmişdi. Nəcib Asim bəy mənə şərqşünasların nəşr etdirdiyi əski türkcə əsərləri, əski lüğət kitablarını göstərdi. Mən də tədarük etdim. Vefiq Paşa ilə görüşdüm; *“Ləhcə”*sini verdi. Mən *“Ləhcə”*ni bir ədəbi kitab oxuyan kimi əvvəldən axıra oxudum. Gözümün önündə başqa bir aləm açıldı. Zatən Amma Suyutinin “Al-mazhar”ini, Əhməd Farisin “Al-casus”unu oxuyaraq klassiklərin, sonra da Corci Zeydanın “Tarixi-Adabül lüğat” və digər əsərlərini oxuyaraq Batıdakı yenilərin lüğət elmini öyrənmişdim. Nəcib Asimin təşviqi ilə bir “Türk lüğəti” yazmağa başladım.”

Bu “Türk lüğəti” *“Türk dili”*nin ilk şəklidir. Əlyazmaları, Çələbi Əfəndinin eviylə birlikdə yanmışdır. Bundan sonra Bəykoza köçürlər və orada Əhməd Midhət Əfəndi ilə əlaqəsini artırır; və bir-birlərinə dərs verirlər: Midhət Əfəndi Çələbiyə fransızca, Çələbi Əfəndi də Əhməd Midhətə Sultan Vələdin məsnəvisini oxudur. Və o zaman Əhməd Midhət və Nəcib Asim Bəylər “Lüğət”i yenidən toplaması üçün Vələd Çələbi Əfəndini təşviq edərlər. Hətta Əhməd Midhət: “Kitabxanam sənindir, işinə yarayanları al, lazım olan qədər səndə qalsın!”-deyir. Nəcib Asim bəy özündə olanlardan başqa, kitabxanalardan belə axtarıb lüğət kitablarını tapıb gətirir, dostuna verir. Və Çələbi Əfəndi, təkrar “Türk dili”ni yazmağa girişir.

Vələd Çələbi Əfəndi 30 illik əməyinin məhsulu olan bu mükəmməl türk lüğətini hələ yayınlaya bilməmişdir.Osmanlı səltənətinin məşrutiyyət dövründə Maarif nazirliyi nəşr etməyə söz vermişsə də, yerinə yetirməmişdir. Ümid olunur ki, Türkiyə Cümhuriyyətinin Təhsil nazirliyi, “Türk dili”ni nəşr edib yayaraq, türklüyə əhəmiyyətli bir xidmət edəcəkdir.

Vələd Əfəndi, 30 ildən bəri dilçilik elmi, xüsusən türk dilçiliyinə dair bir çox məqalə yazıb, müxtəlif qəzet və dərgilərdə nəşr etdirmiş və artıq Misirə və Ərəbistana getməkdən vaz keçib İstanbulda yerləşmişdir. Məşrutiyyət dövründə, İstanbul Universtiteti Fars ədəbiyyatı müəllimliyinə seçildi. Çələbi Əfəndinin də Məşrutiyyət elanından sonra türkçülük sahəsindəki xidmətlərini irəlidə görəcəyik.

Nəcib Asim bəy Vələd Çələbi Əfəndinin, Çələbi Əfəndi də Nəcib Asim Bəyin tərcümeyi-halını yazmışdır; bu iki dostun qarşılıqlı yazdıqları tərcümeyi-halları oxuduğum kimi, özləri

---

[1] Nəcib Asim, “Vələd Çələbi Həzrətləri”, “Türk yurdu”, c. VII, s. 2475.

tərəfindən yazılan, hələ nəşr olunmamış tərcümeyi-hallarını da gözdən keçirdim. Yuxarıdakı icmal, əsasən bu qaynaqlardan çıxarıldı.

**“İqdam”çı Cövdət Bəy**

Bu iki “vav”lı türkün fəaliyyət dövrlərini xarakterizə edə bilmək üçün “İqdam” sahibi Əhməd Cövdət bəyin, “İqdam”ı qurduğu zamana aid xatirələrindən də bir neçə sətir oxumalıyıq: “O zamanlar[1] “İqdam”da Nəcib Asim, Vələd Çələbi və Əmrulla Əfəndilər çalışırdılar. Xalq qeyrətə gəlmişdi. Milliyyət həvəsi məhz o vaxt oyanmaqda idi. Heç tanımadığımız adamlar, mətbəəyə türkcə kitablar gətirib bizə göstərirdilər. Mən də o həvəslə “Mühiti-maarif”i, “Qamusi-türki”ni və digər risalələri basmağa başladım. Ancaq senzura tərəfindən qadağa qoyulmuşdu. Sırf türkcə məqalə yazmaqdan çəkindirildik. Daha sonralar “Evliya Çələbi Səyahətnaməsi” Vəzir Hanında bir odada həbs edildi. Məşrutiyyət elanına qədər məhbus qaldı. Daha öncə “Mühiti-maarif”in də yayım sahəsindən qaldırıldığı, yığışdırıldığı məlumdur. Qarşısı alınmaz bir milli duyğu ilə yayını irəlilətməyə qərar vermişdim. Ancaq üzləşdiyim zərbələr, əzmimə, təbii olaraq mane oldu.”[2]

**Əbdülhəmid dövrünün türkçülüyə qarşı tutduğu mövqe**

Bir tərəfdən Əhməd Midhət Əfəndinin evindəki dostca söhbətlərlə, digər tərəfdən Əhməd Cevdət bəyin “İqdam”ında çıxan məqalələrlə təşkilatlanmağa başlayan dil və tarixdə türkçülük hərəkatı, dərhal Əbdülhəmid idarəsinin diqqətini cəlb etmiş, sadə türkcə, yəni ərəbcə və əcəmcəsi az bir üslubla yazılan məqalələrin nəşri qadağan olunmuşdur; eyni zamanda türk tarixinin tədqiqinə yol açar düşüncəsi ilə çapda olan kitabların da yayımlanması qadağan olunmuşdur!...

Əbdülhəmid dövründə, türkçülük axımına qarşı hökumətin münasibətini Çələbi Əfəndi belə qeyd edir: “Dil bəhsləri qadağandır!” -deyə bir padşah əmri çıxdı. Və artıq Məşrutiyyətə qədər dillə bağlı məsələlər qəzetlərdə görünməz oldu.”[3]

1900-cü ildə nəşr olunan Nəcib Asim bəyin “Türk tarixi” də, “Evliya Çələbi Səyahətnaməsi” kimi bir xan odasında həbs edildi.

Əbdülhəmid xarici siyasətində müsəlman aləmi ilə az-çox əlaqə qurmağa çalışdığı kimi, iç siyasətində də hər şeydən öncə, imperatorluğun müsəlman xalqları arasında anlaşılmamazlıq çıxmamasına çox diqqət yetirirdi. Dövlətin gələcəyinin təmin olunmasını, müsəlman ünsürlərin birlik və dayanışması ilə Xəlifeyi-müsliminə sədaqət və bağlılıqlarından gözləyirdi. Qısası,

[1] 1893-1895-ci illər.
[2] Əhməd Cövdət Bəyin şəxsi bir məktubundan.
[3] Vələd Çələbinin basılmamış bir risaləsi.

özünəməxsus islam birliyi siyasətini tətbiq etməyə çalışırdı. Qeyri-müsəlman ünsürlərdən artıq imperatorluq üçün xeyir qalmadığına qənaət gətirən sultan, heç olmasa müsəlman ünsürlərin millət davası ilə bir-birlərindən ayrılmalarına əlindən gələn qədər mane olmağa çalışırdı. Bu siyasəti güdərək, ərəblərin, arnavudların, kürdlərin milliyyətçiləri fəaliyyətdən uzaqlaşdırmağa çalışdığı kimi, türklərin də "türk milliyyəti" fikrinə dəyər vermələrinin önünə keçmək istəyirdi. Əbdülhəmid, milliyyət fikrini rədd edən islamın xəlifə-sultanı olmaq, bütün müsəlman təbəəsini, yalnız dini birliklə hökmü altında saxlamaq, qısası, maddi və fikri təsirlərlə gerçəkdə davamı artıq imkan xaricində olan hilafəti-səltənət sistemini davam etdirmək əməl və xülyasında idi. Bu xülyanın həyata tətbiq edilə bilmədiyinin, bilməyəcəyinin fərqinə vara bilmirdi.

Ancaq o zamanlar, yalnız padşah və hökumət deyil, aydın geçinən Batı türklərinin əksəriyyəti belə, milliyyət fikrinin siyasi deyil, hətta dil, tarix, qısası elmi və nəzəri sahələrdə dəstəklənməsi və nəşrinə qarşı idi: "türkçülüklə daima məşğul olan məlum adamlar olmasa da, o vaxt dil məsələsi oldumu, Nəcib Asim ilə Vələd Çələbi ortaya atılırdı, yəni möhtərəm bir məsləkin xəbərçiləri deyə deyil, tam əksinə, istehza zəmini hazırlamaq üçün "Şu mahutlar" yerinə xatırlayırdılar. "Dünya inkişaf edərkən bu zavallılar bu gözəl Osmanlı ədəbiyyat dilini buraxacaqlar da Asiya çöllərindəki Özbəklərlə bizə eyni dili danışdıracaqlar. Füzulini, Nədimi buraxıb Xoca Əhməd Yəsəvini, Sofi Allahyarı təqib etdirmək istəyirlər" -deyə daha bir sıra cazibəli sözlərlə gəncləri bizdən nifrət etdirməyə qalxırdılar... Bizim zəif işığımızı söndürməyə çalışırdılar. Hələ Əbüzziya, Sultan Həmidin tam can damarına toxunacaq sözlər tapır, türkçülərə hücum edərdi; hücum deyil, söyüb-suvadığı da olurdu. Ən son yazdığı əleyhdar bir məqaləsində "bunlar bu qədər milyon islam camiasının həp birdən dilini süslədiyi "La ilahə illəlah"ını qaldırıb yerinə "yoxdur tapacaq, Çalaptır ancaq" təkərləməsini qoymaq istəyirlər"- deyə yazdı..."[1]

Türkçülər əleyhinə hücumda ən irəli gedən adam, əvvəldən bəri islamçı, yalnız islamçı deyil, hətta ərəbçi tanınan Əbüzziya Tofiq bəydi ki ərəbliyə məhəbbətinə görə oğullarına Talha və Vəlid kimi ərəb olmayan müsəlmanlar arasında az eşidilən qatı ərəbcə adlar qoymuş və özü də ərəb qaydası ilə "Əbüzziya" künyəsini almışdır. Namiq Kamallar dövründən geridə qalan bu az qabiliyyətli, ancaq çox mərifətli qəzetçi və mətbəəçinin türkçülük əleyhinə açdığı cihad, məşrutiyyət dövründə, irəlidə görəcəyimiz kimi, özü, oğulları və Süleyman Nazif bəy kimi dostları tərəfindən davam etdirildi.[2]

---

[1] Vələd Çələbi Əfəndinin nəşr olunmamış bir risaləsi.

[2] Əbüzziya Tevfik bəy çox yaxşı mətbəəçi idi. Əbüzziya mətbəəsi, İstanbulda qurulan mətbəələrin ən mükəmməlidir. Bir aralıq "*Türk yurdu*"nu mətbəəsində basdıqmaq məqsədi ilə ona müraciət etmişdim. Bu kimi vərəqparələrin, nə qədər pul verilirsə verilsin, mətbəəsində nəşr olunmayacağını əsəbi bir çöhrə və nəzakətsizliyə yaxın bir davranışla mənə ifadə etmişdi. Bu hərəkəti məsləkinə sədaqəti baxımından təqdirə layiqdir" (A. Y.).

Müxaliflərin etirazlarına, hökumətin əngəlləmələrinə baxmayaraq, dilçilik sahəsində və tarixi türkçülük cərəyanına yenidən yeni qüvvələr gəlib qatılırdılar: Əmrullah Əfəndi, Bursalı Tahir bəy, Raifpaşazadə Məhəmməd Fuad bəy, Nəcib bəy bunlardandır.

**Əmrullah Əfəndi**

Əmrullah əfəndi, türk dil və tarixi ilə xüsusi bir şəkildə məşğul olmayaraq, gənclikdə elm ilə maraqlanmışsa da, Məşrutiyyət dövründə göründüyü kimi, türkçülüyə meylli idi.

**Bursalı Tahir Bəy**

Bursalı Tahir Bəy, mətbuatda tanındığı zamandan etibarən, türklüyün orta dövrü bioqrafiyaları, kitabiyyatıyla məşğul olmuş və islam mədəniyyətində türklərin hissəsini ayırıb göstərməyə çalışmışdır, sonra xüsusən Osmanlı dövründə yetişən "və məsləklərində əsər yazan türk şeyxləri, şairləri, ədibləri, tarixçiləri, doktorları, riyaziyyatçıları və coğrafiyaçılarının qısa tərcümeyi-hallarına, əsərlərinə dair yetərli bilgiləri" toplamışdır. Bursalı Tahir Bəy, xüsusən türklərin orta dövrdə və Osmanlı dövründə "elm və fənnə xidmətlərini" göstərmək surəti ilə türklərin islam mədəniyyətində önəmli bir amil olduqları həqiqətini elmi qaynaq və dəlillərlə ortaya qoyub isbat edərək, islamiyyətdən sonrakı türklüyün mədəniyyət tarixinə və sırf mədəniyyət baxımından da türklərin keçmişlərini sevərək, keçmişləri ilə fəxr edə bilmələrinə çox böyük xidmətlər etmişdir.

Bursalı Tahir Bəy də Nəcib Asim Bəy kimi əsgər, həm də əsgər oğlu əsgərdir. Böyükbabası, Əbdülməcid dövrü əsgəri başçılarından Asakir-Hassa Livası Üsküdari Seyid Mehmed Paşadır; atası da öncə əsgərliyə girmiş, sonra sağlıq durumu üzündən məcburən atasının məsləkindən ayrılaraq, güzəranını keçirmək üçün çalışmasından boş qalan vaxtı tarix, bioqrafiyalar, şeir və təsəvvüflə məşğul olmağa həsr etmişsə də, 1877-ci il Rus savaşı başlayınca əcdad qanı qaynamış, evində oturub qala bilməmiş, vətənin müdafiəsinə qalxmış və Plevnada şəhid olmuşdur.

Tahir Bəy 1861-ci ildə Bursada anadan oldu. Yəni, Nəcib Asim bəy ilə yaşıddır. Bursa Əsgəri edadisiylə Hərbiyyə Məktəbində təhsilini tamamlayaraq, 1883-cü ildə piyada başçısı oldu. Tahir bəyin əsgərliyi də Nəcib bəyinki kimi bölük və taburlardan çox əsgəri məktəblərdə müəllimliklə keçmişdir. Hələ edadiyyə və hərbiyyə məktəblərində ikən, əxlaqının gözəlliyi və çalışqanlığı ilə üstünlük göstərən və rəsmi dərslərdən başqa, zamanın alimlərindən, xüsusən mütəsəvvüflərdən faydalanan Tahir bəyin müəllimliklə Makedoniya məktəblərini dolaşdığı zaman, babasından gələn və qeyri-rəsmi müəllimlərindən qazandığı tarix, bioqrafiya marağı get-gedə artaraq, onu davamlı bu sahədə incələmə və araşdırmalara yönəldirdi. Əbdülhəmid hökumətinin iç

idarəsi pozulduğu zaman, xüsusən Rumeli orduları əsgərləri arasında yayılmış olan "Gənc osmanlılıq" siyasi hərəkatına, Tahir bəy də dərin bir səmimiyyət ilə qatılanlardandır. Fəqət ruhən idealist, fikrən realist olduğundan, Məşrutiyyətin elanından sonra gerçək siyasət sahəsində əslən uğur qazana bilməmişdir. Səlanik "İttihad və tərəqqi" gizli cəmiyyətinin bir nömrəsinə sahib olan bu çox namuslu əsgər, Birinci Osmanlı məclisi-Məbusanına Bursadan məbus seçilmişsə də, əski şagird və yoldaşlarının həddən artıq opportunist praktik siyasətləri ilə uyuşa bilmədiyi üçün, bir daha məbus çıxarılmadığı kimi, Çengəlköyündəki sadə evində, demək olar ki, unudulmuş və tərk edilmişdi. Zavallı Tahir bəy pratik siyasətdə daha pratik incələmələrdəki doğruluq metodunun, elmi dürüstlük və səmimiyyətin tətbiq edilməsini istəyir və gözləyirdi!..

Siyasətdə uğursuzluğa düçar olan bu böyük qəlbli adam, elm sahəsində, xüsusən türkiyyat sahəsində, haqqında danışılan dövrün ən elmi əsərlərini meydana gətirən bir bioqrafiyaçı biblioqrafdır.[1]

Nəcib Asim ilə Vələd Çələbi "İqdam"da türk dilçilik elmi və türk tarixinə dair məqalələr yazmaqda ikən, Tahir bəy də həcmən kiçik, fəqət türkçülük hərəkatı baxımından son dərəcə önəmi olan ilk əsərini, "Türklərin ülum və fününa dair xidmətləri" adlı risaləsini "İqdam" külliyyatı arasında nəşr etdirdi (1896). Eyni əsər Məşrutiyyətin elanından sonra, "Türk dərnəyi" yayınının ikinci sayılısı olaraq, ikinci dəfə, 1911-ci ildə basıldı və yayımlandı.[2] Yazarın birinci nəşrə Manastırda yazdığı ön söz, o zaman oxuyanlar üzərində çox dərin bir təsir buraxdı; Tahir bəy ön sözündə deyirdi ki: "Aciz məqsədim geniş bir türk tarixi yazmaq deyil, bəlkə bu qövmdən yetişib elm, fənn şöbələrində dəyərli əsərlər yaradan elm və maarif ərbabının təqdimat xarakterli, ancaq qısa şəkildə tarixi durumlarını yazaraq, türkləri yalnız savaşçı soyundan, qaba bir qəhrəman zənn edən bir istehza, kin sahibinin mənasız fikirlərini rədd etmək və çürütməkdir ki, çağımızdakı Avropanın Doğu dilləri ilə məşğul olan alimlərinin türk ədəbiyyatı və alimləri haqqındakı incələmə və nəticələri də iddiamızı bu baxımdan təsdiqləməkdədir... İslam mədəniyyəti və maarifinə xidmət edən və onun yayılmasını təmin edən, əlamətləri fəzilətdən ibarət olan kişilərin yarısının deyilsə də, üçdə birinin mütləq türk olduqları soy və kökləri ilə sabitdir."

İndi çox yayılmış məlumatlardan sayılan bu görüş, o zamanlar üçün yeni bir üfüq açar mahiyyətdəydi. Bursalı Tahir bəyin "Türk yurdu"nda qısa bir tərcümeyi-halını yazan Köprülüzadə Məhməd Fuad bəy, "Türklərin ülum və fününa xidmətləri" risaləsindən bəhs edərkən "ərəbcə və ya əcəmcə yazdıqları üçün o zamana qədər ərəb və ya əcəm hesab edilən islam böyüklərinin, məsələn

---

[1] Tahir bəyin bioqrafiya və biblioqrafiyaya aid əsərləri riyazi bir açıqlıq, dərinlik və qətiyyətlə türklərin yalnız savaşda qılıncla deyil, irfan sahəsində qələmlə, pərgarla, pota və inbiklə də çox çalışdıqlarını açıb göstərməkdədir." Akçuraoğlu Yusuf, "Osmanlı müəllifləri", "Türk yurdu", c. VIII, s. 2736-2738.

[2] Bursa məbusu Bursalı Mehmed Tahir, "Türklərin ülum və fününa xidmətləri", "Türk dərnəyi" yayını, "Nəcmi-İstiqbal" Mətbəəsi, sayı 2, ikinci basım, İstanbul, 1327 (1911).

Fərabilərin, İbn Sinaların, Şevkət Buxarilərin, Cevhərilərin türk olduqlarını göstərməklə, Tahir bəy türk millətinin qabiliyyət və zəkasına, mədəni xidmətlərinə ən qəti dəlillər tapmış olurdu”- deyir.
Tahir bəy, yanılmıramsa, on yeddi nəşr olunmuş əsər buraxmışdır. Bəziləri kiçik risalələrdən ibarət olan bu əsərlərin hamısı dəyərlidir; çünki özəl araşdırma və incələmə məhsuludur. Bu əsərlərdən türkçülük axımına təsiri etibarı ilə ən dəyərlisi, yuxarıda haqqında bəhs etdiyimiz *“Türklərin ülum və fününa xidmətləri”* adlı risalədir; yazarına çox zaman və çalışma sərfini gərəkdirmiş olması, ümumi bir şəkildə elmin zənginləşməsinə xidmət etməsi, yararlı olması baxımından Tahir bəyin ən önəmli əsəri isə, heç şübhəsiz, *“Osmanlı müəllifləri”* adlı üç cildlik böyük kitabıdır.[1]
Bursalı Tahir bəy qaim-məqam rütbəsində ikən təqaüdə çıxmış və 1929-cu ildə Bursada ölmüşdür.[2]

**Raif Fuad bəy**

Bu dövrdə türkçülük hərəkatına qatılanlardan birisi də Raifpaşazadə Məhməd Fuad bəydir. Əbdülhəmidin vəzirlərindən, bir çox nazirlikdə düzgün xidmətləri ilə tanınmış Kösə Raif Paşanın oğlu olan Fuad bəy, 1872-ci ildə İstanbulda anadan olmuş və Qalatasaray Sultanisində IV sinifə qədər davam etdikdən sonra bütün sonrakı təhsilini Almaniyada almışdır. Almaniyadan 1893-də, Prussiya ordusunun topçu mülazimi rütbəsi ilə İstanbula döndü; və yüzbaşı olaraq Osmanlı ordusuna girdi. Özünün dediyi kimi: “Ata yurdundan bu uzun sürən ayrılıq, ana dilini ona bir az unutdurmuş, ancaq Osmanlı dilindən başqa qoca bir türklüyün mövcud olduğunu da öyrətmişdi. ”Hələ on beş yaşında, Berlində orta məktəb şagirdi ikən, bir kitabçının vitrinində görüb aldığı Vamberinin Cığatay türkcəsindən toplanmış şeir və nəsr parçalarını əhatə edən kitabı, Fuad Raif bəyə məktəbdə öyrəndiyi Türküstan, Buxara, Səmərqənd kimi coğrafi kəlmələrin məna və ruhunu anladır, oralarda yaşayan türklərin dilini, həyat tərzini, siyasi vəziyyətini öyrədir. Osmanlı türk paşasının oğlu, əcdaddan gələn savaşçı bir duyğu ilə oraların bir rus hökmü altında olmasına əsəbiləşir; bu millətdaşlarını qurtarmaq əməli, gənc Fuad bəyin ruhunda yüksək həyəcanlar oyandırır. Mənə xüsusi olaraq yazdığı bir məktubda deyir ki: “Bu hadisə məni əsgərliyə qapdıran qərarın önəmli bir səbəbi oldu.”

Raifpaşazadə İstanbula dönüncə, dərhal əlinə milli ədəbiyyat olaraq Namiq Kamalları, Əbdülhəq Hamidləri təqdim etdilər. Ədəbiyyatın ruhunu alman ədəbiyyatından alan və türk filologiyası ilə bir az məşğul olan gənc əsgər, Osmanlıların bu son klassik ədəbiyyatında aradığını tapa bilmədi. Qayıdandan bir il sonra, 1894-cü ildə, o zamanlar Hərbiyyə məktəbində fransızca

---

[1] Bursalı Məhməd Tahir, “Osmanlı müəllifləri”, Maarifi-Ümumiyyə Nəzarəti, Mətbəəyi-Amirə, İstanbul, 1333 (1917), c. I-II; c. III, Türkiyə Cümhuriyyəti Təhsil Nazirliyi yayını, Mətbəəyi-Amirə, İstanbul, 1343 (1927), ədəd: 63.
[2] Bursalı Tahir bəyin xeyli geniş bir tərcümeyi-halını öyrəncilərindən və dostlarından Müəllim Vəhyi bəy yazıb nəşr etdirmişdir. Dini və əxlaqi qayələrlə bir ustada qarşı çox hörmətlə yazılan bu əsərdən dəyərli məlumatlar alına bilər. Müəllim Vəhyi, “Bursalı Tahir bəy”, Mətbəeyi-Orxaniyyə, İstanbul, 1335 (1919).

müəllimi olan Nəcib Asimlə, 1895-də Vələd Çələbi ilə tanış oldu. Yenə o zamanlar babasının naziri olduğu Gömrük dairəsinin Evraq Yazı İdarəsi Müdiri Məhməd Əmin bəylə -milli şairimiz Əmin bəylə görüşdü. Əmin bəylə əlaqəsi haqqında Raif bəy deyir ki: "Görüşür-görüşməz qayələrdəki birliyə görə, bir-birimizə dərhal isinişmişdik. İlk türkcə şeirlərini o zaman dinləmiş və sevmişdim; və çox xeyirli bir cığır açmaqda olduğunu, onun ilk türk şairi sayılacağını söyləyib müjdələmişdim."[1]

Raif Fuad bəy, almanca, fransızca, ingiliscə dillərini çox yaxşı bildiyi, bu dillər vasitəsi ilə türkiyyata dair bir çox əsər gözdən keçirib incələdiyi halda, Məşrutiyyət dövrünə qədər heç bir əsər nəşr etdirməmişdir. Dostları ilə fikir mübadiləsi edərək, biliklərini ifadəyə, fikir və görüşlərini aşılamağa çalışırdı. O zamanlardan etibarən, Fuad bəyin əsaslı fikirlərindən biri, türk dilinin mümkün olduğu qədər yabançı kəlmələrdən, termin və ifadələrdən qurtarılmasıdır. Türkcə köklərdən bir çox kəlmə və termin yaratmanın mümkün olduğuna Fuad bəyin tam qənaəti vardır; bu şəkildə doğan yeni türkcə kəlmələrlə, ya da əslən mövcud olub sonradan unudulan türkcə kəlmələrin xatırlanıb işlədilməsi ilə, türk dili, daha doğrusu, türk dilinin Batı ləhcəsi, yabançı kəlmələrdən təmizlənmiş ola bilərdi. Batı türkcəsi məqsədə yetməzsə, başqa türk ləhcələrinin yardımına üz tutular. Sonralar xeyli mübahisəyə yol açan bu əsaslı fikri, yəni türkcədə "təsfiyəçiliyi", Raif Fuad bəydir ki, ən açıq bir şəkildə ortaya atdı.[2]

Fuad Bəyin türkçülük sahəsində daha fəal rolu, Məşrutiyyətdən etibarən başlayır.

---

[1] Raif Fuad bəyin mənə yazdığı xüsusi bir məktubdan.
[2] Fuad bəy onu tanıdığım gündən türkcənin latın hərfləri ilə yazılmasına qətiyyətlə tərəfdardır.

**Nəcib Bəy**

Türkçülük idealına şiddətlə bağlılığını və xüsusən dilçilik üzərində çox çalışmış olduğunu dostlarından eşitdiyim Nəcib bəyin İstanbuldan uzaqda, sadə bir şəkildə keçirdiyi həyat, fəaliyyət və çalışması haqqında açıq və ətraflı məlumat almama əngəl oldu. Özündən tərcümeyi-halını və əsərlərini istəmişdim; hədsiz təvazökarlığı bu xahişimin yerinə yetirilməsinə izin vermədi...

**Yunan Hərbi: şeir və ədəbiyyatda türkçülük**

Səksəninci və doxsanıncı illərdə türkçülükləri ilə tanınan şəxslərdən yuxarıda bəhs etdiklərimizin hamısı, tarix, dil, qısası elm sahəsində çalışanlardı. Bunlardan başqa türkçülüyü şeir və ədəbiyyat sahəsinə açıqca və qətiyyətlə daxil edən iki önəmli sima o tarixlərdə seçilməyə başlayır. Bunlardan birisi nəsr yazarı Əhməd Hikmət bəy, digəri şair Məmməd Əmin bəydir. Bu iki sənətkar, ustalıqla istifadə etdikləri təmiz türkcənin qüdrətini, ilk dəfə Yunan savaşı dövründə göstərdilər.
Milli şairimizin:

“Mən bir türkəm, dinim, cinsim uludur!”

-deyə başlayan şah əsəri, türklərin yunan əsgərlərini süngüləri ucuna taxıb Döməkə üstündən aşağıya yuvarladıqları zaman bir zəfər təbili gözəlliyi və nəşəsi ilə bütün türk dünyasında səsləndi. Əhməd Hikmət bəy, müsəlman türkün tanrısına öz dili ilə ilk xitabı olan “Yakarış”ını bu zəfərdən iki-üç il sonra göylərə doğru yüksəltdi. Hər iki dil sənətkarının dili, Raif Fuad bəyin görüşünə uyğundur. Ərəbcə və əcəmcə kəlmələri mümkün olduqca az işlədirlər, tərkibləri büsbütün atmışlar. Məmməd Əmin bəy, şeirlərində ərəb və əcəm vəznlərini heç işlətmədi. Mənzum əsərlərinin istisnasız hamısı, barmaq hesabı ilədir; yəni Nəcib Asimin, Vələd Çələbinin xalq şeirlərindən taparaq “milli əruz” adı ilə nəzəriyyəsini təsbit etdikləri bölgülü barmaq hesabı ilədir.

**Müftüoğlu Əhməd Hikmət bəy**

Əhməd Hikmət bəy 1870-ci ildə İstanbulda doğuldu. Əcdadı şeir və təsəvvüflə məşğul olmuş üləma sinfindəndi. Böyük babası Hafiz Əbdülhəlim Əfəndi Yunan ihtilalı zamanı Mora müftisi idi. Üsyançılara qarşı, Morada Osmanlı hakimiyyətini qorumaq üçün müsəlmanları silahlandıraraq gerçəkdən müdafiə hazırlığı almışdı. İhtilalçıların əlinə əsir düşdüyü zaman üzərinə benzin tökülüb yandırılaraq öldürüldü. Əbdülhəlim Əfəndinin oğlu və Hikmət bəyin atası Yəhya Sezai Əfəndi,

Həmdullah Sübhi bəyin böyükbabası Sami Paşa ilə birlikdə Moradan İstanbula köçdülər. Hikmət bəy, yunanlar tərəfindən şəhid edilən böyük babası müftü Əbdülhəlim Əfəndiyə görə "Müftüoğlu" soyadından istifadə edir. Müftüoğulları ailəsi ilə Sami Paşa ailəsi əmi uşaqlarıdır.

Əhməd Hikmət bəy, ilk təhsilini Dökməçilərdə məhəllə məktəbində, sonra Aksarayda Mahmudiyyə orta məktəbində, daha sonra Soyuqçeşmə Əsgəri Rüşdiyyəsində aldı. Qalatasaray Edadisində-Lisesində tamamladı. Hələ məktəbdə ikən, o zamanın bir çox qabiliyyətli gəncləri kimi ədəbiyyata həvəsli idi, litseyi bitirmədən ədəbi bir əsəri basılmaya layiq görülmüşdü. Məktəbi qurtardıqdan sonra xariciyyə məmuru oldu və fransızcadan bir neçə kiçik əsər çevirdi. Sonra konsul olaraq çalışmağa başladı. Özünün dediyinə görə, 1895-ci ildə Qafqaziyada Poti şəhərində konsul vəkaləti ilə olduğu zamandır ki, "ədəbiyyatımızın milli bir qayəsi olmasının gərəkli olduğuna qənaət gətirmişdir." Xariciyyənin xarici məmurluqlarından qurtarıb nəzarətdə yerləşincə, çox sevdiyi dil və ədəbiyyat sahəsində daha ciddi çalışmağa imkan tapdı. Bir tərəfdən Qalatasaray Litseyində türkcə və ədəbiyyat müəllimliyi edir, digər tərəfdən İstanbulun ədəbi dərgilərinə kiçik hekayələr yazıb verirdi. O zamanlar "Sərvəti-fünun" ətrafında toplaşmış ədəbiyyat zümrələrinə Əhməd Hikmət bəy də daxildir. "Sərvəti-fünun"da nəşr etdirdiyi hekayələr, tərz və üslub etibarı ilə "Sərvəti-fünun" ədəbiyyatından imiş kimi görünür. Ancaq Əhməd Hikmət bəy Qafqaziyada gəldiyi qənaətə sadiq qalmışdır: "Sərvəti-fünun" ədəbiyyatçıları arasında, milli qayəsi ilə özünü tezliklə göstərdi. Və bu qayəyə doğru yürüyürkən, davamlı üslubunu dəyişdirdi. Yabançı kəlmələri atdı, türklüyün ən əski tarixlərinə daldı. Məşrutiyyətin sonrasında, Əhməd Hikmət bəyi bir türkçü, ədəbi türkçülükdə şair Əmin bəy kimi türkçü gördük.

**Milli şair Əmin bəy**

Məmməd Əmin bəy, ədəbi türkçülüyün şübhə yox ki, ən bariz simasıdır. İndiyə qədər bəhs etdiyimiz türkçü alim, yazar, ədib və şairlərin çoxunun Osmanlı sosial həyatının yüksək və orta deyilən siniflərindən çıxmış olduğunu gördük. Məmməd Əmin bəyin ilk özəlliyi, tam xalq içindən yetişmiş olmasıdır. Və bu özəllik Əmin bəyin düşüncə və yazma tərzlərinə çox təsirli olmuşdur; özü də fikir və üslubca demokratlığını, hər şeydən öncə, sosial mənşəyinə bağlayır.
Baba əcdadı Tərkos köylərindən Zəkəriyyə köylüdür; babası bir balıqçı qayığı rəisi olan Salih Rəisdir, anası isə Ədirnə civarından İstanbula gəlmiş köylü bir ailə qızı olan Əminə xanımdır. Şair Beşiktaşda, atasının sadə taxta evində, 1869-cu ildə dünyaya gəldi.

Əmin bəy, 7-8 yaşında Saray Məktəbi deyilən sibyan məktəbinə davama başlamışdı. Üç il sonra, Beşiktaş Əsgəri orta məktəbinə girdi, onu bitirincə, Mülkiyyə Edadisinə yazıldı. 18 yaşlarında Edadidən təsdiqnamə alaraq çıxdı. Və Babi-ali Sədarət Dairəsi Evraq Odasına maaşsız

katib olaraq təyin edildi. İki il sonra Hüquq məktəbinə yazıldı, fəqət bir az sonra təhsilini tamamlamaq üçün Amerikaya getmək ümidinə qapıldı və ingiliscəyə çalışmaq məqsədi ilə Hüquq məktəbini tərk etdi. Amerikaya səyahətini asanlaşdıracaq olan Amerikalı madam Mot bu zaman öldüyündən, Əmin bəy Amerikaya getmədi və Hüquq Məktəbinə də dönmədi. Qısası, Əmin bəy 21 yaşında (1891) məktəblərlə əlaqəsini kəsmişdir.

Milli şairimiz, məktəblərə çox az borclu olduğunu söyləyir: həqiqətən ibtidai və orta məktəbdə oxuma-yazma öyrənmişdir. Ancaq Mülkiyyə Edadisində kitabət xocalığını edən yazar və şair Lastik Said bəy, Əmin bəyin xatirində qaldığına görə, milli şairimizin ruhunda ədəbiyyat zövqü oyandırmağı bacarmamışdır.[1]

Bu məktəbdə coğrafiya dərsini tarixçi Əbdürrəhman Şərəf Əfəndi kimi tanınan bir şəxs oxudurdu. Əmin bəy, bu xocasının da ancaq bir neçə hekayəsini xatırlayır, milli, vətən hissini oyandıran və ya qüvvətləndirən təsirlərini xatırlamır!...

Əmin bəyin dediyinə görə, oxumaq-yazmaq bilməyən artasının kitab oxudub dinləmək marağı onda şeir və ədəbiyyat zövqünü oyandırmışdır. Salih Rəis, uzun qış gecələrində “Kərəm ilə Əsli”, “Aşıq Qərib”, “Battal Qazi” kimi xalq roman və dastanlarını, hətta Kamalın “Evraqi-pərişan”ı kimi ədəbiyyat kitablarını, oxuyub-yazmağı bacaran oğluna oxudub dinlərdi. Salih Rəisin xalq ədəbiyyatından duyduğu dərin zövq, oğlu Məmməd Əmin bəyə belə, atasının, yəni xalqın duyacağı, zövq alacağı, faydalanacağı tərzdə bir milli ədəbiyyat meydana gətirmək gərəkdiyi düşüncəsini ilham etmişdir.

Əmin bəy, özü üçün ilk dəfə Kamalı oxudu; Kamalın basılmış, basılmamış bütün əsərlərini gözdən keçirdi. Əslində Kamal, dilinin aristokrat olmasına baxmayaraq, fikri, xəyali və ruhi baxımdan demokratdır; Kamalın qəhrəmanlıq şeirləri, vətəni roman, teatr və hekayələri ilə hekayədən çox da fərqli olmayan tarixi parçaları xalqın ruh və duyğusunu “Battal Qazi” hekayəsi kimi həyəcana gətirə bilir. Kamal türkçü deyildir, ancaq Osmanlı şairlərinin, zənnimcə ən xalqçısıdır. Bu baxımdan Salih Rəisin *“Evraqi-pərişan”*dan zövq almasını, Əmin bəyin ilk öncə Kamala maraq göstərməsini təbii görməliyik.

Əmin bəy hüquqa davam edərkən, yalnız Münif Paşanın ədəbiyyat, hüquq fəlsəfəsi, hüquqa giriş dərslərinin onu cəlb etdiyini söyləyir. Ancaq bu dərslərdən də aldığı təsirləri açıq bir şəkildə xatırlaya bilmir.

Bu qədər ki, hələ Hüquq Məktəbində ikən yazıb nəşr etdirdiyi ilk əsərinin əxlaq və hüquq fəlsəfəsi ilə bağlı olduğunu bilirik: 1890-da, Əbüzziya mətbəəsində basılmış olan bu əsər, milli

---

[1] Bununla bərabər Lastik Səid Bəy aşağıdakı məşhur rübainin də müəllifidir:
“Ərəbcə istəyən Urbana getsin,
Əcəmcə istəyən İrana getsin,
Frənglər Firəngistana getsin,
Ki biz türküz, bizə türki gərəkdir.”

şairimizin bu ilk əsəri, "*Fəzilət və Asalət*" adlı, iki-üç formalıq, nəsrlə yazılmış, kiçik bir risaləcikdir.[1]

Bu risaləni yazdığı zaman Əmin bəy, Babi-Ali katiblərindəndi. Risaləsini dairəsinin ən böyük şefi olan Sədrəzəm Cavad Paşaya, şəxsən təqdim etmişdi. Risalə, sədrəzəmin xoşuna getmiş və Əmin bəyi Rüsumat Əmini Həsən Fəhmi Paşaya tövsiyyə etmişdir. Həsən Fəhmi Paşa Sədrəzəmin tövsiyyə etdiyi Məmməd Əmin bəyi 700 quruş maaşla Rüsumat yazı İşləri Müsəvvidliyinə təyin etdi; və bir müddət sonra, təxminən 1893-cü il tarixlərində, Rüsumat Evraq Müdirliyinə təyin edildi. Şair Əmin bəyin şöhrəti məhz bu Rüsumat Evraqı Müdirliyi zamanında türk aləminə və Avropaya yayıldı.

Əmin bəy kitabxana müdiri ikən, yuxarıda haqqında bəhs etdiyimiz Cəmaləddin Əfqani İstanbula gəlmişdi. Sultan Əbdülhəmid ona Nişantaşı tərəflərində bir gözəl ev verdi. Çox səyahətlərə gedib yorulmuş olan Şeyx Əfəndi də o evdə yerləşib qaldı; və artıq ölənə qədər heç bir yana getmədi.

Şöhrəti Doğu və Batını tutan Şeyx Cəmaləddinin ziyarətinə İstanbul alimləri, aydınları gəlirdilər, hər cümə və bazar Şeyxin ziyarət qəbul etdiyi günlər idi. Rüsumat Evraq müdiri Məmməd Əmin bəy Şeyxin ən davamlı ziyarətçilərindən idi. Yatmış islam aləmini oyandırmaq, hərəkətə gətirmək islam qövmlərinə milli bir şüur verərək həyat haqlarını anlatmaq məqsədi ilə illərdən bəri Doğu və Batıda dolaşan bu yenilik və inqilab tərəfdarı Şeyx, Sultan Əbdülhəmidin şübhə və qorxusunu, şair Məmməd Əminin ilgi və sayğısını çəkmişdi. Padşahın casusları Şeyxin yanına girib-çıxanları güdməyə başladıqdan sonra belə, Şair Şeyxin ölümünə qədər onun ziyarətinə davam etdi. Məmməd Əmin bəy, Cəmaləddin Əfqanini özünə ustad və yol göstərən tanıyır, fikirlərinin qismən ondan ilham olaraq ortaya çıxdığını daima söyləyir: "Məni o yoğurmuşdur. Əgər ruhların əbədiyyət və ölməzliyi varsa, deyirəm ki, o ətlərini, sümüklərini Maçka məzarlığına buraxmış isə, ruhunu da mənə yadigar etmişdir: Cəmaləddinin ruhu məndə yaşayır..."

Məmməd Əmin bəyin bu sözlərindən, fikircə Cəmaləddinə çox borclu olması nəticəsini çlxarıram. Milli şairin cəsarət və hərəkət etibarı ilə, Əfqanıstanlı ustadının ruhuna nə dərəcədə varis olduğunu təyin, ikinci bir məsələdir...

Əmin bəyin rəvayətinə görə, Şeyx Cəmaləddin, məclisinə davam edən kimsələrə əzm, qəlb qüvvəti, dözüm, fədakarlıq, ölümdən qorxmamaq kimi ruhi və əxlaqi əsasları aşılamaq istəyirdi; sonra islam qövmlərinin düşkünlüklərini göstərir və onları ayrı-ayrı qövmlər halında qaldırmaq,

---

[1] Bu əsərin heç bir nüsxəsi şairin əlində qalmamış, İstanbul kitabçılarında da arayıb tapa bilmədim. Ümumi kitabxanalarımızda isə yeni əsərlər nadir bulunur! İyirmi-otuz il öncə oxuduğumu xatırlayıram: dili hələ təmizlənməmiş kimi gəlir. Əsərə o zamanın tanınan şair və ədibləri bir xeyli tənqidlər yazmışdılar. Şair Əmin bəyin bugünkü ədəbi gerçəkliyini açıqlamaqda o qədər əhəmiyyəti olmamaqla bərabər, bu əsərin kitabxanamızda olmasını istəyirik (A. Y.).

yüksəltmək, bu günkü əsir hallarından qurtarıb hürriyyət, mədəniyyət və hakimiyyətə qovuşdurmaq lazım oluğunu düzgün və təsirli dili ilə anladırdı. Bizim milli şairimiz də, Şeyxin ümumi sözlərini, xüsusilə türk millətinə uyğunlaşdıraraq, türk millətinin şiddətli yoxsulluğunu, ehtiyaclarını, xüsusən dil və ədəbiyyat ehtiyacını, hürriyyətsizliyini, mədəniyyətcə geridə qalmış olduğunu düşünür və ustadının tövsiyyə etdiyi kimi bunların aradan qaldırılması üçün əzm, səbat və fədakarlıqla çalışmağı qurardı.

Əmin bəy yol göstəricisinin bir çox sözünü əzbərdən bilir, onları bir hədisi-şərifmiş kimi düstur olaraq qəbul edir. Yol göstəricisinin hədislərindən biri budur: "Sizdə də nə zaman özlərini sevməyən və ancaq özlərinin olmayan insanlar yetişirsə, o zaman qara gününüz ağ olacaq, düşdüyünüz yerdən qalxacaqsınız!.."

Məmməd Əmin bəy, Şeyx Cəmaləddin Əfqaninin məclislərinə davam edərkən, "Türkcə şeirlər"i yazmağa başladı. Yunan Savaşının öncəsi idi. Ortalıqda savaşın yaxınlaşdığını hiss etdirən milli həyəcan hiss olunurdu. "Türkcə şeirlər"dən birisinin- "Qurani-Kərim" şeirinin həqiqətən Cəmaləddindən ilham alınaraq yazıldığını, şəxsən Məmməd Əmin bəy söyləyir: "Şeyxin Hindistanda nəşr olunan "Məqalati-Cəmaliyyə"si Əmin bəyin islamı, üləmanın və fükəhanın təsirindən bir az başqa cür anlamasına yol açmışdır. Türk şairinə görə, "Quran" bir anadır, islam isə fəqirləri, zəifləri, öksüzləri, dərin bir şəfqətlə düşünən, "ürəkləri eyiliklə bəsləyən" və "düşün, sonra inan!" deyən, xeyir, mərhəmət və ağıl dinidir. 1897-ci ilə doğru yazdığı "Qurani-Kərim mənzuməsinə, Məmməd Əmin bəy indi daha geniş bir məna vermək istəyir; bu şeiri ilə yenilik dini əsasını qoyduğuna inanır.

Yenə o zamanlar yazılmış "Cəngə gedərkən" şeirini, Əmin bəy ustadı Cəmaləddinə oxuduğu zaman, Şeyx müridini: "Bax, sizin ədəbiyyatınız budur!" deyə çox alqışladı, bu yolda yazmağa təşviq etdi və "mən bunun bir də ihtilal ruhunu verəcək bərabərini görmək istəyirəm" deyə də şairin ideal üfüqünü bir az da genişlətmək istədi.

*Məmməd Əmin bəyin ən önəmli əsəri olan "Türkcə şeirlər" 1899-cu ildə nəşr olundu.*[1]

Bu şeir məcmuəsinin ilk parçası olan "Biz nasıl şeir istəriz?" adlı mənzumə altında belə bir qeyd var: "Mənzumələrim Yunan müharibəsi zamanı nəşr olunmuşdur." Ancaq bu qeyd həqiqəti tamam ifadə etmir: mənzumələrin bəziləri, məsələn "Qurani-Kərim" və "Ah analıq!" Yunan müharibəsindən öncə söylənmiş, hətta nəşr olunmuşdur. Senzura şərtlərindən dolayı, şair, kitabına belə bir qeyd əlavə etməyə gərək görmüşdür.

Türkçülük axımının ədəbiyyat qismində, hətta ümumi olaraq türkçülük düşüncəsində böyük bir yeri olan "*Türkcə şeirlər*" 63 səhifəlik, kiçik bir kitabdır. Bu kitab Məmməd Əmin bəyin yalnız 9 kiçik mənzuməsini özündə birləşdirir. Kitabın başqa səhifələri rəssam Zonaronun Yunan savaşına

---

[1] "Türkcə şeirlər" İstanbulda, Mətbəəyi-Əbüzziyada, 1316 (1899) ilində çox gözəl, süslü və rəsmli olaraq nəşr olunmuşdur.

aid rəsmləri ilə və Rəcaizadə Əkrəm, Əbdülhəq Hamid, Ş. Sami, Dr. Rıza Tofiq və Fəzli Nəcib bəylərin bu mənzumələri haqqında Məmməd Əmin bəyə yazdıqları məktubları ilə doludur. Bu zatların hamısı Əmin bəyin yeni açdığı cığırı bəyənirlər, gənc şairi təşviq, təqdir edirlər; fəqət aralarında yeni məsləki ən çox qüvvət və qətiyyətlə alqışlayan Şəmsəddin Sami bəylə Doktor Rıza Tofiq bəydir. Beş-altı il sonra Hüseyn Cahid bəyin "Çocuq baxçası"nda çıxan istehzalı bir məqaləsində "bu məsləkin sağdışı" dediyi Rıza Tofiq bəyin məktubu, həqiqətən bu yeni cığırın bəyannaməsi kimi bir şeydir. O zamanlar çox türkçü olan doktor "Çocuq baxçası"nda uzun-uzun məqalələri ilə və qarşısına çıxan Ömər Naci mərhumun etirazlarına cavabları ilə Əmin bəy məsləkinin qorxmaz, yorulmaz bir təbliğatçısı olmuşdur. Doktorun *"Türkcə şeirlər"*də və *"Çocuq baxçası"*nda nəşr olunan məqalələrinin hamısı, bu yeni ədəbi məsləkin demək olar ki, manifestini təşkil edir.

Bu doqquz mənzumədən ibarət kiçik şeir məcmuəsi ilə Osmanlı türklərinin ədəbiyyatında yeni bir cığır açılmış və ədəbiyyat sahəsində türkçülüyün müəyyən bir məslək halına gəlmiş olduğunu görürük.

*"Türkcə şeirlər"*, nəşr olunmasından sonra, getdikcə artan bir gurultu qopardı: o zamanlar Osmanlı ədəbiyyatının sultanları sayılan Əbdülhəq Hamid, Rəcaizadə, Tofiq Fikrət kimi şair və ədiblər, *"Türkcə şeirlər"*i bəyənmiş görünməklə bərabər- mədhiyyələrinə bəzi çəkingən qeydlər əlavə etməyi də unutmurlar və özləri yazılarında əsla bu yeni məsləkə yaxınlaşmaq meyli göstərmirlər; ikinci, üçüncü dərəcədə olan Osmanlı şair və yazıçıları isə açıqdan-açığa mənfi bir mövqe tutmuş olurdular. Fəqət Batının Osmanlı və türk ədəbiyyatını incələyən, bu ədəbiyyatla məşğul olan alimləri, Əmin bəy məsləkini qeydsiz-şərtsiz bəyəndilər və öydülər. Osmanlı dövlətinin xaricində yaşayan türklər, Osmanlılar arasında ən Avropayi şüur daşıyan kimsələr də, bu barədə Avropa şərqşünaslarının fikrinə tamam şərik olurdular. *"Türkcə şeirlər"* ətrafında qopan mübahisə və tənqidlər yeni məsləkin qələbəsinin, hətta zəfərinin gerçəkləşmiş olduğu bu gün belə büsbütün sona yetməmişdir. İsmayıl Həbib bəyin *"Təcəddüd Ədəbiyyatı"*nda yürütdüyü ziqzaklı görüşlər o mübahisələrin uzaqdan gələn əks-sədasıdır.

Şair Məmməd Əmin bəyin fəaliyyəti, zənnimcə bir neçə baxımdan incələnə bilər: A) Məmməd Əmin bəyin türkçülük axımında yeri; B) Osmanlı türk və ədəbiyyatında rolu; C) Bütün türk dil və ədəbiyyatına təsiri; D) Sənətcə dəyəri; E) Fikri, əxlaqi, sosial və siyasi meylləri.
Məmməd Əmin bəydən bəhs edən türklərin çoxu, əsərlərinin sənətcə dəyəri nöqtəsinə bağlanıb qalmışlar; bəziləri də türkçülük axımındakı yerini də təsbitə çalışmışlar. Ancaq Osmanlı türk və bütün türk düşüncəsində müəyyən əxlaqi, sosial və siyasi meylləri yaratdığına dair türkcə sadəcə heç bir şey yazılmış deyildir. Yalnız şərqşünaslardır ki, bu nöqtəni də gözdən qaçırmamışlar.

Bütün türkçülük axımından bəhs edən bu məqalənin əsası Məmməd Əmin bəyin fəaliyyətini müxtəlif baxımlardan incələməyə əlverişli deyildir. Bundan başqa bu sətirləri yazan sırf sənətdən bəhsə heç də yetkili olmadığını çox yaxşı bilməkdədir. Bu məqalə, ancaq ümumi tarix baxımından, türkçülük hərəkatının tarixçəsini dəqiqləşdirmək, göstərmək məqsədi ilə yazılmaqdadır. Bu fikrin çeşidli sahələrdə ortaya çıxışını, ardıcıl gedişini, inkişafını, əlimizdən gəldiyi qədər tam və tərəfsiz göstərməyə çalışırıq. Bu baxımdan bizcə əsil önəmi olan məsələ, Məmməd Əmin bəyin türkçülük axımında tutduğu yeri, oynadığı rolu təyin etmək məsələsidir.

*"Türkcə şeirlər" şairi bütün Osmanlı şairləri arasında ilk dəfə tam şüurlu bir şəkildə dilinin türkcə, millətinin türk, millətin əksəriyyətinin xalq olduğunu gur səsi ilə hayqırmışdır.*

"Türkcə şeirlər"in birinci mənzuməsi, türk dilinin, türk şeirinin, türk millətinin Döməkə təpəsindən bütün aləmə savaş təbiliylə elanı kimidir:

Mən bir türkəm, dinim cinsim uludur!...

Türk şairi mənsub olduğu millətini, müsəlman, Osmanlı kimi qeyri-müəyyən və qarışıq adlarla anmır, millətinə həqiqi adını verir, "Türk" deyir. Əmin bəyin gözündə türk millətinin fikirlərini, hisslərini, xatirələrini, sevinclərini, ələmlərini türkü kimi oxumağa yetəcək bir türk dili, bir türk vəzni, bir türk şeiri vardır. Məhz bu ilk doqquz mənzuməsində, bu gerçəyi feilən isbata çalışır.

Türk şairinin, bu xalq mənzumələrindən etibarən, millətini bütün millətlərdən daha yüksək gördüyünə və onu sonsuz bir sevgi ilə sevdiyinə şahid oluruq:

Ən gözəl üz bizə çirkin, biz sevəriz: Türk üzü,
Ən eyi öz bizə fəna, biz istəriz: Türk özü,
Millətimiz alqışlarız, anıldıqca "Türk" sözü,
Biz Türkləriz, biz bu qanla, biz bu adla yaşarız!

Məmməd Əmin bəydən öncə Türk millətinə övladından hansı şair, bu qədər mütləq, açıq, sadə bir sevgi və bağlılıq göstərə bilmişdir? Allahı sevərsiniz?....

Milliyyət hissi və fikri, milli dil və ədəbiyyatın müstəqilliyinə, yabançı təsirlərdən qorunaraq inkişaf etməsinə çox önəm və dəyər verir. Məmməd Əmin bəyin ədəbi çalışmasında Osmanlı türk dilinin bağımsızlığına son dərəcə dəyər verdiyini görürük: "Türkcə şeirlər" şairindən öncə, heç bir nəzm və nəsr yazarı Türk, Məmməd Əmin bəy qədər bağımsız bir türkcə ilə yazmamışdır.

“Türkcə şeirlər”də ərəbcə, əcəmcə qaydaları ilə yaranmış ifadələr, tərkiblər heç yoxdur. Şair ərəbcə, əcəmcə kəlmələrin də yaxşıca türkləşmiş olanlarından başqasını heç işlətmir, ərəb və əcəm vəznini şeirlərindən tamamən qovmuşdur. Şeirlərini türklərin əski vəzni olan barmaq hesabı ilə yazır, “Türkcə şeirlər”i ilk incələyən şərqşünas Vladimir Minorski, əhatə etdiyi 9 mənzumədə 41 ərəbcə, 59 əcəmcə və 6 rumca kəlmə tapıb saya bilmişdir; fəqət Minorskinin də dediyi kimi, bu yabançı kəlmələr “şey”, “qayət”, “ağıl”, “atəş”, “baxça”, “külübə”, “sınır” kimi büsbütün türkləşmiş kəlmələrdir.

Məmməd Əmin bəyin izafətsiz, vəsfi-tərkibsiz, yüzdə 7,5-dən artıq yabançı kəlmə işlətmədən qəhrəmanlıq, dini və əxlaqi mövzularda, Batı ədəbiyyatı tərzində, dil qaydalarına və nəzm qanunlarına tamam uyğun, axıcı, ahəngli və həyəcan verə bilən doqquz-on mənzumə yaza bilməsi, Osmanlı türk dil və ədəbiyyatının milliləşdirilməsi yolunda bir inqilaba uğurla başlamaq deməkdir.

Milliyyətçilik, xalqçıdır. Hər yerdə millətin böyük əksəriyyətini xalq təbəqələri təşkil edir. Milliyyət fikri kökünü xalq təbəqələri arasında atar, onlardan təsirlənərək inkişaf edir və yetişir. Məmməd Əmin bəy, instinkt və ya şüuruyla bu həqiqəti tamam qavramışdır: *“Türkcə şeirlər”* xalqçı şeirlərdir, kitabın ön sözü belə, şairin xalqçılığını göstərir: “Türk qardaşlarıma, çoban ərməğanı, çam sakızı”. Doqquz mənzumədən heç birisində hökmdara bağlılıq və aristokrat meyl görülməz. Əksinə, birinci mənzumədən etibarən demokratiya sevgisini görməkdəyik:

Biz o şeiri istəriz ki, ciftə gedən babalar,
Əkin biçən gənc qızlarla odun kəsən analar,
Yanıq səsin dinlər ikən göz yaşını silsinlər!

Məmməd Əmin bəyin dost və düşmənləri tərəfindən bəyənilən şah əsəri olan “Cəngə gedərkən” türküsü nə qədər xalqçıdır! “Mən bir Türküm!” deyə bağıran Türk, bir Anadolu köylüsüdür:

Bu topraqlar əcdadımın ocağı.
Evim, köyüm həp bu yerin bucağı!

Zatən bu şeirin bir adı da “Anadoludan bir səs” deyilmi?

Bu mənzumədə Türk var, köy var, ocaq var, yurd var, tanrı var. Vətən və millət var; fəqət sultan yox, saray yox. Sarayı dolduran yaltaq tüfeylilər yox. *“Cəngə gedərkən” Cümhuriyyətçi bir millət şərqisidir.* Professor Hornun dediyi kimi, bir millət ilahisidir, himnidir. Yunan savaşı

sırasında şairin bağrından çox təbii bir şəkildə qopmuş bir millət səsidir. Nə qədər aransa, bundan daha təbii, gözəl, uyğun, canlı, həyəcanlı bir millət ilahisi tapıla bilməz. Yetər ki, bu ilahini layiq olduğu şəkildə bəstələməyi bilən bir musiqişünas çıxsın.

Məmməd Əmin bəydən öncə, Namik Kamal, Tofiq Fikrət kimi xalqçılığa az-çox meyl göstərən şairlərimiz yox deyildir; ancaq bunların xalqçılıqları nədənsə süni kimi bir şey hiss etdirir: fransız romantiklərindən ilham alan Namik Kamal ilə Əbdülhəq Hamid, birisi sipahi, digəri üləma aristokratiyasından gələn bu iki əsil Osmanlı, balıqçı oğlu Məmməd Əmin bəy kimi xalqın ruhuna girib, səslərini eşitdirməyi bacara bilmişdirmi? Tofiq Fikrətin qəlb və vicdanı, "İncil"i bir şəfqət və insaniyyət hissi ilə doludur, buna şübhə etmirəm; ancaq xahiş edirəm, bir İstanbul əsilzadəsi olan Tofiq Fikrətin ən demokratik düşüncələrlə yazılmış şeirlərində belə xalqa yüksəkdən baxıb acıma qoxusunu duymursunuzmu? Sanıram ki, Məmməd Əmin bəydən öncə, hətta sonra, onun qədər xalqın, köylünün həyatını, iztirab və acılarını, ümid və həyəcanlarını ifadə etmiş bir Türk şairi gəlməmişdir.

Türk şairinin məhz bu xüsusiyyətləridir ki, "Türkcə şeirlər" çıxar-çıxmaz, şeir və ədəbiyyatı yalnız süni və əyləncə saymayan, şeir və ədəbiyyatın sosial və siyasi dəyərini haqqı ilə anlayan Batılıların diqqətini çəkdi. Şərqşünaslar, türklər arasında yeni bir dil və ədəbiyyat məktəbi doğulduğunu dərhal sezdilər və Türklərin çağdaş mədəniyyət yolunda önəmli bir addımlarını təşkil edən bu hadisəni alqışlarla qeyd və təsbit etdilər.

Türk və Osmanlı ədəbiyyatını elmi bir şəkildə incələyərək bu gün Avropa şərqşünasları arasında dəyərli kitablardan sayılan "Ottoman Poems" (Osmanlı Şeirləri) və "A History of the Ottoman Poetry" (Osmanlı şeirinin tarixi) adlı kitabların yazarı Mister Gibb (E. J. W. Gibb) "Türkcə şeirlər"in yayımlanmasından sonra Məmməd Əmin bəyə yazdığı türkcə məktubda eynilə belə deyirdi: "Nəhayət, sizin mərifətinizlə Türk milləti sədasını tapdı. Siz gəldiniz və nə Doğuya baxaraq və Batıya - öz həmvətənlərinizin könlünü oxudunuz və bunların duyğularını öz dilləri ilə ədibanə bir tərzdə ərz etdiniz. Acizanə fikrimcə, türk şeirinin doğru məzmunu və doğru ifadə tərzini siz tapdınız. *Sizi altı yüz il bəkləmişdir,*[1] *əfəndim*. London, 6 iyun, 1899, E. J. W. Gibb".

Mister Gibb "*Osmanlı Şeirinin tarixi*" adlı kitabında Məmməd Əmin bəydən və "*Türkcə şeirlər*"dən qısaca həhs edə bilmişsə də, bu kitab 15-ci yüzildən sonra gələn Osmanlı şairlərinə çatmadan müəllif ölmüş olduğundan, Məmməd Əmin bəy və şeirlərini ətraflıca incələyə bilməmişdir. Gibbin kitabında Məmməd Əmin bəyə qədər yazdığı qısa, ancaq qüvvətli qeyd budur: "Bu ilin 1316 (1900) başında Əmin bəyin "Türkcə şeirlər" adlı kiçik bir şeir məcmuəsi çıxdı. Bu kiçik risalədə, türk xalq kütləsinin gerçək dil və duyğusunu ədəbi tərzdə ərz etmək təcrübəsi edilmişdir. Anadolu köylüsünün və əsgər nəfərlərinin ağzına düşən bu kiçik şeirlərlə, türk xalqının

---

[1] Kursiv bizimdir (T. Y.)

sədası, ilk dəfə olaraq ədəbiyyatda eşidilmiş olur.[1]" (Gibb, "A History of the Ottoman Poetry", London, 1900, s.134-135, not.1").

O zamanlar Strasburq Universtiteti professorlarından P. Hornün (P. Horn) "Gesch d.Turkischen Moderne" ("Müasir türk şair və ədəbiyyatçılarının tarixi") adlı əsəri nəşr olundu. Bu yazar da türk şairi haqqında çox təriflər yazır: "Əmin bəy ruhuyla Türkdür; hissləri yeni olmaqla bərabər milliyyətindən əsla ayrılmaq istəmir. Osmanlılığın vətəni olan "Anadoludan bir səs" adlı şeirində böyük bir qürurla: "Mən bir türkəm" deyə hayqırır. Əmin bəy bu mənzuməsi ilə gerçəkdən bir xalq ilahisi ortaya qoymuşdur. Bu ilahidə də "Deutschland, Deutschland über alles"[2] də olduğu kimi hökmdardan bəhs olunmur. Əmin bəyin şeirlərində daima təkrarlanan fikir: "türkün hər şeyi gözəldir və hər şeydən gözəldir" (s. 58-59).[3]

Məşhur şərqşünas Vamberi də Əmin bəyə yazdığı bir məktubda *"Türkcə şeirlər"* şairi kimi qeyrət göstərən şəxslər meydana çıxacaq olurlarsa, türk dilinin "saygı məqamına yetişəcəyini" bildirirdi.

Minorski, *"Əmin bəyin milli şeirləri"* adlı 1903-cü ildə nəşr olunan risaləsində *"Türkcə şeirlər"*in doqquzunu ruscaya çevirdiyi kimi, ön söz olaraq, Əmin bəyin bioqrafiyasını, dilini, dil texnikasını, sənətini, açdığı cığırın yeniliyini xeyli geniş bir şəkildə tədqiq edir və açıqlayır.

Sonra giriş xarakterli məktublardan, xüsusən Rıza Tofiq və Sami bəylərin məktublarından bəzi hissələri tərcümə edir, nəhayət mister Gibbin kitabındakı görüşə tamamilə şərik olduğunu söyləyərək, risaləsini bu sözlərlə bitirir: "Əmin bəyin təmiz dildən istifadə etmək, türkcə şeiri ona uyğun olmayan əruz vəznindən qurtarmaq, xalqı sevmək, səmimi və insaniyyətpərvər mövzular seçmək kimi özünəməxsus və unudulmayacaq xidmətlərini xatırlayaraq, diləyirik ki, türk ədəbiyyatının bu sağlam və təzə qönçəsi tamam açılsın və sevimli şairin çalışması uzun zamanlar davam etsin."[4]

Dərhal və böyük sevinclə əlavə edək ki, rus şərqşünasının arzusu gerçəkləşdi: Əmin bəyin məktəbi genişləndi və özü də şükürlər olsun, hələ içimizdə sağ-salamat çalışıb durur.

Bir az öncə, Əmin bəyin yeni cığırını şərqşünaslarla bərabər ən çox bəyənənlər, Osmanlı dövləti xaricində yaşayan türklərlə Osmanlı Türklərinin tam Avropa təhsil və təlimi görənləridir- demişdim. Gerçəkdən də, *"Türkcə şeirlər"*in nəşr olunmasının ardından, bəlkə ən hərarətli bir məktubla Əmin bəyi təbrik edən İsmayıl bəy Qaspıralı olmuşdur. Türkçülüyün bu möhtərəm əməkdarı, "Sevimli qardaş!", deyə başladığı məktubunda deyir ki:

---

[1] Gibbin mətnindən tərcümədir. Vladimir Minorskinin "Əmin bəyin milli şeirləri" adlı məqaləsindəki rusca tərcüməsindən götürüldü. Minorskinin məqaləsi Moskva Asari-Ətiqə Cəmiyyətinin Şərq Əncüməni Əsərlərinin II cildində, 1903-cü ildə nəşr olunmuşdur.

[2] **"Almaniya, Almaniya hər şeydən yüksəkdə!" (A. K.).**

[3] Minorskinin tərcüməsindən alındı.

[4] Minorski tərcüməsi, s. 24.

“Şeirlərinizin dilindən başqa, fikirləri də İstanbulun “mahtab”dan, “qara saçla” “mavi göz”dən ibarət şeirlərinin hamısından üstündür. Cübbələri qiyamət olan əfəndilərin, bastonları, ceketləri əlamət olan şık bəylərin üsuluna müxalif, sadə və qaba türkcə qələm çəkmək böyük cəsarətdir, ədəbi əsərlər arasına belə məsləkli bir əsər daxil etmək, türk aləminə böyük bir xidmətdir ki, könüldən təbrik edirəm.

Türk aləminə dediyim mübaliğə sanılmasın: mübaliğəni nə sevərim, nə edərim; doğrusudur, çünki şeirlərinizi Ədirnə, Bursa, Ankara, Konya, Ərzurum türkləri anlayıb ləzzət alıb oxuyacaqları kimi, Tiflis, Təbriz, Şirvan, Xorasan, Türküstan, Kaşğar, Dəşti-Qıpçaq, Sibirya, Kazan və Krım türkləri də oxuyacaqlar ki, bu şərəfə Nəfi və Nabi yetə bilmədilər. Qırx-əlli milyonluq və otuz əsrlik bu aləmə ilk dəfə bir qaşıq oğul balını yedirən siz oldunuz ki, sizə şərəf, bizə səadətdir. Təkrar-təkrar təbrik edirəm.”

“İstanbul ədəbiyyatının məsləksiz, sistemsiz davamından və tutuquşu dilindən usanmış, darıxmışdım; şeirləriniz çox böyük təsəlli oldu; bunun üçün də Allah sizdən razı olsun.[1]”

İsmayıl bəy bu məktubunda “Türkcə şeirlər”in bütün türkçülük üçün əhəmiyyətini xüsusilə göstərmişdir.

Qaspıralının dediyi düz çıxdı; Məmməd Əmin bəyin şeirləri bu gün deyilsə dünən bütün türk dünyasında, türk dünyası məktəblərində oxunur və əzbərlənirdi; bu gün də türk dünyasının hər tərəfində Məmməd Əmin bəy “bütün türkçü” şair olaraq tanınır və hörmət görür.

Osmanlı Türkləri arasında Əmin bəyin açdığı yeni cığırı ən çox və ən səmimi alqışlayan tam bir Batı təhsil və təlimi ilə böyümüş Fraşerli Şəmsəddin Sami və Raif Paşazadə Fuad bəylərlə, sistemsiz də olsa, yenə Batı əsərləri ilə beynini doldurmuş doktor Rıza Tofiq bəy oldu. Xristian əxlaqi, ihtilalçı fikirləri dərin bir səmimiyyətlə sevən, acizlərə, zəiflərə qüvvətli bir dost, zülmə, ikiüzlülüyə, zorbalığa bütün ruhu ilə düşmən olan Tofiq Fikrət, Məmməd Əmin bəyin zavallılara, məğlub və zəiflərə acıyaraq onların heç olmasa sözlə olsun, yaralarını sarımağa çalışmasından çox duyğulandı və türk şairini çox səmimi alqışladı.

Şəmsəddin Sami Bəy, “Türkcə şeirlər” haqqında Əmin bəyə yazdığı məktubla kifayətlənməmişdir; 1899-cu il martın birinci günü nəşr olunan *“Sabah”* qəzetində nəşr olunmuş “Ədəbiyyate-müstəqbəlimiz” adlı əhəmiyyətli və böyük məqaləsində, *“Dilimizi sadələşdirəlim, türkcəmizi sadələşdirəlim!”* deyə qarşıya qoyduğu məqsədinin gərəyini və faydalarını uzun-uzadıya anlatdıqdan sonra, məqalənin sonlarında deyir ki: “Öncədən bəri diqqət çəkməkdən, tövsiyyə etməkdən geri durmadığımız və özümüz aça bilmədiyimiz çığır açıldı. Fərqində olmayanları müjdələyirik. “Türkcə şeirlər” adı ilə çox gözəl, xoş bir tərtibatla yayın sahəsinə təqdim olunan bu kitabça hər kəsin diqqətini çəkəcək, bənzəri görülməmiş bir əsərdir. Sahibi Məmməd Əmin bəy

---

[1] Baxçasaraydan, mart 1899 tarixi ilə yazılmışdır.

əfəndi, bu kitaba daxil etdiyi doqquz parça şeiri ilə bu arzu və tövsiyyə etdiyimiz çığırı açdı. Bu kitabçanın nəşri ədəbiyyat tariximizdə böyük bir hadisə kimi qəbul edilməyə layiqdir. Öncəki ilin fikir və çalışmasının məhsulu olub, *bu 1316 (1900) ili yayın sahəsinə daxil olan bu əsər ləfz və şəkil yönü ilə və dil etibarı ilə gələcək ədəbiyyatımızın ilk təməl daşıdır."*[1]

"...Məmməd Əmin bəyin şeirlərində tutduğu yolu hər kəs tamamı ilə təqibə müqtədir ola bilməzsə, yəni o qədər yaza bilməzsə də, hələ bir dəfə ona çalışmalı, hər şeyin türkcəsini aramalı, tapılmazsa, o vaxt çarəsiz ərəbcə və ya farscasını, yəni ən istifadə edilmişini, bilinənini qəbul etməli və işlətməli; ancaq bu qəbildən olan kəlmələri də dilimizin qrammatik qaydalarına uyğunlaşdıraraq işlədib, farsca isim və sifət tərkiblərindən vaz keçməliyik. Bu gün işlətməyə məcbur olacağımız bir ərəbcə və farsca kəlmənin də sabah türkcəsinin tapılması mümkündür; çünki türkcəmiz çox geniş olub, yer üzünün çox önəmli bir qismində danışıldığı halda, hələ toplanmamışdır..."

Şəmsəddin Sami bəyin bu məqaləsi, yalnız "Türkcə şeirlər"in tənqidi olması etibarı ilə deyil, gələcək türk ədəbiyyatının, türk üslubunun dildə türkçülüyün proqramı olması yönündən də çox önəmli və dəyərlidir. 1908-ci il inqilabından sonra Səlanikin "Gənc qələmlər"ində böyük bir vəlvələ, ölçüsüz bir təşəxxüs və iddia ilə ortaya atılan "Yeni lisan" davasının bütün əsaslarının, Şəmsəddin Sami bəyin "Gənc qələmlər"dən doqquz il əvvəl yazdığı bu məqalədə mövcud olduğunu görürük. Və bu əməlin ilk gerçəkləşməsi də Əmin bəyin şeirləridir. "Türkcə şeirlər"in nəşrindən bir az sonra Əmin bəyin bəzi mənzumələri *"Sərvəti-fünun"*da nəşr olundu. "Kibritçi qız"la "Kəsildimi əllərin?" ilk öncə "Sərvəti-fünun"da nəşr olunmuşdur. 1903-cü ildə Məmməd Əmin bəy, Raif Fuad və Rıza Tofiq bəylərlə "Rəsmli qəzetə"ni aldılar; ancaq birinci nüsxəsini belə nəşr etməyə müvəffəq olmadılar. Çünki senzura, üz qabığındakı ulduz və balıq rəsmlərindən şübhələnərək basılmış nüsxələri toplatdı!... Əmin bəy bu basılmış, ancaq yayımlanmamış məcmuəyə "Köydə fırtına" şeirini qoymuşdu.

1904-cü ildə, türk şairi, bəzi mənzumələrini, İzmirdə çıxan "Müqtəbəs" və Səlanikdə çıxan "Çocuq baxçası" dərgilərində nəşr etdirdi; İstanbula nisbətən vilayətlərin senzurası daha az şiddətli olduğundan Əmin bəy şeirlərində daha sərbəst ola bilərdi. "Müqtəbəs"də "Həyat qovğası", "Çocuq baxçası"nda isə "Ölü qafası", "Zavallılar", "Zavallı qayıqçı", "Ciftçilik", "Ey gənc ciftçi", "Çəkic altında"mənzumələri nəşr olundu.[2]

8 sentyabr 1901 tarixli "Çocuq baxçası" dərgisində filosof Rıza Tofiq bəyə ithaf edilmiş "Ölü qafası" və filosofun "Türklərin möhtərəm şairi Məmməd Əmin bəyə" xitabən yazılmış uzun bir məktubu bir yerdə nəşr olunmuşdu. Bu məktub mini-mini "Çocuq baxçası"nı tamam

---

[1] Kursiv bizimdir. (A. Y.)

[2] Məşrutiyyətdən sonra "Türkcə şeirlər" bir araya toplanaraq "Türk sazı" adlı böyük bir kitab oldu. Mehmed Emin bəy, "Türk sazı", "Türk yurdu" kitabları, yayımlayan: İbrahim Hilmi, İstanbul, nəşr tarixi göstərilməmişdir (1913 olmalıdır), 268 səhifə.

doldurmuşdu. Filosof doktor hər zaman olduğu kimi, sağa-sola sarparaq türk şairinin əsərlərini tərifləyirdi. Bəzən milli şairimizi kitabı kəşf edən Nansenə bənzədərək onun kimi "kütbi-əməlin yolunu buldunuz"- deyir. Bəzən əskidən türkcə yazmağa çalışan şairlərlə qarşılaşdıraraq "o yardımların tamam nəticəsiz və faydasız qaldığını" söyləyir və "anlamışsınız ki, yalnız əruz vəznini və ya ərəbcə kəlmələri, bənzətmələr və əski təsəvvürlərlə bərabər, onları ödəməyə vasitə olan sifət tərkiblərini, digər tərkibləri tərk etməklə iş bitməyəcək; anlamışsınız ki, türkcə şeir yazmaq bu yabançılıqların hamısından qələmini qurtarmaq, zehnini təmizləməklə bərabər türklüyün fikri özgünlüklərini və vicdani özəlliklərini, zövqünə, keyfinə, ehtiyacına və inancına görə yazmaqdır. Artıq olaraq o kimi xüsuslardan təşkil olunan bu qövmi mizaci sevmək, həm səmimiyyətlə sevməkdir.

Məhz yaradılışdan olan şairlik qabiliyyətiniz, çətinlikləri yenən şəxsi qüdrətiniz bir yana buraxılırsa, sizin böyük başarınız bu qədər çətin, bu qədər müxtəlif səbəblərə dayanır olsa gərəkdir" -deyə türk şairinin məsləkində tamamilə başarılı olduğunu açıqlayırdı.

Nəhayət, "bu yol çıqmaz sokakdır, neçələr girdi, peşimanlıqla döndü; ya da bu üslubla ancaq adi şeylər, köy həyatına aid kiçik şeirlər yazıla bilər, ancaq elmi bir məsələ ifadə edilə bilməz" kimi, Məmməd Əmin bəyə yönələn etirazları sayaraq rədd edirdi: "Öylə parlaq, öylə böyük mənzumələrlə davanın əksini isbat etdiniz ki, altı yüz illik ədəbiyyatımızda bir nümunə də göstərmək asan deyildir deməkdə pərva etməm...." deyirdi. Və bu davasını isbat üçün, şairin "Bizə deyirlər ki", "Elm", "Sənət", "Para", "Bir dəliqanlıya", "Yemək və yenmək", "Yavrumuzu çoxaldalım" və nəhayət "Ölü qafası" şeirlərini göstərirdi. Və özünə ithaf edilən bu fəlsəfi şeirin,

Guya ki bir qasırğa var; bunu ona, onu buna qatıyor;

Bir əl var ki çürük kəfən parçasını çiçək yapıb atıyor.

-parçasını Ömər Xəyyamın bu mövzuda yazılmış rübailərindən belə üstün tuturdu. Doktorun bu məktubu, "Sərvəti-fünun" ədəbiyyatçılarının ikinci cərgəsində gələn gənc bir subayın, Ömər Naci bəyin cavabını çəkdi. "*Çocuq baxçası*"nın bir sonrakı nüsxəsində (15 eylül) "Evzani-şeiriyyəmizə dair" başlıqlı və Ö. Naci imzalı bu qısa cavab, sevgili ustadlarına toxunulmuş olmasından üzgün, qeyrətli, həyəcanlı və istedadlı bir gənc öyrəncinin müdafiə hücumudur.

Başdan-başa doldurulmuş ərəbcə, əcəmcə kəlmələr və tərkiblərlə yenilib udula bilməyəcək qədər şəkərləşmiş bir məktubda gənc şairin iki davası var: birinci əruz vəzni barmaq hesabına nisbətən "daha ruh oxşayıcı və tannan (çınlayan), düşüncə və hissiyyatı təbliğ və hekayə etməkdə daha həssas və qıvraq, daha nalan, daha çəkili, daha ahənglidir; ikincisi "Türkcə şeirlər", doktorun iddia etdiyi kimi, hər kəs tərəfindən oxunub anlaşıla bilməz: "Ədəbiyyat bütün vücud və şəkillərinə, bütün məqsədlərinə və mövzusuna baxmayaraq, yenə bunu anlayanların ixtisas hissəsinə daxil qalacaqdır."

Bu şəkildə Rıza Tofiq bəylə Mülazim Ömər Naci arasında başlayan ədəbi və dilçilik qovğası “Çocuq baxçası”nda iki aya qədər davam etdi. Və bütün belə qovğalar kimi get-gedə mövzudan uzaqlaşdı; qol-budaq atdı; ilk olaraq dadlı-dadlı başlayan şəxsi ima və təlmihlər, söz uzandıqca acılaşmağa üz qoydu, hətta acılandı. Qovğa qızışınca “Sərvəti-fünun”çuların məşhur qovğa pəhləvanı Hüseyn Cahid bəy belə sözə qarışdı, şair və doktorla istehza etməyə başladı; bu zaman başqa bir zabit yazar Raif Nəcdət bəy türkçülərin imdadına qoşdu.

Qısacası, yeni məslək ətrafında xeyli cəngləşildi, ədəbi savaşların hamısında olduğu kimi bu savaşda da iki tərəfdən heç birisi geri çəkilmədi; yerlərini qorudular.

Milli şairimizin özü də qovğaya sözlə deyil, işlə qatıldı: “Çocuq baxçası”nın bir çox səhifəsi şeirlərinə dair məktub və cavablarla dolduğu halda, o da eyni dərgidə “Türkcə şeirlər”ini yayımlamağa davam edirdi; “Ömür yolunda, yaxud yolçu”, “Sokak qapısı önündə”, “Çəkic altında”, “İmtahan”, “Zavallı qayıqçı”, “Günahkar”, “Yavrumuzu çoxaldalım!” mənzumələri ilə “İxtiyar dəyirmançı” mənsurəsi o mübahisələrin getdiyi aylarda nəşr olundu.

O zamanlar türkçülük ədəbiyyatının nəzəriyyəçilərinə başçılıq edən doktor Rıza Tofiq, yaxşı bir taktika yürütməməsinə baxmayaraq savaşda “Sərvəti-fünun”çuların qələbə çaldıqları iddia edilə bilməz. Ömər Naci bəy hədsiz qeyrətlə məktublarını getdikcə uzun yazmağa, yazdıqca mürəkkəbinə daha çox zəhər qatmağa çalışdısa da, “Sərvəti-fünun” ədəbiyyatının həqiqi öndə gələnləri- hər yerdə və daima qovğa arayan “Qovğalarım” yazarı xaric, obyektiv qaldılar; doğrusu Tofiq Fikrət mərhum əvvəldən bəri Məmməd Əmin bəyin açdığı yeni cığıra tərəfdar idi, bir neçə ildir türk şairini təşviq edirdi:

1900 və 1901-ci illərdə Məmməd Əmin bəyə yazdığı iki məktub bu böyük qəlbli və böyük istedadlı Osmanlı şairinin “Türkcə şeirlər”ə baxışını açıq, kəskin şəkildə göstərir: “‘Sərvəti-fünun’un bu həftəki nüsxəsi ‘Kəsildimi əllərin?’ bədiyyəsiylə (bərabəri, bənzəri olmayan bir şey yaradan şeir ilə) süslənmiş olaraq çıxdı. Bu nəfis şeir üçün sevgili əllərini təkrar-təkrar öpürəm. Şeirin bu əsərdə məncə xəyalın qayəsi olan təsiredici bir mərtəbəyə çıxmış. Nəşri ‘Sərvəti-fünun’dan çəkildiyim bir zamana təsadüf etməsə idi, qəzetədə bir ərzi-təşəkkür edərdim. İndi yalnız ədəbiyyat adına bu ciddi nəfis əsərlərin davamını xahiş edirəm...”[1]

[1] 25 mart 1317 (1901) tarixli olan bu məktub, Tofiq Fikrətin o zamanlardakı ruhi halini, acı hisslərini ifadə etməsi və Məmməd Əmin bəyə çox güvənən yaxın, səmimi bir dost olduğunu göstərməsi baxımından da diqqətə layiqdir. “Sevgili qardaşım!” səmimi xitabı ilə başlayan bu məktubda zavallı şair “Halşünas bir vicdan qarşısında daim fışqırmaya hazır olan uğursuz üzüntülərini sakit edə bilməmək zəifliyindən” dolayı cavabda gecikdiyini söylədikdən sonra belə davam edir: “Bildiklərimin, görüşdüklərimin yanında artıq çəkilməz olduğumu, bu parlaq zəkalılar önündə mənfəətini bilməz, kar və zərərini tanımaz bir cocuq, bir xəstə, bir divanədən başqa heç bir münasibət görmədiyimi gördükcə, gərçi kəndi hesabıma məmnun, ancaq onların hesabına acı hiss edirəm. Bunun üçün məni ayıblamayacaq qəlbləri tapınca, dərdimi tökmək, bütün acizliyimlə, bütün cocuqluğumla, bütün xəstəliyimlə, bütün divanəliyimlə ağlamaq, hıçqırmaq istəyirəm. Sən o qəlblərdən biri olduğun üçün... Ah, Əmin bəy qardaşım, belə hər dəqiqə zəhərlənərək yaşamaq çox çətin bir şey!” (Bu məktubun əsli Rövşən Əşrəf bəydədir. Mən kopyasından aldım.-A. Y.)

İkinci məktubunda, Əmin bəyin “Zavallılar” adlı şeirini oxuyarkən, Fikrətin evində meydana gələn mənzərəni təsvir edir: “Dinləyənlərin içində heç birisi səsinizə yabançı qalmırdı. Hətta kiçik Haluk belə... mənzumənizin hər cümləsini, hər kəlməsini əzbər edirlər, sözlərinizin heç birini yaddan çıxarmırlar, fikrinizlə sanki əl-ələ yürüyürdülər...”

“Bitirdiyiniz zaman Xalid Ziya bəy barmaqlarının arasında tutub küllənən siqarasını silkələdi. Hikmət yerində düzəldi, mən başarınızı təbrik üçün nə deyəcəyimi şaşıraraq, belə vəziyyətlərdə daima etdiyim kimi şaşkın bir “Əvət!”lə gülümsədim, bayaqdan bəri çənəsi əllərinin içində, saçları çiyinlərində, gözləri dodaqlarınızda, tilsimlənmiş və şaşırmış dinləyən Haluk, yalnız O, vəziyyətini dəyişdirmədi. Hamımız bir gözəl şeirin dinləyicisi olmaq cəhətdən ortaqdıq.”

“...Çocuq yerindən qalxıb yanıma gəldi, yavaşca, ancaq həyəcanlı, dedi ki: -“Bu nə gözəl şeir, baba!”

İştə uğurunuza ən böyük təbrik, əzizim!...”

“Mən öz hesabıma indiyə qədər yazdıqlarımdan heç birini bu qədər açıq, bu qədər qüvvətli bir uğur nişanəsinə layiq görmədiyim üçün sizə qibtə edirəm...”

“...Tamamilə qaneyəm ki, mən şeirdə bir yaşama qayəsi arayanlardanım: şeiri bir xəyal oyuncağı sayanlara qatıla bilmərəm.”

“..Mənə qalırsa, uğur qazanmağınızın səbəbi yalnız vəzn deyil, mövzu seçimi, təsəvvür və duyğulanma tövrü, fikirlərin təbliği, ifadə saflığı, qısası- bütün qüvvətiylə söz və məna uyğunluğu.”

Tofiq Fikrət bəy, bir çox dəyərli məktubunda Osmanlı şairlərinin son zamanlarda əruz vəzninə verdikləri xəfiflik və çevikliyi açıqladıqdan sonra, belə bir sual ortaya atır: “Heca vəzni, milli vəzn deyilən sadə vəzn ilə əruz vəznlərindən hansına üstünlük verməli? ...Bu bəhsdə ən doğrusu Xalid Ziya bəyin dediyidir- üstünlük verməyə ehtiyac yoxdur, əruz vəznləri, heca vəzni, hansı olursa olsun, indi ki danışdığımız dilə uyğun gəlir, ikisini də işlədərik. Hünər onları yararlı və təsirli olaraq istifadə edə bilməkdədir.”[1]

Rıza Tofiq-Ömər Naci qovğasından sonra tərəflərin sözlərindən çox şairin şeirləri ilə bir nöqtə tamam anlaşılmış oldu: Əmin bəy yeni bir ədəbi məslək qurur; bu məsləkin ən bariz cəhəti, türk dilinin, türk qaydalarının, türk üslubunun, türk ahənginin, türk vəzninin, türk həyatının Osmanlı lisanı deyilən qarışıq strukturda bağımsızlıq və hakimiyyətini təmin etməyə çalışmasıdır; deyilə bilər ki, Osmanlı imperatorluğu dağılarkən türklüyün siyasət sahəsində yaratdığı böyük hadisəyə bənzər bir hadisə, o zamanlar Yunanla savaş olarkən, Osmanlı sahəsində meydana gəlmişdir: *Əmin bəyin şeirləri, şüurlu və ya şüursuz, türk dilinin bağımsızlıq və hakimiyyət bəyannamələridir.*

---

[1] Burada yalnız bəzi qisimlərini verə bildiyimiz bu uzun məktub, Hisar, 8 Qanuni sani 1318 (21 ocaq 1903) tarixlidir. Tofiq Fikrət bəyin sənət və üslub anlayışını ifadə etməsi baxımından çox önəmli olan bu məktubun hamısı nəşr olunmalıdır. Biz burada verdiyimiz hissələri əslindən kopya etdik (A. Y.).

Türk dili, bağımsızlıq və hakimiyyətini, İstanbulun əsil türk millətindən ayrı, qarışıq, xudbin, qayəsiz, gündəlik şəxsi faydalarından maddi və qaba zövqlərindən başqa bir şey düşünməyən, özlərini bir növ aristokrat sayan tüfeyli sosial bir zümrəyə dayanaraq qura bilməzdi. Milli şair, peyğəmbəranə bir instinktlə türk dilinin bağımsızlıq və hakimiyyətini təmin etmənin türk xalqına dayanmaqla mümkün ola biləcəyini anladı. Bütün mövzuları türk xalqının həyatıdır; acı, iztirab və qəhrəmanlıqla dolu Anadolu köylüsünün həyatıdır; Məmməd Əmin bəyin ilk şeirləri, yaşadığı günlərdə Anadolu köylüsünün həyatından alınma ardı-ardına gələn başlıqlardan ibarət olan bir milli dastandır. Bu milli dastan tamam demokratikdir; füqəranın, zavallıların və iztirab çəkənlərin yaralarını açıb göstərir. Əmin bəy İstanbul və saray şairləri kimi, keyf və əyləncə şərqiləri yazmaq, söz oynatmaqla istedadını və zamanını hədər etmək istəmir; onun şeirləri mərhəmət və şəfqət dolu, xalq və insaniyyəti sevən zavallı türklərin yaralarına məlhəm arayan birər fəryad, birər yardım istəmədir. O da Tofiq Fikrət kimi şeirdə bir yaşama qayəsi, bir sosial məqsəd arayır, "şeiri bir xəyal oyuncağı saymır." Sonradan yazdığı "Mənim şeirlərim" mənzuməsi bu qayəsini nə yaxşı anladır:

Zavallı mən, əlimdəki bu üçtelli saz ilə,  
Millətimin fəlakətli həyatını söyləyim,  
Dərtlilərin göz yaşını çevrəm ilə siləyim!...

Belə düşünən, belə duyan bir adam, millətinin fəlakətli həyatını qurmuş və davam etdirmiş qurumlara təbii sevgi və hörmət göstərməz.

Əmin bəy Osmanlı sosial quruluşunun zirvəsini meydana gətirən padşaha, onu əhatə edən dəyərsiz məxluqlara, İstanbulu dolduran saray və hökumət adamlarına, onlara çatıb keyf və səfasına baxan saxta aydınlara və ümumiyyətlə, zülm və təzyiqə qaynaq və ya alət olanlara qarşı dərin, israrlı bir kinlə, düşmənçiliklə doludur. Hər şeirində bu kin və düşmənçiliyi hiss edilə bilər. Əmin bəy yalnız demokrat deyildir, köylülərə köy başçısının, məhəlli bəylərin, İstanbul əfəndilərinin rəva gördüyü zülmləri təsvir edən şeirlərinə bir inqilabçı ruhu belə üfləyə bilmişdir. *"Türkcə şeirlər"* qaranlıq, acılı mənzərə və kədərlərlə dolu olmaqla bərabər türk şairi ümidsiz və bədbin deyildir. O, bütün bu sosial və siyasi haqsızlıqların önünü ala biləcək bir qüvvətə inanır ki, o qüvvət də *"elm"*dir. Məmməd Əmin bəy islahatdan, intibahdan və XVIII yüzil fəlsəfəsindən aldığı məhdud və önəmli duyğularla *elmin* və müəyyən dərəcəyə qədər *hürriyyətin* bütün yaralara sarğı ola biləcəyinə inanır. 1900 tarixlərində özünü göstərən bu fikir və duyğusu getdikcə yetkinləşmişdir, inqilabı təqib edən günlərdə şeirlərini toplayıb basdığı kitabında, *"Türk sazı"*nda "Yaralar" bölümündən sonra, "Sarğılar" qismi gəlir və bu qisim Qutenberq, Lüter, Kolumb ilə başlayır ki, şair bunlara "müjdəçilər" adını verməkdədir.

Elmə, hürriyyətə iman, milli şairi 1908 inqilabından öncə “Gənc türklər”ə, “İttihad və tərəqqi”çilərə yaxınlaşdırmışdı. Hətta bir aralıq şair, yaradılış və xasiyyətini nəzərə almayaraq devrimçi bir təşkilata üzv oldu; “İttihad və tərəqqi” firqəsi ilə əlaqə qurdu. Bəlkə şeirlərində seçdiyi mövzuların məna və qayələrinin anlaşılmasından, bəlkə devrimçi fikir və hərəkətlərə meylinin sezilməsindən, hər halda vəzifəsinə aid olmayan səbəblərdən dolayı, 1907-ci ildə, yəni inqilabdan bir il öncə, Rüsumat Evraq müdiri Məmməd Əmin bəy, Ərzurum Rüsumat Nazirliyinə təyin olunaraq paytaxtdan uzaqlaşdırıldı; 1908-ci il inqilabı meydana gəldiyi zaman, milli şairimiz Ərzurumda idi.

Məmməd Əmin bəyin inqilabdan sonrakı fəaliyyətindən irəlidə bəhs edəcəyik... İndi bir nöqtənin daha açıqlanmasını da gərəkli sayırıq: Məmməd Əmin bəy *“Türkcə şeirlər”*ini yazmağa başlamadan öncə, Nəcib Asim, Vələd Çələbi və Şəmsəddin Sami bəylər kimi türkçülüyü xüsusən dil, filologiya və tarix sahələrində qurmağa, yaymağa çalışan şəxslər var idi; bunların fikirləri təxminən eyni olmaqla bərabər, bəlkə o zamanın siyasi şərtlərindən dolayı müəyyən bir təşkilat halına keçməmişdilər. Məmməd Əmin və Hikmət bəylərlə türkçülük ədəbiyyat sahəsinə keçmiş oldu. Ancaq bunlar da inqilaba qədər ədəbiyyatda türkçülük məsləkini üzvləri müəyyən və dayanışma içində təşkilati bir məktəb halına gətirə bilmədilər. Məmməd Əmin bəyin ədəbiyyatda türkçülük məsləkini, bu yeni məktəbi qurduğuna şübhə yoxdur; hətta Məmməd Əmin bəylə fikir arkadaşları Raif Fuad və Rıza Tofiq bəylərin yeni məsləki təşkilatlandırmaq üçün bir dərgi çıxarmağa girişdikləri də bir həqiqətdir; ancaq bu dərginin bir nüsxəsinin belə nəşr olana bilmədiyini yuxarıda anlatmışdıq. Buna görə, inqilaba qədər, nə dil, nə tarix, nə də ədəbiyyat sahələrində bir türkçülük təşkilatının meydana gəlmədiyini görmüş və dəqiqləşdirmiş oluruq.

## SİYASİ TÜRKÇÜLƏR

Osmanlı İmperatorluğu içində türkçülük axımının Yunan Savaşı öncəsi və sonrasında nə qədər inkişaf etmiş olduğunu gördük. Eyni zamanda yenə Osmanlı türklüyü kültürünə mənsub bir-iki adamın imperatorluq sərhədləri xaricində türkçülük axımına xidmət edən fəaliyyətlərini göstərməliyik. Bunlar türkçülüklə xüsusən siyasət sahəsində məşğul olmuşdular.

Haqqında danışmaq istədiyim şəxsiyyətlər Tunalı Hilmi ilə Akçuraoğlu Yusuf və Hüseynzadə Əli bəydir.

### Tunalı Hilmi

Həyatının son dövrlərində Böyük Millət Məclisində Zonquldak millət vəkili olan Tunalı Hilmi bəy, Tibbiyyə məktəbindən qaçıb Avropada “Gənc türk” kimi yayıma başlar-başlamaz özünün klassik Jontürklərdən bir az başqa cür düşünüb, başqa cür yazdığını göstərdi: Avropadakı “Gənc türklər”, İstanbul bəy və paşalarından, bəy və paşazadələrindən ibarət idi; hamısı Osmanlı birliyini əsas bir ideya sayan məşrutiyyətçi liberallar idi; sanki bir əsrdən bəri Avropanı bürüyən milliyyətçilik və xalqçılıq cərəyanlarını ağıllı-başlı anlaya bilməmiş, hələ Osmanlı ölkəsində bu axımların meydana gətirdiyi təsirləri lazımi səviyyədə qavraya bilməmiş kimsələrdi. “Ənasir” təbiri ilə gerçək dəyərlərini əksiltmək istədikləri “millət”lərin, “birliyinə” və bu “birlik” sayəsində “Osmanlı milləti” adını verdikləri xəyali varlığın, “irəliləyəcəyinə” sadəliklə inanırdılar.

Tunalı Hilmi bəy bu əsas inanclarda, başlanğıcda arkadaşlarından ayrılmaz, o da siyasətən Osmanlıçıdır; O da Midhət Paşa qanuni-əsasisinin tətbiq olunmasını istəyən məşrutiyyətçi və hürriyyətçidir; o da ünsürlərin birləşməsi sayəsində, “Osmanlı milləti”nin irəliləyəcəyinə inananlardandır... Ancaq, ilk yazılarından etibarən xalqa, Osmanlı ölkəsində xalqın böyük əksəriyyəti olan köylüyə çox önəm verir; və yazılarının çoxunu xalqa, köylüyə xitabən yazır. Onların dərdlərini az-çox bilir və o dərdləri qurdalayaraq xalqı, köylüləri mövcud rejim, hökumət və hökmdar əleyhinə hərəkət etdirmək istəyir. Tunalının ilk yazılarından yalnız liberal və məşrutiyyətçi deyil, liberal və məşrutiyyətçi olmaqla bərabər, xalqçı, demokrat, Tuna ətrafında geniş yayılmış bir deyimlə, “parodonyak” olduğunu görürük. Bu siyasi, hətta sosial fikir kəlmələrinə, üslubuna, ədasına və risalələrinin ad və şəklinə təsir etmişdir. Xalqa xitab edərkən xalqın anlamadığı ərəbcə və əcəmcə kəlmələrdən, tərkiblərdən çəkinir, xalq ifadələrini, ata sözlərini çox işlədir, üslubu -pis və yanlış bir deyimlə- “amiyanədir” (xalq sayağıdır), risalələrinə əksərən xalqın məscidlərində dinləməyə alışdığı “xütbə” tərzini və adını verir. Xütbələrdə olduğu kimi anlatmadan çox sayğı və qorxu duyğusunu təlqin üçün ayə və hədislər söyləyir.

Tunalının siyasi xalqçılığı dildə "xalqçılığını" və -türkcə yazdığı üçün- "türkçülüyünü" doğurdu. Yenə o xalqçılıqdır ki, Tunalının "milliyyət" məsələlərinə, başqa arkadaşlarından artıq önəm və dəyər verməsinə səbəb oldu. Başda müxtəlif Osmanlı ünsürlərinə öz dillərində, yəni arnavudca, ərəbcə, bolqarca, rumca və ermənicə v.ə.b. xitabələrdə bulunmaq istəyərək, bəzi xütbələrini tərcümə də etdirdi; ancaq ona qulaq asıb dinləyənlərin sadəcə türk olduğunu anlayınca "ünsürlərin birləşməsi" xəyalından uzaqlaşmağa başladı, nəhayət hadisələrin inkişafı ilə siyasi türkçülüyə qədər irəlilədi. Fəqət Tunalı bu son yetkinləşmə mərhələsinə məşrutiyyətin elanından bir xeyli zaman sonra yetişə bilmişdir. Bizcə, Hilmi bəyin özünəməxsus xüsusiyyəti xalqçılığıdır, bu xalqçılıqda türkçülük təbii olaraq vardır. Ancaq Tunalı özü belə, çox güman ki, bunun çox fərqində deyildi.

Tunalının türkçülüyü sonradan hadisələrin inkişafı ilə ortaya çıxdı və yetkinləşdi...[1] və Ankarada coşğun və artıq həyəcanlı bir hal aldı.[2]

---

[1] Məmiş Çavuş, "Mən bu məclisə girməliyəm", "İkaz" mətbəəsi, Ankara. 1337 (1921), s. 13.

[2] Tunalı Hilmi bəy, əski Tuna vilayətinin Əski Cuma qəsəbəsində, avqust 1871-ci il tarixində doğulmuşdur. Kantarçıoğullarından İsmayıl ağanın oğlu Hilmi 6 yaşında mühacir oldu. Ailəsi ilə dolaşdığı Anadolunun müxtəlif şəhərlərində ilk və orta təhsilini tamamladıqdan sonra, Kuleli Tibbiyyə Edadisinə yazıldı. Gülhanə Tibbiyyəsinin IX sinfində ikən "Gənc türklük" fikri axımına qapılaraq 1896-da İsveçrəyə qaçdı və orada nəşrə, siyasi fəaliyyətə başladı. Bir xeyli macəradan sonra 1902-də Qahirəyə yerləşdi. Məşrutiyyətin elanından sonra İstanbula döndü. Məşrutiyyət hökuməti Tunalı Hilmi bəyi qaimməqamlıqlarda və Mühacirin Müdiriyyəti Sevqiyyatı Xariciyyə məmurluğunda vəzifə ilə təmin etdi. Mütarikə dövründə İstanbul Məclise-Məbusanına Ereğlidən millət vəkili seçildi. Qazinin dəvəti ilə Ankaraya gəlib Böyük Millət Məclisinə üzv oldu. İkinci və üçüncü Böyük Millət Məclislərinə Cümhuriyyət Xalq Firqəsi tərəfindən Zonquldak millət vəkili seçildi. Məclisdə Tunalının coşğun səsi daima türkçülük və xalqçılıq uğrunda yüksəlməkdə idi. 1928-ci il iyulun 24-də İstanbulda öldü. Tunalının başlıca əsərləri 11 ədəd xütbəsi ilə, "Məmiş Çavuş" pyesidir. Bir neçə parçaya bölünən bu pyes mənzumdur. Məmiş Çavuş türk köylüsünü təmsil edən bir qəhrəmandır.
Tunalı Hilmi haqqında baxın: Yaqub Qədri "Bir qoca çocuğun ölümünə dair", "Milliyyət", 6 avqust, 1928.

**Akçuraoğlu Yusuf**

Akçuraoğlu Yusufun bir az şüurlu türkçülüyü Hərbiyyə Məktəbi sıralarından başlayır. O zamanlar, yəni Yunan Hərbi öncəsində Nəcib Asim bəylərin, Vələd Çələbi Əfəndilərin, Bursalı Tahir bəylərin türkçülüyə aid risalə və məqalələri nəşr olunmaqda idi; İsmayıl bəy Qaspıralının "Tərcüman"ı da bir ara İstanbula gəlib dağılırdı. Akçuraoğlunun bu yazılardan fikir aldığı qətidir. Bu təsirlərə bir növ əski türklük, Orta Asiya türklüyü vətən sevgisi, həsrəti də əlavə edilməlidir. Akçura ailəsinin kökü və bağları, Yusufun hələ 10-12 yaşında ikən Orta Asiya türklüyünün bir köşəsini, Başqırdıstan bozqırlarını görüb orada bir az çadır həyatı yaşaması, bir az qımız içməsi, bu yurd həsrətini bəlkə açıqlaya bilər.

Akçura ailəsi, Quzey türklüyünün əski ailələrindədir. Bütün aristokrat ailələr kimi Akçuraoğlular da baba və dədələrini 400 il əvvələ qədər bilməm neçə göbək sayar dururlar. Yusufun atası böyük bir çuxa fabrikası sahibi, olduqca zəngin Həsən bəy adlı bir fabrikaçıdır. Anası Kazanın əski və məşhur bir burjua ailəsi olan Yunusoğlularından Bibi Qəmər Banu xanımdır. Yusuf, 1879-cu il qanuni-əvvəlinin (aralığın) ikinci günü Volqa sahilindəki Simbirsk (bu günkü Ulyanovsk) şəhərində doğuldu. Yusuf hələ iki yaşında ikən atasını itirdi və 7 yaşını tamamladıqdan sonra anası ilə bərabər İstanbula gəldi; və İstanbulda əlifbadan başlayaraq bütün təhsil mərhələlərini tamamladıqdan sonra, 1897-ci ildə Hərbiyyə Məktəbindən Ərkani-Hərbiyyə siniflərinə ayrıldı.

Akçuraoğlu hələ məktəbdə ikən yazarlığa həvəs etmişdi. İlk basılmış məqaləsi türklüyün iki qolunu bir-birinə tanıtmaq yolunda yazdığı "Şəhabəddin Mərcani" bioqrafiyasıdır. 1897-ci ildə, İstanbulun *"Məlumat"* dərgisində nəşr olunan bu məqalə Quzey türklüyünün ən ünlü alimlərindən, quzeydə dini yenilik, milli oyanış hərəkatının ilk öndərlərindən yuxarıda adı keçən Şəhabəddin Həzrətin düşüncə və çalışmalarını və bu şəkildə Quzey türklüyünün irfan səviyyəsini, fikir hərəkatlarını, güneydəki qardaşlarına anlatmaq məqsədi ilə yazılmışdır.[1] Yusuf, "Şəhabəddin Həzrət" bioqrafiyası ilə bərabər Quzeydə milli fikir qurucularından və çağdaş mədəniyyətə qatılma tərəfdarlarından Qəyyum Nasirinin bioqrafiyasını da yazıb eyni dərgiyə vermişsə də, bu ikinci məqalə nəşr olunub yayımlanmamışdır.

Bu zaman Akçuraoğlu Yusuf tətil aylarını, qohumlarının yaşadığı Kazan, Simbirsk şəhər və köylərində keçirərək quzey türklüyünün həyat və fikirlərini yaxından izləməyə imkan tapırdı. Və yol üzərində olan Krımın Baxçasarayına gedərək eniştəsi İsmayıl Qaspıralını ziyarət etməklə ondan feyz alırdı.

---

[1] Şəkilli "Məlumat" qəzetəsinin c. XXIII, no. 69, 20 qanuni-əvvəl 1312 (2 ocak 1897) tarixli və nömrəli nüsxəsində həzrətin bir rəsmi ilə bərabər yayınlanmışdır. Eyni məqalə Kazanda həzrətin doğumunun yüzüncü ildönümü münasibəti ilə nəşr olunan "Mərcani" adlı böyük kitaba da daxil edilmişdir. "Mərcani", Maarif mətbəəsi, Kazan, 1333 (1917), s. 422.

Əmilərindən Simbirskdə yaşayan Akçuraoğlu İbrahim bəy, bir çox Batı dili ilə əski və yeni türkcəyə vaqif, uyğurcanı oxuyub yaza bilən araşdırmaçı bir şəxs idi. Yusuf İbrahim bəyi və zəngin kitabxanasını ziyarət edərək əmisinin türk aləminə, türklüyə aid söhbətlərindən yararlanırdı. Şəxsən Şəhabəddin Həzrət ilə Qəyyum Nasirini də ziyarət etmişdi. Məhz haqqında danışdığımız iki bioqrafiya, bu səyahətlərindən və bu ziyarətlərdən sonra qələmə alınmışdı.

Yusuf Hərbiyyənin ikinci sinfində ikən, "Gənc türklük" düşüncələrinə qatılma və xidmət etmə töhməti ilə 45 gün pranqaya (ayaqlarına zəncir vurularaq zindanda saxlanma) məhkum edildi. Zindandan çıxarıldığı zaman Hərbiyyə Məktəbi ikinci naziri Rıza Paşa ona ancaq sinfin ən çalışqanlarından olduğunu (sinfin dördüncüsü idi) diqqətə alaraq lütfkar davrandıqlarını və bu yolda ikinci bir hərəkəti sezilirsə, mütləqa uzaqlaşdırılacağını bildirmişdi.

Ərkani-Hərbiyyə sinfinə ayrılmasından bir neçə ay sonra təkrar tutularaq o zamanlar İstanbulun bütün aydın və hürriyyətsevər gəncliyini qorxudan Taşkışla Divani-hərbinə göndərildi. Yusufun sinif yoldaşlarından bu gün Türkiyə Cümhuriyyətinin London elçisi olan Əhməd Fərid (Tək) bəy də (sinfin birincisi idi) Divani-Hərbə göndərilənlər içində idi. Divani-Hərb, heç bir ciddi səbəb olmadığı halda, hər iki Ərkani-Hərbiyyə ikinci mülazimini əsgəri məsləkdən çıxarmağa və Yusufu ömür boyu qalabəndliyə (qala içində yaşamağa) məhkum etdi!...

Taşkışla Divane-Hərbi məhkumları II Əbdülhəmidin bir əmri ilə məhkumiyyət dərəcəsinə baxılmadan hamısı Fizana göndərilmək üzrə Trablüsqərbə göndərildilər. Ancaq 84 kişinin Fizana göndərilməsinə yetəcək pulun Trablüsqərb Vilayəte-Cəliləsi xəzinəsində tapılmamasına görə, bütün sürgünlər Trablüsqərb qalasının əski qəsrində həbs olundular. Qismən yerin üstündə bir əsgər koğuşunda, qismən yerin altında bir növ zindanda keçən bu həbsdən, Avropadakı "Gənc türklər"in bir zümrəsi ilə Osmanlı sultanı arasında bağlanan müqavilə şərtlərindən birinin tətbiq edilməsi üzündən qurtara bildilər. Heç olmasa, şəhər içində hərəkət sərbəstliyinə qovuşan Akçuraoğlu Firqə Ərkani-Hərbiyyəsinə qatılaraq, Ərkani-Hərbiyyə ikinci mülazimi rütbə və məmuriyyəti ilə bir müddət Ərkani-Hərbiyyə Yazı İşləri idarəsində və livalarda (sancaqlarda) müəllimlik vəzifəsində çalışdıqdan sonra, arkadaşı Fərid bəylə bərabər kiçik bir Malta qayığı içində Trablüsdən qaçaraq Fransaya Parisə getdi.

Parisdə ilk görüşdüyü *türk milliyyətçilərindən Doktor Şərafəddin Məğmumi mərhum,* ona Osmanlı siyasətinin çürüklüyündən, müxtəlif ünsürlərin anlaşmasının mümkün olmamasından, türk milliyyətçiliyindən başqa heç bir sağlam fikir olmadığından, Batılıların ümumiyyətlə Doğu və türk düşmənliklərindən, mədənilərin dillərinə doladıqları ədalət və insaniyyət sözlərinə inanmanın tam bir axmaqlıq olacağından və bütün bu gerçəkləri ona Parisdəki həyatı və müşahidələrinin təlqin etdiyindən bəhs etmişdir. Doktor Şərafəddin Məğmuminin bu sözlərinin milliyyətçiliyinin izləri

beynində gerçəkdən mövcud olan Akçuraoğluna çox dərin bir təsir göstərdiyini bu gün də xatırlayıram.

Əhməd Fərid bəylə Yusuf vaxt keçirmədən "Sərbəst Siyasi Elmlər Məktəbi"nə öyrənci olaraq qeyd olundular. O zamanlar (1899) Boutmi, Albert Sorel, Funk Brentano, Anatole Leroy-Beaulieu, Renouvier, Levy Bruhl kimi Fransanın ünlü alimlərindən sayılan şəxslər, məktəbdə dərs verirdilər və bu şəxslərin hamısı, bəzi zaman fərqi olmaqla bərabər, *ciddi milliyyətçilər idi*. Bu ustadlar, hər iki elm öyrənmək arzusunda olan gəncin fikir və mühakimələrinə artıq dəyişməyəcək qədər qəti, müəyyən bir istiqamət verdilər. Albert Sorel bütün bu günkü yüzil tarixində ən gerçək amil olaraq millətləri görürdü. Funk Brentano, tarixi həyatda "iqtisadi faktorları" əsil amil kimi tanıyır, şəkillərə və görünüşə, mücərrəd fikir və əməllərə deyil, reallıqlara dəyər verməyi öyrədir və aşılayırdı.

Boutmi xüsusən siyasi və sosial qurumların inkişafında millətlərin psixologiyasına diqqət çəkərək təkamül yolu ilə inkişafın sağlam olduğunu göstərməyə və isbata çalışırdı. Qısacası, Giyom küçəsinin bu sadə, ancaq olduqca ciddi məktəbi Doğuya ancaq bəzi qırıntıları gələ bilən siyasi və sosial fikirlərin qaynaqlarından biri idi. Elmə susamış gənclər, bu qaynaqdan anlaya-anlaya içə bilirdilər.

Akçuraoğlunun Güney və Quzey türklüyü çevrələrindəki müşahidələrindən və ondan əvvəl gələn türkçülərin əsərlərindən, söhbətlərindən doğmuş qənaətlərə dayanan siyasi və sosial fikirləri, mühakimələri, Siyasi Elmlər Məktəbində xeyli açıqlıq qazandı. Akçuraoğlu, Siyasi Elmlər Məktəbindən aldığı dərslərlə milliyyətçiliyi, türkçülüyü siyasət sahəsində düşünməyə başlamışdı.

Yusuf, bir tərəfdən məktəbinə davam edərkən, digər tərəfdən "Gənc türk" toplantılarına da gedib gələrdi. Əhməd Rıza bəy tərəfindən nəşr olunan türkcə "Şurayi-ümmət" qəzetinə bir neçə məqalə, fransızca "Məşvərət" qəzetinə də fransız tarixçilərindən Male və Debidouru tənqid edərək Midhət Paşanın məşrutiyyətçiliyində səmimi olduğunu iddia və isbata çalışan uzun bir məqalə verib nəşr etdirmişdi.[1]

"Şurayi-Ümmət"də çıxan məqalələr, sonra İstanbulda kiçik bir risalə halında toplanıb nəşr olunmuşdur.[2]

Əksəriyyəti 1902-ci ildə yazılmış olan bu məqalələrin Siyasi Elmlər Məktəbi dərslərindən çox təsirləndiyi, fəqət "İttihad və tərəqqi" əqidələrindən də tamam uzaqlaşmadığı görülür; bu məqalələrdə milliyyət məsələsinə toxunulmaqla bərabər, hələ siyasət sahəsində milliyyətçilik yoluna qətiyyətlə gedilməmişdir. Ancaq bir-iki nöqtədə, Sorelin təsiri altında milliyyətin qüvvət, qiymət və önəmi anlatılmaq istənmişdir və heç bir məqalədə "milləti-Osmaniyyə" deyimi yoxdur. Onun yerinə "Osmanlı ölkəsində yaşayan müxtəlif qövmlər", "birləşmiş Osmanlı topluluğu",

---

[1] "Extrait de "Mechveret" "Midhat Pacha, la Constituion Ottomane et l, Europe, par Y. A., Paris, 1903.
[2] Əski "Şurayi-ümmət"də çıxan məqalələrimdən, Tanin mətbəəsi, İstanbul, 1320 (1904).

"Osmanlı topluluğu" kimi ifadələr işlədilir. Osmanlı ölkəsində yaşayan xalqların, qövmlərin, qövmcə mənafeləri müşahidə və ifadə olunur. Osmanlı topluluğunun bu qövmlər tərəfindən parçalanmaqda olduğu qeyd edilir. Ancaq yazar hələ, Osmanlı birləşmiş topluluğunun, çox çətin, təxminən mümkün olmayacaq şərtlərin meydana gəlməsi halında qorunmasının mümkün olduğunu sanır: "Cəmiyyəti-Osmaniyyə"nin elə bir şəkil və hal qəbul etməsi gərəkdir ki, Osmanlı ölkəsində yaşayan xalq, anılan birləşmiş topluluğun halı ilə qorunmasında yarar görsün, yəni ayrılmaqda yalnız yarar görməməklə qalmasın, zərər görsün" ("Bir tövsiyyə", s. 38). Eyni məqalənin bir az aşağılarında isə belə deyilir: "məmləkətin durumunun düzəlməsi demək, yalnız idarə şəklinin dəyişməsi demək deyildir, bütün Cəmiyyəti-Osmaniyyənin inqilabı deməkdir" (s. 41).

1903-cü dərs ili sonunda, Akçuraoğlu Yusuf Paris Sərbəst Siyasi Elmlər Məktəbindən üçüncü mükafatla diplom aldı. Diplom ala bilmək üçün hazırlanması lazım olan Travailin (işin) adı: "Essai sur I Historie des İnstitutiones de Iempire Ottomans"dır (Osmanlı səltənəti müəssisələri tarixinə dair bir təcrübə). Orijinalı fransızcadan giriş hissəsi sonradan türkcəyə tərcümə olunaraq basılıb nəşr olundu.[1] Əsil mətn və nəticə hələ nəşr olunmamış və yayımlanmamışdır.

Yazar əsərin girişində, Osmanlı səltənəti müəssisələrinin əsas qaynaqlarından olan türk və islam hüquq və təşkilatına dair ümumi bilgilər verdikdən sonra, əsil mətnində "Əski rejim" və "yeni rejim" deyə ikiyə ayırdığı Osmanlı müəssissələri tarixinin önəmli olaylarını toplamağa və bu müəssisələrin görə bildiyi qədər fərqli xüsusiyyətlərini qeyd etməyə və açıqlamağa çalışmışdır; sonunda isə Osmanlı imperatorluğunun parçalanıb dağılmasının qarşısını almaq üçün mövcud müəssisələrin nə yolda dəyişdirilməsinin uyğun olacağına dair, şəxsi görüş və düşüncələrini ortaya qoymuşdur. Dərslərdən artıra bildiyi dar zamanda ancaq məhdud qaynaqlardan istifadə edilərək yazılan bu məktəb çalışmasının ciddi bir elmi dəyəri olmamaqla bərabər, Akçuraoğlunun o zamanlar siyasətdə milliyyət məsələsinə baxışını göstərməsi baxımından bir önəmi vardır. Əsərin sonlarında yazar Osmanlı səltənətində islahat məsələsinə bir neçə cəhətdən baxıla biləcəyini ifadə edir:

A) bir ünsürün mənafeyi,

B) müxtəlif ünsürlərin mənafeləri,

C) hökmdarın və hökuməti əlində tutanların mənafeləri,

D) dövlətin faydası.

Mövcud məlumatlarıma görə, "Gənc türk" adını daşıyan islahatçılarla tənzimatçılar haqqında danışılan məsələni xüsusi olaraq "dövlət" baxımından həll etməyə çalışmışdılar; ancaq bu hərəkatların düşüncəsində müxtəlif görüşlərin fərq və təhlilinə cəhd edilməmişdir.

---

[1] "Bilgi" məcmuəsinin 1 və 2 sayısında basılmış və yayınlanmışdır. İstanbul, 1329 (1913).

“İş”in yazarı da, hələ həyatının davamının imkan xaricinə çıxmamış olduğuna inandığı Osmanlı dövlətinin, yəni “dövlət”in mənafeyi baxımından, görüş və mühakiməsini yürütmüşdür. Akçuraoğluna görə, bu baxımdan “Gənc türk”lər proqramının əsil əsasının tətbiqi mümkün deyildir: *“Milliyyət fikrinin bu qədər inkişafından və müxtəlif milliyyətlər arasında, xüsusən iki din arasında bu dərəcə düşmənçiliyin ortaya çıxmasından sonra, imperatorluğun müxtəlif ünsürlərini birləşdirərək və qaynaşdıraraq ondan bir millət meydana gətirmək mümkün deyildir.”*

“Mühafizəkarların istədikləri kimi qüvvət və zorla da imperatorluğun birlik və bütünlüyünü qorumaq mümkün deyildir. XX yüzil Avropası buna izn verməz. Əgər I Səlim, IX Şarl və ya katolik Ferdinand zamanında olsaydıq, müsəlman olmayanların hamısının məhvinə və müsəlmanları bir millət halında birləşdirməyə qadir ola bilərdik...”

Bir az aşağıda:

*“Mənə elə gəlir ki, müsəlman olmayan milliyyətlərin avtonomiya almaları mütləqdir.* Və əgər Osmanlı dövləti bu millətlər üçün özündən tezliklə bağımsız “self gouvernement”lər yaradılmasına razı olmasa, onlar qüvvət və şiddətlə avtonomiyalarını qoparıb alacaqlar. İqnatyev “ya avtonomi, ya anatomi!” deməkdə haqlı idi, ikinci imperatorluq, Osmanlı səltənətində “uyuşma və bənzəmə” əsaslarının tətbiq olunmasını təşviqlə xatalı hərəkət etmişdir.

Buna görə, Osmanlı səltənəti əski təcrübələrindən faydalanaraq, imperatorluğun müsəlman olmayan ünsürlərinə milli muxtariyyət verəcək və bu şəkildə onların dövlətlə olan zəif bağlarını büsbütün kəsmələrinə əngəl ola biləcək (çünki bu ünsürlərin bir araya gəlmiş qüvvətli parçalar halında olmaqlarında daim faydaları vardır), ya da sözü keçən ünsürlərin dəmir və atəşlə muxtariyyətlərini qazanmalarını gözləyəcəkdir.”

Nəhayət, bu sözlərlə bitir: “Qısacası, Osmanlı imperatorluğu, varlığını qoruya bilmək üçün bir birləşik dövlət (Ştat federativ) şəklinə dönüşməlidir.”

Bu sətirlər 1903-cü ildə, yəni II Osmanlı Məşrutiyyətinin elanından beş, Arnavudluq, Makedoniya və Batı Trakyanın ayrılmasından doqquz və Osmanlı səltənətinin büsbütün dağılmasından 15 il öncə yazılmışdır; və o zamanlar, “İttihad və tərəqqi” firqəsində hakim və rəhbər tutulan fikirlərə tamamilə ziddir; adəmi-mərkəziyyət tərəfdarı “Gənc türklər” belə idari adəmi-mərkəziyyətlərə qədər gedir və açıqdan milliyyətlərə bir haqq tanımaq cəsarətində deyildilər...

Akçuraoğlunun bu nəzəri reseptinin də əksik bilgiyə və safca mühakimələrə dayandığını etiraf etməliyəm: Osmanlı imperatorluğunda yaşayan, məsələn, Makedon, serb, bolğar və rumların milli muxtariyyətlərini qazanmaqla Osmanlı imperatorluğu birliyində yaşamağa razı olacaqlarını düşünmək, məsələnin önəmli ünsürlərindən olan serb və yunan krallıqları ilə bolqar prinsliyini və böyük dövlətlərin Balkanlardakı təsirlərini heç də diqqətə almamaq deməkdi: bundan başqa, bəzi ünsürlər arasında bəlkə bir yüz ildən bəri son həddə olan düşmənçilik də unudulmuş kimidir, eynilə

bu ünsürlərin bir arada yaşamaqdan əldə edə biləcəkləri faydaları da yetərli dərəcədə incələnməmişdir. Bu görüşlərin bəhs etdiyimiz məsələyə görə önəmi, 1903-dən etibarən Akçuraoğlu Yusufun artıq Osmanlı birliyinin şiddətlə sarsıldığına və Osmanlı ölkəsində yaşayan millətlərin milli qayələrinə çatmalarının qarşısının alınmasının mümkün olmadığına dair, qəti qənaətidir; yəni milliyyət məsələsinə verdiyi dəyər və önəmdir.

Milliyyət məsələsinə verdiyi bu dəyər və önəm Akçuraoğlunu getdikcə daha sağlam bir anlayışa götürəcəkdir...

Akçuraoğlu Yusuf Parisdə təhsilini bitirdikdən sonra Osmanlı imperatorluğu sərhədləri ona qapalı olduğundan, Rusiyaya qohumlarının yanına getdi və Akçura ailəsinin əsl kökləri olan Züyəbaşı kəndində əmisi Yusuf bəyin yanında bir müddət qaldı. Məhz bu kənddə ikən Qahirədə çıxan "Türk" qəzetinə "Üç tərzi-siyasət" məqaləsini yazıb göndərdi.

Bu uzun məqaləyə qəzetin baş yazarı Əli Kamal bəy (Fərid Paşa hökumətində Daxiliyyə Naziri olan Əli Kamal) "Cavabımız" başlıqlı tənqidi və hətta istehza dolu bir məqalə ilə qarşılıq verdi. O zamanlar, Misirdə olan Əhməd Fərid bəy (Böyük Millət Məclisi Hökumətində Maliyyə və Daxiliyyə vəkili və Türkiyə Cümhuriyyətində Londra elçisi olan şəxs) "Bir məktub"la dostu Yusufun fikir və görüşlərini açıqlamaq və qismən doğrulamaq yolunda mübahisəyə qarışdı və bu bir sıra məqalələr "Türk" qəzetinin 24-34 nömrəli nüsxələrində (may, iyun 1904) nəşr olundu.[1]

Akçuraoğlu Yusufun öz baxımından ən önəmli əsəri olan bu bir neçə sütunluq məqalə ilə ilk dəfə siyasi sahədə türkçülük məsələsi bütün açıqlığı ilə ortaya atılmış olurdu. Bu məqalədə ilk dəfə Osmanlı imperatorluğunun təqib etdiyi və ya təqib edə biləcəyi "Üç tərzi-siyasət", yəni "osmanlıçılq, islamçılıq və türkçülük", açıq bir şəkildə təsbit və bəyan olunurdu.

Məqalə bu şəkildə başlayırdı: "Osmanlı ölkəsində Batıdan yararlanaraq güclənmə və irəliləmə arzuları oyanalı, bəlli-başlı üç siyasi məslək təsəvvür və təqib (*ebaucher*) edildi sanıram: birinci Osmanlı imperatorluğuna tabe müxtəlif millətləri təmsil edərək və birləşdirərək bir Osmanlı milləti meydana gətirmək; ikincisi, xilafət haqqının Osmanlı dövləti hökmdarında olmasından yararlanaraq, bütün islamları haqqında danışılan hökumətin idarəsində siyasi cəhətdən birləşdirmək (Fransızların "panislamizma" dedikləri); üçüncüsü, irq üzərinə dayanan türk milliyyəti siyasəti yürütmək."

Bu şəkildə "Üç tərzi-siyasət" qısaca tərif edildikdən sonra, hər birinin bir az geniş açıqlanmasına keçilir. Türkçülük siyasəti haqqında belə deyilirdi: "İrq üzərinə dayalı bir türk siyasi milliyyəti meydana gətirmək fikri çox yenidir, istər indiyə qədər, Osmanlı imperatorluğunda, istərsə də gəlib-keçən türk dövlətlərinin heç birində bu fikrin mövcud olduğunu sanmıram. Bu dəqiqdir ki, son zamanlarda İstanbulda *türk milliyyəti* arzu edən bir kadro, siyasi olmaqdan çox elmi bir kadro

---

[1] Bu üç məqalə *"Türk"*də nəşr olunduqdan sonra Misirdə bir risalə halında toplanıb nəşr olunmuşdur. Risalənin nüsxələri qalmadığından İstanbulda təkrar basıldı. "Üç tərzi-siyasət" "Kadər" mətbəəsi, İstanbul, 1327 (1911).

təşəkkül etdi. Şəmsəddin Sami, *"Türkcə şeirlər"* möhtərəm yazarı, Nəcib Asim, Vələd Çələbi və Həsən Təhsin(?) bu kadronun gözə görünən üzvlərindən olub, "İqdam" müəyyən dərəcəyə qədər bu düşüncələrin tərəfdarıdır. "...Ən çox türklərin olduğu Rusiyada, türklərin birləşməsi fikrinin çox qeyri-müəyyən şəkildə varlığına inanıram. Yenicə doğmuş olan "İdil ədəbiyyatı" müsəlman olmaqdan çox türkdür. Xarici təzyiqlər olmasa, bu fikrin asanlıqla inkişafına Osmanlı ölkəsindən artıq müsaid mühit türklərin ən sıx yaşadıqları Türkistan ilə Yayık və İdil hövzələri olardı. Qafqaz türklərində bu fikir mövcud olmalıdır, Azərbaycana Qafqazın fikri təsiri olmaqla bərabər Quzey İran türklərinin nə dərəcəyə qədər türk birliyi tərəfdarı olduqlarını bilmirəm.

"Nə olursa olsun, irqə dayalı bir siyasi milliyyət icadı fikri hələ ilk meyvələrini verir, çox az eşidilmişdir."

Məqalənin ikinci qismində "bu üç siyasətdən hansının yararlı və mümkün olduğu" araşdırılır və dərhal "yararlı dedik, ancaq kimə və nəyə yararlı?" sualı soruşulur.

"Bu suala cavabı ancaq meyli-təbimiz, digər bir deyimlə ağlımızın hələ təhlil edə bilmədiyi, haqq verə bilmədiyi hissimiz verə bilir. Mən Osmanlı və müsəlman bir türkəm; buna görə Osmanlı dövləti, islamiyyət və bütün türklər faydasına xidmət etmək istəyirəm. Ancaq siyasi, dini və nəsəbi (soyla ilgili) olan bu üç cəmiyyətin faydaları ortaqmıdır? Yəni birisinin qüvvətlənməsi digərlərinin də qüvvətlənməsini zəruri edirmi?"

Bu soruya cavab verə bilmək üçün üç cəmiyyətin faydalarını qarşılaşdıraraq, nəhayət bu qərara gəlir: "Hər üç cəmiyyətə mənsub bir şəxs Osmanlı dövləti faydasına çalışmalıdır. Ancaq Osmanlı dövlətinin faydası, yəni qüvvət qazanması bəhsimizin mövzusunu təşkil edən üç siyasət tərzindən hansını təqib edir və bunlardan hansı Osmanlı dövlətinda tətbiq oluna bilər?"

Məqalənin üçüncü və son qismi, bu son suallara cavab axtarır: "Osmanlı milləti təşkili qayəsi ilə edilən təcrübələri, buna qarşı çıxan daxili və xarici maneələri, ətraflıca anlatdıqdan sonra deyir ki: *"buna görə, zənnimcə artıq Osmanlı milləti vücuda gətirməyə çalışmaq boşuna bir yorğunluqdur..."*

Akçuraoğlu nəzəri olaraq yetişdiyi bu nəticəyə bundan sonra işində, hərəkətində daima sadiq qalacaq və məqaləsinin nəşrindən dörd il sonra "İttihad və tərəqqi" cəmiyyətinin Osmanlı dövlətində Məşrutiyyət elan etdirməsindən ortaya çıxa biləcək sandığı ünsürlərin birləşməsi siyasətinə qarşı müsbət bir tutum ala bilməyəcəkdir.

"Osmanlı milləti vücuda gətirmək" siyasətini bu şəkildə atdıqdan sonra, məqalə "tövhide-islam" (islam birliyi) və "tövhide-ətrak"(türk birliyi) siyasətlərinin müzakirəsinə keçir və yazarın bu iki siyasətdən birini digərindən üstün tutmaqda tərəddüd etdiyi görülür. Bununla bərabər, "islam birliyi"ndən söz edərkən, "islam birliyi" siyasətinin tətbiqində daxili maneələr az çətinliklə qarşısı alına biləcək surətdədir. Ancaq xarici əngəllər çox qüvvətlidir. Osmanlı dövlətinin ciddi bir şəkildə

"islam birliyi" siyasətini tətbiq etməyə qalxmasına (xristian dövlətləri) bəlkə də başarı ilə, əngəl olurlar" deyərək islam siyasətinin tətbiq oluna bilməsinin çox şübhəli olduğunu açıqlayır.

"Türk birliyi" siyasətinə gəlincə, bunun tətbiq edilməsi mümkün olduğu təqdirdə yazarın görüşünə görə, bir çox faydalarından birisi "Osmanlı ölkəsindəki türklərin həm dini, həm irqi birliyi ilə çox sıx, yalnız dini olmaqdan sıkı" birləşməsinə və əsasən türk olmadığı halda müəyyən dərəcədə türkləşmiş digər müsəlman ünsürlərin daha çox türklüyə assimilyasiya olmasına (bənzəşməsinə) və *hətta "hələ heç asimile olmamış və ancaq milli vicdanları olmayan ünsürlərin də türkləşdirilə bilməsinə" xidmət edəcəyi keyfiyyətidir.* Buna qarşılıq türkçülük siyasətinin "Osmanlı dövlətində yaşayanlardan müsəlman olub da türk olmayan və türkləşdirilməsi mümkün olmayan qövmlərin Osmanlı dövlətinin əlindən çıxması, islamiyyətin türk və türk olmayan qismlərinə ayrılaraq artıq Osmanlı dövlətinin türk olmayan müsəlmanlar ilə ciddi bir əlaqəsi qalmaması narahatlığı vardır."

Yazar Batının təsiri ilə türklər arasına milli fikirlərin girməyə başlamış olduğunu təsbit etməklə bərabər, siyasət sahəsində türkçülüyün "hələ yeni doğulmuş uşaq" olduğunu söyləyir; bununla bərabər "zamanımız tarixində görülən ümumi axımın irqlərdə" olduğunu söyləyir; və "türk birliyi" əleyhinə xarici əngəllərin nisbətən az olduğunu və hətta bəzi Avropa dövlətlərinin "Rusiyanın faydalarına zərəri olduğu üçün bu siyasəti dəstəyəcəklərini" əlavə edir.

"Osmanlı milliyyəti" siyasətinin Osmanlı dövlətinə faydalı olmadığına və tətbiq edilməsinin mümkün olmamasına qətiyyətlə hökm edən Akçuraoğlu Yusuf, islam və türk siyasətlərini üstün tutmaqda bu qətiyyəti göstərə bilmədiyindən "Üç tərzi-siyasət" məqaləsi "Türk" qəzeti yazarlarına yönəldilmiş bu soru ilə bitir: "Müsəlmanlıq, türklük siyasətlərindən hansı Osmanlı dövləti üçün daha faydalı və tətbiqi mümkündür?"

Bəli, Akçuraoğlu bu məqaləsində türklük ya da məqalədə əksərən göstərilən ifadə ilə, "Türk birliyi" siyasətini müsəlmanlıq ya da "tövhide-islam" (islam birliyi) siyasətindən üstün tutaraq fikri təkamülünü hələ tamamlamış deyildir; ancaq fikri təkamülünün hansı yönə doğru getdiyini bu məqalədən çıxarmaq mümkündür. Məqalədə türkçülük siyasətindən söz edərkən "islam dini, türk milliyyətinin formalaşmasında önəmli bir ünsür ola bilər. İslam, türklüyün birləşməsində son zamanlarda xristianlıqla olduğu kimi içində milliyyətlərin doğmasını qəbul edəcək şəkildə dəyişməlidir. Bu dəyişmə isə, vaxt keçirmədən məcburidir: zamanımız tarixində görülən ümumi axım irqlərdədir. Dinlər, din olmaq baxımından getdikcə siyasi önəmlərini, qüvvətlərini itirirlər. Sosial olmaqdan çox, şəxsiləşirlər. Dolayısı ilə dinlər, ancaq irqlərlə birləşərək irqlərə yardımçı və xidmətçi olaraq siyasi və sosial önəmlərini qoruya bilərlər"- deyilməkdədir.

Bu günkü düşüncəmə görə, bu məqalədə önəmli bir təhlil əksikliyi vardır: "Türklük siyasəti" ilə "türk birliyi", "islam siyasəti" ilə "islam birliyi" bir-birlərinə qarışdırılmışdır. Osmanlı

dövlətinin öz daxilində "türklük" və ya "islam" siyasəti təqib etməsi, xaricdə "pantürkist" və ya "panislamist" olmasını mütləq gərəkdirməz. Və bu təhlil də edilmiş olsaydı, 1908-ci ildən bu günə qədər olan hadisələr daha açıq görülmüş və ifadə edilmiş olardı.

Nə olursa olsun, olaylara dayanılaraq əksi açıqlanıncaya, isbat edilincəyə qədər iddia oluna bilər ki, bu məqalədən öncə Osmanlı dövlətinin son dövrlərindəki siyasət tərzlərini sinifləndirən və hər bir tərzə müəyyən bir ad verərək əsas cizgilərini ortaya qoyan bir əsər yazılmış deyildir; bundan başqa həmən bir yüzilə yaxın, dil, ədəbiyyat və filologiya və hətta siyasət sahəsində türkçülük fikri və fikri axımı mövcud olduğu halda, türk milliyyətçiliyinin siyasətdə sahib ola biləcəyi dəyər və önəmə dair, "Üç tərzi-siyasət"dən öncə bu dərəcə açıq və qətiyyətlə görüş bəyan edən bir əsər yazılmış olduğunu da bilmirəm.

"Üç tərzi-siyasət"in əsl önəmi də, məhz bu təhlil və təsbitlərindədir. 1908 Məşrutiyyətindən sonra, "osmanlılıq, islamlıq və türklük" sinifləndirməsi və bu ifadələrin ifadə etdiyi siyasi və sosial qavramlar, Osmanlı dövlətinin içində və dışında xüsusən türklər arasında çox işləndiyi kimi, siyasi və sosial həyatın tətbiq sahəsində da hər üç siyasət tərzinin daha çox açıqlıq və bilinc ilə meydana gətirilməsinə çalışıldığı bir həqiqətdir.

"Üç tərzi-siyasət" Batı yazarlarının diqqətini çəkmədə gecikməmişdir. Yalnız Doğu elmilə məşğul bəzi özəl məcmuələrdə və əsərlərdə deyil, Doğuya aid ümumi əsərlərdə belə osmanlılıq, islamçılıq, türkçülük fikir və siyasətlərindən təbirlər eynilə işlədilməklə bəhs edilməyə başlanmış və "Üç tərzi-siyasət" yazarı, türkçülük hərəkatının öndər, qurucu və yayıcılarından olaraq göstərilmişdir.[1]

Akçuraoğlu, "Üç tərzi-siyasət" məqaləsini bir sualla bitirmiş olmaqla bərabər, Rusiyadan gəldiyi zaman, bütün türk aləmində kültür, siyasət sahələrində milliyyət fikrinin tətbiqinin mümkün və faydalı olduğuna qənaət gətirmişdi. Və Rusiyada olduğu illər bu fikrinin yayılmasına xeyli əlverişli idi: Yusuf rus-yapon müharibəsi və onu təqib edən 1905-ci il inqilabı, Rusiyada Məşrutiyyətin elan və tətbiqi zamanlarındadır ki, Rusiyada oldu. Əsasən, Quzey türklüyü mühiti, yuxarıda göstərilən Şəhabəddin Mərcani, İsmayıl bəy Qaspıralı kimi milliyyətçilərin və onların öyrəncilərinin illərdən bəri dil, kültür sahəsində davam edən uyarıları ilə siyasi sahədə də milliyyətçi, türkçü hətta bütün türkçü (pantürkist) fikirlərin yayılması və aşılanmasına xeyli əlverişli bir zəmin halına gəlmişdi. Akçuraoğlu, bu durumdan dərhal faydalandı və siyasi sahədə türk

---

[1] Bu yolda yazılan əsərlərdən gözümə ilişənləri aşağıda göstərirəm: 1) P. Krisal "Les Tures a la recherche d'une ame nationale", "Mercure de France", v. 47. No. 3640-14 Aqut 1912; 2) "X Les Courants politiques dans la Turgue contemporaine", "Revue du monde Musulman", V: XXI Desembre 1912; 3) "X le Panislamisme et le Panturqisme", Revue du monde Musulman, V: XXII, Mars, 1913 Qırx səhifəlik bu uzun məqalədə "Üç tərzi-siyasət" xeyli geniş təhlil edilmiş, incələnmiş, tənqid edilmiş, Akçuraoğlu Yusuf islam birliyi fikrinin qurucu və yayıcılarından Seyid Cəmaləddin Əfqani ilə müqayisə edilmişdir. 4) Caston Gaillard, Les Turcs et L' Europe, Paris, 1921, s. 298; 5) Lothrop Stoddard, "Le nouveau monde de islam, traduit de l'anglais, Paris, Payot, 1923. Lothrop Stoddard, "Yeni aləmi islam" ingiliscədən türkcəyə çevirən: Əli Rıza Seyfi, İstanbul, 1922, s. 229; 6) A. Sanhouri "Le Califat", Lyon, 1926, s. 495; 7) Commandant M. Larcher, "La guerre turque dans la guerre mondiale", Paris, Chiron, 1926; Le probleme turc. s. 17-37.

milliyyətçi fikirlərini hər vasitə ilə yaymağa və bu yolda mümkün olan təşkilatların qurulmasına çalışdı. Öncəliklə, əksəriyyətinə yaxınlıq və qohumluq bağları ilə bağlı olduğu Kazan zəngin ailələrinin gənclərini aydınlatmaya, təşkilatlandırmağa çalışdı. Və Kazan gəncliyini aydınlatmaq məqsədi ilə o sırada Kazanın yeniləşmə yoluna girmiş mədrəsələrindən "Mədrəseyi-Muhəmmədiyyə"də tarix coğrafiya, Osmanlı türk ədəbiyyatı müəllimliyi vəzifəsini üzərinə götürdü.[1] Sonra Kazanda "Kazan müxbiri" adlı bir qəzet çıxartmağa da nail oldu və ilk dəfə Quzey türkcəsi ilə çıxan bu qəzetin yazı heyəti başkanlığında oldu. Nəhayət, Akçuraoğlu bütün Quzey türklərini milli bir siyasi təşkilat halında toplamaq qayəsi ilə İsmayıl bəy Qaspıralı, Əlimərdan bəy Topçubaşı, Əbdürrəşid Qadı İbrahimov kimi əməkdar camaat xadimləri ilə bərabər çalışaraq 1905-ci il inqilabı zamanı "Rusiya müsəlmanları ittifaqı" adlı böyük firqənin qurulmasına xidmət etdi və firqənin mərkəz idarə üzvlüyünə və ümumi katibliyinə seçildi. "Rusiya müsəlmanları ittifaqı" Rusiyada yaşayıb türklərin böyük əksəriyyətini təşkil edən Quzey, Türkistan və Azərbaycan türklərinin aydınları ilə yüksək və orta şəhər əhalisinin, köylülərin əksəriyyətini, xüsusən "vicdani hürriyyəti" "bütün Rusiya xalqının fərdləri arasında hüquq bərabərliyi" (çünki çarlıq rejimində rus olmayan xalqın hüququ ruslara nisbətən məhdud və azaldılmışdı) və "kültür sahəsində milli inkişafa qanunən icazə" qayələri ətrafında toplamış böyük bir siyasi təşkilat mahiyyətində idi. Bu təşkilat I Dumaya (rus məclisi-məbusanı) seçimlər zamanı ciddi bir fəaliyyət göstərərək, Quzey türklərindən çox miqdarda millət vəkili seçdirməyi bacardı. Ancaq tam seçim qızışdığı sıralarda Akçuraoğlu Yusufun seçilmə haqqına sahib olmadığından xəbərsiz olan Kazan jandarm idarəsi onu tutaraq, ta seçimin sonuna qədər ümumi həbsxanada məhbus etdi.[2]

Akçuraoğlu, həbsdən çıxdıqdan sonra da, Rusiyada olduğu müddət ərzində, yəni 1908-ci il tarixinə qədər davamlı türk milliyyət qayəsinə yönəlik siyasət və kültür işləri ilə məşğul oldu: "Rusiya müsəlmanları ittifaqı"nın Peterburqda millət vəkilləri arasında təşkil olunan bürosuna seçildi. "Rusiya müsəlmanları ittifaqı"nın konqrelərinin düzənləmə və idarə işlərində çalışdı. "Kazan müxbiri", "Vakt" və "Tərcüman" qəzetlərində yazarlıq və müxbirlik etdi. Nijni Novqorod yarmarkası zamanı (19 avqust, 1906) toplanan "Rusiya müsəlmanları ittifaqı"nın III konqresində ümumi katiblik vəzifəsini yerinə yetirərək, bu konqrenin "ittifaq"ın arzusuna uyğun bir nəticəyə yetməsinə çox çalışdı.[3] Bu konqredə bütün qərarlar türkcənin İstanbul şivəsi ilə qeyd olunduğu kimi, İsmayıl Qaspıralının türk milliyyətçiliyi və türk birliyi baxımından çox önəmli olan bu təklifi də

---

[1] Akçuraoğlunun "Elm və tarix" adlı risaləsi, bu mədrəsədə oxudulan tarix ön sözündən konspekt edilmişdir. Bu risalə Kazanda Xaritonov mətbəəsində 1906-cı ildə nəşr olunaraq "Maarif" kitabxanası tərəfindən yayımlanmışdır.

[2] Akçuraoğlu Yusuf, "Həbsxana xatirələri", "Türk yurdu" kitabxanası, ikinci basım. (Birinci dəfə Rusiyada Orenburqda nəşr edilmişdir). İstanbul, 1330 (1914).

[3] Bu günkü Sovetlər Cümhuriyyəti Birliyinə daxil Tatarıstan Cümhuriyyətinin kültür işlərində çalışan önəmli simalarından Alimcan Ibrahimov tərəfindən yazılıb 1926-cı ildə Kazanda Tatarıstan Dövlət Yayınları Mətbəəsində nəşr olunan "1905-ci il inqilabında tatarlar" adlı türkcə və rusca əsərin, rəsmi qaynaqlardan, hətta gizli dosyelərdən aldığı bilgilərə dayanan məzmunu içində Akçuraoğlunun o dövrlərdəki siyasi və kültürəl fəaliyyəti xarakterizə edilməkdədir.

qəbul olundu: "Ümumən türklərin əsli, nəsli birdir. Zaman və məkan ayrılığı səbəbindən şivə və adətlərimizdə uyuşmazlıq meydana çıxmışdır. Bu uyuşmazlıq, bir-birimizi anlamayacaq dərəcəyə gəlmişdir. Bundan sonra məktəblərimizi bir olan ədəbi dilimizə xidmət edəcək hala gətirmək lazımdır. Konqrenin məktəb və mədrəsə komisyonu tərəfindən hazırlanmış proqramında, ibtidai (ilk) məktəblərimiz üçün dörd illik dərs ili təyin olunmuşdur. Bunun üç ilində sadə, məhəlli şivə ilə təlim edilib, son ilində ümumi türk dili ilə yazılmış kitablar oxudulmalıdır; bu sayədə yavaş-yavaş çeşidli şivə və ləhcələr birləşmiş olur."

İsmayıl bəyin bu təklifi konqre tərəfindən şiddətli və həyəcanlı alqışlarla qəbul olundu, bütün Rusiyada yaşayan müsəlmanların hamısı üçün örnək kimi hazırlanan "Məktəb və mədrəsələr islahı" proqramına əlavə edildi.

1906-1907-ci illər Quzey türkləri arasında milliyyətçilik, türkçülük hərəkatının ən canlı bir dövrüdür: Rusiya imperatorluğunun Yaponiya önündə məğlub olaraq geri çəkilməsi, Rusiyanın hürriyyətçi, məşrutiyyətçi, bərabərlikçi, inqilabçı, sosialist müxtəlif ünsürləri ilə Rusiyada yaşayan rus olmayan millətlərin hamısını məmnun edərək hərəkət və fəaliyyətə yönəltmişdi. Bəzi rus olmayan millətlər tam bir müstəqillik, bəziləri mədəni muxtariyyət, müstəqillik qazanmaq sevdasına düşmüşdülər. Bu ümumi hərəkat və həyəcan Rusiyada yaşayan müsəlman türklərin də müxtəlif təbəqələrinə kültür səviyyələri nisbətində təsir etmişdi. Yapon zərbəsi ilə zəifləmiş despotik idarə, irəliçi ünsürlərə və müxtəlif millətlərə qarşı, heç olmasa bir müddət üçün, yumşaq davranmaq məcburiyyətini hiss etmişdi. Yapon zərbəsini, məşrutiyyətçi və ixtilalçı ünsürlərlə onlara qatılan irəli milliyyətlərin, xüsusən sindikatlaşmış nəqliyyat vasitələri və müxabərə məmuru işçilərinin müdhiş tətilləri təqib etdi. Bunun üzərinə, Çar hökuməti yelkənləri endirərək bir çeşit məşrutiyyət elan etməyə məcbur oldu. Bütün bu hərəkətləri təqib edən və qismən bunlara qatılan Quzey türkləri, hazırlığı nisbətində, milliyyətinin ortaya çıxması, müxtəlif qisimlərinin birləşməsi yolunda çalışmağa başlamışdır. Məhz bu çalışma 1906-1907-ci illərdən etibarən yüksək dərəcəyə çatmışdı. Və "İttifaq"ın III konqresi ilə,[1] ondan sonra olan İkinci Duma seçkiləri bu çalışmanın dərəcəsini göstərən xarici amillərdəndir.

1906 və 1907-ci illərdən etibarən deyilə bilər ki, Quzey türklərinin ümumi-heyətində azəri, tatar, başqırd, qazax, özbək və başqa qəbiləvi fərqlər əskilərək, milli birlik fikrinə dayalı ciddi bir "milli şüur" formalaşmağa başlamışdır. 1905-1907 hərəkatları, zahirən Rusiya müsəlmanları adı altında yürüdülmüşdürsə də, həqiqətdə bu milli bir hərəkat idi. Rusiyada türkləri, məzhəb baxımından ikiyə, sünni və şiə qisimlərinə ayıran ixtilafın qaldırılmasına da bu zaman ciddi surətdə çalışılmışdır. Bütün Rusiya müsəlmanlarının III konqresində, qəbul olunan qərarlardan biri də bu idi:

---

[1] "Rusiya müsəlmanları ittifaqı"nın III konqresinin müzakirə və qərar protokolları nəşr olunmuş və yayımlanmışdır. Musa Biqiyev, "Ümumrusiya müsəlmanlarının III rəsmi toplantı konqreləri", "Zabit" cəridəsi, "Rusiya müsəlmanları üçüncü Qurultayının qərarları", Kazan, "Kərimiyyə" mətbəəsi, 1906

“müxtəlif məzhəblər arasındakı fərqlər önəmli deyildir. Və bu fərqlər Rusiya müsəlmanlarının ruhani işləri üçün ümumi bir müəssisənin vücuduna dini baxımdan bir maneə törədə bilməz.”
Bu qərarı şiə məzhəbindən olan azərbaycanlı Əli Mərdan bəy Topçubaşıoğlu təklif etmiş, üzvləri arasında bir çox sünni və şiə ruhanilər olan konqre isə bu təklifi “sünnilik, şiəlik yoxdur. Yetsin ixtilaf!” sədaları ilə və dəqiqələrcə sürən alqışlarla, səsbirliyi ilə qəbul etmişdir.

1907-ci ildən sonra, Rusiyada yenidən irtica başlayır. 3 iyun-da İkinci Dumanı dağıdan Çar hökuməti seçki qanununu müxaliflər və rus olmayanlar zərərinə dəyişdirir, müxalif və rus olmayan mətbuatın nəşrini məhdudlaşdırır və ümumiyyətlə müxaliflər və rus olmayanlar əleyhinə təqiblər başlanır. 1907-ci il geriçiliyi, siyasi həyata hələ yeni qarışmağa başlayan Quzey türklərini bir az hürkütməklə bərabər, savaş, devrim və hürriyyət dövrlərində atılmış toxumlar boşuna getməmişdir. Mətbuat, gerçək şərtlərə az uyaraq, yenə türk milliyyətçiliyi qayəsinə yönəlik, məşrutiyyət və hürriyyətin təkrar quruluşu ilə ilgili xəbərlər nəşr etməyə davam edir. Xüsusən tamam türkçü olan Quzey ədəbiyyatı (elm, tarix və s. əhatə edən ən geniş anlamı ilə) sürətlə inkişaf etməkdədir.

Bu geriçiliyə irəliçi rus orqanizmi ilə mətbuatı qarşı durmağa başladıqları kimi, Quzey türk mətbuatı da susmadı. Bu arada Yusufun “3 həziran Vakayi-müəssifəsi” adlı bir risaləsi nəşr olunub çıxdı.[1] Bi risalədə yazar, “Hüquq baxımından bu hadisə nədir? Dövlət faydası baxımından nə kimi nəticələr doğuracaqdır? Bu hadisədən ən çox zərər görən müsəlmanlar bu cəzaya hansı hərəkətləri ilə layiq oldular? Müsəlmanlar bu zərbəyə necə qarşı durmadılar?” suallarını qoyur və bunların cavabını verirdi. Akçuraoğlu, hadisəni Rusiyanın faydalarına zərərli bir dövlət zərbəsi kimi dəyərləndirdikdən sonra, geriçiliklə qəlb qüvvətləri azalmış olması ehtimal edilən Quzey türklərini, bəzi görüşlərlə dəstəkləməyə və qeyrətlərini artırmağa çalışır və qısaca deyirdi ki: “XIX yüzildə dünya mədəniyyət tarixinə ən çox təsir göstərən fikir milliyyət fikridir. Milliyyət fikrinə, bu böyük qüvvətə heç bir şey qalib gəlmədi. Yüz minlərlə müntəzəm ordular, bu fikir qarşısında məğlub oldu. Bu gün milliyyət fikrini məğlub edə biləcək qüvvət, şiddət, zülm, top, tüfəng deyildir. Bəlkə milliyyət fikrinin ana və atası olan hürriyyət və bərabərlik fikirləri onu məğlub edə bilər... Sosial və siyasi inqilabların ən qüvvətli səbəbi sosial siniflər, hakim-məhkum millətlər arasındakı gerçək qüvvət müvazinəti olub zahirdəki, önəmsiz hadisələrin təsirləri çox azdır. Müsəlmanlar, ya da ümumiyyətlə rus olmayan xalqlar, ruslarla olan münasibətlərində, nə qədər qüvvət göstərə bilərlərsə, ancaq o qədər hüquqa sahib ola bilərlər. Buna görə rus olmayanlar və demokratiya əleyhinə qanunun dəyişdirilməsi, bu iki müxtəlif sosial qüvvətlərin zəifliyindəndir, yəni Rusiya müsəlmanlarının qüsurları, cəzanı zəruri edən suçları, qüvvətsizlikləridir... Müsəlmanlar əvvəldən bəri alışdıqları boyun əymək, yalvarmaq və üzə gülmə siyasəti ilə zərbələrdən qorunacaqlarını düşünürlərsə, çox səhv edirlər....”

---

[1] Yusuf Akçuraoğlu, “3 Həziran Vakayi-Müəssifəsi”, “Kərimov-Hüseynov” mətbəəsi, Orenburq, 1907.

Akçuraoğlunun bu risaləsi, bütün türk və müsəlman hərəkatının Rusiyada amansız və insafsız düşməni olan şərqşünas və senzor professor Smirnov tərəfindən, mətbuat qanununa müxalif görülərək məhkəməyə xəbər verilmiş, yazarın təqibinə başlanmışdır. Yazar o zamanlar doktorların tövsiyyəsi ilə, mülayim iqlimi olan Krıma gəlmişdi və Baxçasarayda İsmayıl bəyin *"Tərcüman"* qəzetində çalışırdı. Sorğu hakiminin çağırışı onu arayıb tapmazdan öncə, Osmanlı səltənətində məşrutiyyətin elanı xəbəri qulağına gəlib çatdı. Bu xəbərdən sonra, Akçuraoğlu bütün işlərini tələm-tələsik yerbəyer edərək İstanbula yola düşdü (oktyabr, 1908).

**Hüseynzadə Əli bəy**

Akçuraoğlunun "Üç tərzi-siyasət"i, "Türk" qəzetində nəşr olunduqdan bir müddət sonra, eyni qəzetin 56-ci nömrəsində (24 təşrini-sani, kasım-noyabr) "Məktubi-məxsus" başlıqlı və "Ə. Turani" imzalı bir məqalə nəşr olundu. Məqalə sahibi, açıqca ifadə etməməklə bərabər, "Üç tərzi-siyasət" mübahisəsinə[1] qarışır və "Süni olaraq ayrıca "pantürkizm", "panislamizm" adları ilə məslək icadına nə lüzum vardır? deməklə və "Türk" qəzeti baş yazarının bəzi görüşlərinə qatılmış kimi görünməklə bərabər, özünün "panislamizm" və "pantürkizm"ə müxalif deyil, tam əksinə tərəfdar olduğunu anladırdı: "Müsəlmanlar və özəlliklə türklər, hər yerdə olursa olsun, istər Osmanlıda, istər Türküstanda, istər Baykal gölünün ətrafında, ya Karakorum civarında olsun, bir-birlərini tanıyacaq, sünnilik şiəlik və daha bilməm nəlik adları ilə məzhəb təəssübünü azaldıb "Qurani-Kərim"i anlatmaya qeyrət edəcək, dinin əsasının "Quran" olduğunu biləcək olurlarsa, əl verməzmi?"

"Bir millət üçün hər şeydən öncə arzu ediləcək şey qüvvətdir, bir millətin qüvvət qazanması eyni cinsli ünsürləri arasında mənəvi bağın artmasına bağlıdır. Xüsusən, qarşılıqlı sevginin artmasına çalışmalıdır... Məsələn, bir-birimizi tanımaq, sevmək, mədəniləşmək yolunda, bir birimizə yardım etmək məsələsidir. İranın hökmdarlarına varıncaya qədər məktəb şagirdlərinə şeirlərini əzbərlətmək, fəqət Mir Əlişir Nəvaidən iki sətir olsun düz oxuya bilməmək... İştə utanılacaq hallar!..."

"Ə. Turani" bu önəmli "Məktubi-məxsus"unun başında tatar deyə ayrıca bir qövmün olmadığını, krımlıların, kazanlıların, orenburqluların hamısının da türk oğlu türk olduqlarını izah və isbat etdikdən sonra, "bütün türklüyün iftixar qaynağı olan Çingizlər, Teymurlar kimi hərb dahilərinə dair həqarətamiz sözlər söyləmək... qaş düzəldim deyərkən göz çıxarmaq kimidir" deyirdi.

"Ə.Turani" təxəllüsü ilə bu "Məktubi-məxsus"u yazan şəxs Azərbaycan türklərindən Əli bəydir. Yalnız kültürəl deyil, kültürəl və siyasi türkçülük hərəkatının Azərbaycanda ilk yayıcısı olan Hüseynzadənin bu məktubu 24 təşrini-sani (noyabr) 1904 tarixində nəşr olunmuşdursa da, onun türkçülük idealını daha öncədən qəbul etmiş kimsələrdən olduğunu bu məktubun incələnməsindən belə çıxarmaq çətin deyildir.

Sülh və sükun, anlaşma və ahəng tərəfdarı olan Əli bəy, "Məktubi-məxsus"la müzakirədə iştirak edən tərəflərin tezis və antitezislərini yüksək bir sintez halında birləşdirmək istəmişdir. Bunun üçündür ki, hər iki tərəfin bəzi fikirlərini qəbul etmiş görünürdü. Ancaq bu məqalədə gəldiyi nəticə müsəlman türklərin birləşməsinə xidmət lüzumudur. Hüseynzadə Əli bəy "Məktubi-

[1] "Üç tərz-siyasət" mübahisəsi "Türk"ün 23-34 nömrələrində nəşr olunmuşdur.

məxsus"un ən sonunda Vamberidən bəhs edərək "adı keçən alimin məktubunu oxuyarkən xatirimə vaxtı ilə türklüyə dair yazmış olduğum qitələr gəldi: bunları məktubuma əlavə edərək zati-alinizə göndərirəm" -deyir. Ancaq türklüyə dair yazdığı qitələr "Türk"də nəşr olunmamışdır. Əli bəyin 1915-ci ildə mənə söylədiyinə görə, bu qitələr Misirə göndərilmələrindən bir neçə il öncə yazılmışdır. Heç bir yerdə, qeyd olunmamış, nəşr olunmamış bu qitələrdən Əli bəyin o zaman xatirində qalan parçalar bunlardır:

Sizlərsiniz ey qövmi-macar, bizlərə ixvan,
Əcdadımızın müştərəkən mənşəyi Turan!...
Bir dindəyiz biz, həpimiz hak-pərəstan;
Mümkünmü ayırsın bizi "İncil" ilə "Quran"?
Çingizləri titrətdi bu afaqı sərasər,
Teymurları hökm etdi şahənşahlara yeksər.
Fatehlərinə keçdi bütün kişvəri-qeysər!

Bu mənzuməyə görə, Hüseynzadə Əli bəyin yalnız pantürkizm tərəfdarı deyil, daha geniş olan "panturanizm" tərəfdarı olması gərəkdir və əsasən istifadə etdiyi təxəllüsü də "Ə.(Əli)Turani" bunu göstərir: Hüseynzadə Əli bəy, müsəlman türklər arasında *"ilk turani", yəni panturanistdir*, desək xəta etmiş olmarıq- zənnindəyəm. Ancaq bunu da əlavə etməliyik ki, daima həyatda anlaşma və sükun arayan Hüseynzadə Əli bəy, turaniliyini şiddət, qətiyyət və israrla müdafiə etməmişdir. Bununla bərabər, onun şairanə turançılığı, 1908-ci ildən sonra İstanbulda digər turançıları, başlıca Göyalp Ziyanı yaratmışdır.

Hüseynzadə Əli bəy 1864-cü ildə Bakı qəzasının Salyan şəhərində anadan olmuşdur. Anasının atası o zaman Qafqaz şeyxülislamı idi. Öz atası Tiflis müsəlman məktəbində müəllimlik edirdi. Öncə atasının məktəbində, sonra Tiflis Rus Gimnaziyasında, daha sonra Peterburq Təbii Elmlər fakultəsində təhsil alaraq 1889-cu ildə universtitet diplomu almışdır. Diplomunu alan kimi, Rusiyanı tərk edib Türkiyəyə gəlmiş, Əsgəri Tibbiyyəyə qeyd və qəbul olunmuşdur.

Hələ Tiflisdə ikən babası Şeyx Əhməd Səlyani ilə onun dostu Mirzə Fətəli Axundovun söhbətlərindən, mübahisələrindən yararlanmaya başlamışdı. İran və rus mədəniyyətlərinin təsiri altında yetişmiş bu iki istedadlı şəxsiyyət, öz milliyyətlərini az-çox tanıyan kimsələrdi: Şeyx Səlyani Vaqifin türkcə şeirlərindən, farsca şeirlərindən daha çox zövq aldığını söyləmək cürətini göstərirdi. Mirzə Fətəli isə, yuxarıda bəhs etdiyimiz ki, Azərbaycanın dil milliyyətçiliyində xidməti keçən irəli gələnlərindəndir. Əli bəyin gimnaziya şagirdliyindən etibarən türkcəyə, Türkiyəyə, türklüyə bağlılıq duymağa başlamasında bu iki böyük azərinin təsiri mütləqdir.

Əli bəy, Peterburqda digər türk ellərindən gəlmiş tələbələrlə tanış oldu, sevişdi. Əsil Təbii Elmlər Fakultəsinə qeyd olunmaqla bərabər, Şərq Dilləri Fakultəsinin bəzi dərslərinə də davam etdi; şərqşünasların elmi metodları ilə Şərq mütəfəkkir və şairlərini tanıdı. Qafqazlı Əli Hüseyn Əfəndinin İstanbul Əsgəri Tibbiyyəsinə girməsi, *"Türk yurdu"*nda yazdığım bioqrafiyasında [1] dediyim kimi: "Oraya təzə və xoş qoxulu bir Avropa mədəni havasının əsməsi kimi oldu... Tələbəsinin çoxu Anadolu və Rumelinin uzaq, qaranlıq vilayətlərindən toplanmış bu məktəbdə, Əli bəy bir quzey günəşi kimi parladı... Yunan və latın ədəbiyyatına aşina olduqdan başqa, alman, rus və ingilis ədiblərini xeyli gözdən keçirmiş, Doğu ədəbiyyatını şərqşünaslar səviyyəsində öyrənmişdi. Üstəlik, rəssamdı və kaman çalırdı. Yoldaşlarının hamısı əski dövr ədiblərinin ad və rəsmlərini ancaq "Kiçik Larousse"dən bilirdilər. Rus fikir və ədəbiyyatına tamamən yabançı idilər. Çoxunun Batı fikir və ədəbiyyatına bələdliyi də ancaq fransız qramer və lektorlarında hecalanan parçalara dayanırdı. Əli bəy, İstanbul Tibbiyyə Məktəbinə Batı fikirlərini, Batı ədəbiyyatını, Batı irfan və mədəniyyətini, qısası Batını tanıtmaqda professorlardan çox xidmət etdi. Yoldaşlarından doktor Abdulla Cövdət bəy, Əli bəyin Tibbiyyə Məktəbindəki təsirini belə nəql edir: "Əli bəy səssiz və düşünür halı ilə, əsrarəngiz təsiredici öyüdləri ilə üzərimizdə bir peyğəmbər təsiri buraxırdı. Əvət, o bir rəsuli-həqq idi."

Əli bəy, Tibbiyyə Məktəbində ikən türk milliyyətçiliyi, türkçülük, ya da turançılıq fikrini daşıyırdımı və yaydımı?

Bu suala cavab verə bilmək üçün yuxarıda göstərilmiş "panturanist" mənzumədən başqa əldə heç bir material yoxdur. Əli bəy, bu mənzuməni hələ Tibbiyyə Məktəbində ikən yazmış olduğunu söyləyir. Hüseynzadə Əli bəyin Tibbiyyə Məktəbindən təbib-yüzbaşı rütbəsi ilə diplom alıb çıxması 1895-ci ildə olduğuna görə, mənzumənin nəşrindən on-on bir sənə öncə meydana gətirilmiş olduğu anlaşılır.

Hüseynzadə Əli bəyin əsl milliyyətçilk fəaliyyəti, Azərbaycana dönüşündən sonra ortaya çıxmışdır. Əli bəy Tibbiyyədən çıxınca, Osmanlı-Yunan Hərbinə əsgəri tibb yüzbaşısı olaraq qatıldı. Sonra 1900-cü ildə müsabiqə imtahanını qazandı və Əsgəri Tibbiyyə Məktəbinə dəri-zöhrəvi xəstəlikləri müəlllim yardımçısı təyin olundu. Ancaq bu vəzifəsində uzun müddət qala bilmədi. Dövrü-Hamidi polisi tərəfindən təqib edildiyinə qənaət gətirən Hüseynzadə Əli bəy, İstanbulu tərk edərək Azərbaycana döndü.

Hüseynzadə Əli bəyin Azərbaycana dönüşü, Akçuraoğlunun Rusiyaya gəldiyi zamanlara təsadüf edir: Rus-Yapon Savaşının başlanması yaxındı. Savaş başlayıb rus məğlubiyyətləri baş göstərincə Rusiyada hər çeşid müxalif ünsürün fəaliyyəti artdı və Çar hökuməti əhaliyə qarşı daha mərhəmətli davranmaq məcburiyyətini hiss etdi. Bu fürsətdən faydalanan Azərbaycan türkləri,

[1] Akçuraoğlu Yusuf, "Hüseynzadə Əli bəy", "Türk yurdu", c. VIII, s. 2555-dən etibarən.

Bakıda Rusiyanın ilk günlük türkcə qəzeti olan "Həyat"ı qurdular. İlk sayı 1905-ci ilin iyununda nəşr olunan bu qəzetin qurucuları Zeynalabdin Tağıyev, Əli bəy Hüseynzadə, Əhməd bəy Ağayev və Əlimərdan bəy Topçubaşı idi. Əli bəy iki il qədər bu qəzetin müdirlik və baş yazarlıq vəzifəsini icra etdi.

Əli bəyin "Həyat"da çıxan məqalələrinin ən önəmliləri "Türklər kimdir və kimlərdən ibarətdir?", "Bizə hansı elmlər lazımdır?" və "Yazımız, dilimiz, "İkinci ilimiz"" adlı məqalələridir. Birinci məqaləsi ilə türklərin irq və dillərinə aid tədqiqlər aparır ki, məqsədi türk qövmlərinin bir bütün, bir birlik təşkil etdiklərini göstərmək və açıqlamaqdır. İkinci məqaləsində "Bizə müasir elmlər lazımdır" deyir, çağdaşlıq aşılayır və bu məqalədə müsəlman türk qövmləri üçün bir əsas olaraq: "türkləşmək, islamlaşmaq, Avropalaşmaq" vacib olduğunu iddia edərək bunu isbata çalışır. Əli bəyin üçlü düsturu, yaxşı tapılmış xoşbəxt əsaslardandır. Bu əsas, türk aləminin hər tərəfinə yayılmış və xüsusən Məşrutiyyətdən sonra İstanbulda çox işlənmişdir. Məsələn, Göyalp Ziya bəy "Türkləşmək, islamlaşmaq, müasirləşmək" məsələsi haqqında bir çox yazılar yazmışdır.

Hüseynzadə Əli bəyin yaradılışı və xasiyyəti, istedad və fəaliyyəti, gündəlik qəzetçilikdən çox dərgi yazarlığına uyğundu; *"Həyat"* qapandıqdan sonra, yenə Zeynalabdin Tağıyevin maliyyə yardımı ilə çıxan *"Füyuzat"* adlı bir dərginin müdirlik və baş yazarlığını üzərinə götürdü. 1906-cı ilin noyabr ayının sonuna qədər çıxan bu dərginin komplekti, Hüseynzadənin siyasi və fəlsəfi fikirlərini anlamaq və yazı üslubunu incələmək üçün çox dəyərli bir mənbədir.

Xüsusən "Füyuzat"da nəşr olunan məqalələrinin məzmun və biçimindən Hüseynzadə Əli bəyin *türk, türkçü, hətta Osmanlıçı* olduğuna dərhal qərar verilir. Bütün türklər arasında Osmanlı türkcəsinin yayılmasını, bütün türklərin ədəbi dilinin Osmanlı türkcəsi olmasını istəyir və özü yazılarını olduqca təmiz Osmanlı ədəbi türkcəsi ilə, o zamanlar İstanbulda mötəbər yeni ədəbiyyati-cədidə üslubu ilə yazır. Siyasi cəhətdən, Osmanlı dövlətini, Osmanlı türklüyünü bağımsız türklüyün nüvəsi sayır. Bu baxımdan, bütün türklük məsələsində görüşü, "Üç tərzi-siyasət"in türkçülük fikrinə yaxın deməkdir.

Əli bəyin "Füyuzat"dakı mücadiləsində ən çox diqqəti çəkən bir yön də Azəri türklərini, bir neçə yüzildən bəri, xüsusən məzhəbçilik vasitəsi ilə çəkməyə çalışan iranlılığa (iranizmə) və ona nisbətən, az bir zaman, hələ 50-60 ildən bəri təsirini göstərməyə başlayan, ancaq daha çox vasitə və gücə sahib olan ruslaşdırmağa (*rusifikasiya*) qarşı türklüyü, türklüyün təmizlik və birliyini müdafiə etməyə xidmət və yardım göstərməsidir. Əli bəy, Azəri türklüyünün müdafiəsində yardımçı qüvvət və dayaq nöqtəsi olaraq, məzhəb ayrılığından yüksək duran islam birliyi və Osmanlı dövlətini görürdü: "Füyuzat" şiə və sünni ayrılığının qalxmasına, Osmanlı-türk mədəniyyətinin tanınmasına, sevilməsinə çox çalışmışdır.[1]

---

[1] Akçuraoğlu Yusuf, "Hüseynzadə Əli bəy", "Türk yurdu", c. VIII, s. 2584.

Yeni azəri ədəbiyyatını marksizm metodları ilə incələyən bir azəri gənci, yeni Azəri ədəbiyyatını bir neçə dövrə ayıraraq, dövrlərdən birinə "Füyuzat" ədəbiyyatı" adını verir və bu ədəbi cərəyanı xarakterizə edərkən deyir ki: "...1905 yılından sonra Azərbaycanda Əli bəy Hüseynzadə baş olmaq üzrə, yeni bir ədəbi axım başlamışdı. Daha öncə "Həyat" qəzetəsi ilə özünü göstərən bu axım, sonra 1906 sənəsindən itibarən "Füyuzat" dərgisində öz gerçək simasını tapmışdır. Bundan dolayı, yeni Azərbaycan ədəbiyyatının bir mərhələsinə Əli bəy, və yaxud "Füyuzat" devrəsi deyilir."

"...Bu ədəbiyyat Mirzə Fətəlidən etibarən davam edən halqçı ədəbiyyatın qarşısına, romantik güzidələr ədəbiyyatı sifatıyla çıxmış və həyata girmişdi. Bu axım üçün ilham qaynağı xalq həyatı göreneği deyil, bəlkə hər türlü halqçılıq və demokratizmdən uzaq olan Osmanlı Tənzimat ve Sərvəti-fünun ədəbiyyatı idi."[1]

O sıralarda Azəri sosial həyatında meydana gələn dəyişiklikləri marksizm baxımından təhlil etdikdən sonra məqalə yazarı Ə. Nazim bəy belə davam edir: "Əli bəy Hüseynzadənin Azəri ədəbiyyatındakı ən böyük hizməti, bu ihtiyacları vaxtında anlayarak hərəkət etməsiydi. Bu ihtiyaçlar Azəri mühit ve aydınlarının artıq Batıya, İrandan və Rusiyadan çox Türkiyəyə dönməsiylə doğmuşdu. Bu isə doğmaqda olan milliyətçilik nədəniyləydi."

"...1905 yılına gəlincəyə qadar qalibiyyət rus mədəniyyətinin malı olmuş və bu mədəniyyət cəmiyyətin hakim və rəhbər ünsürü olmuşdu. Fakat bu uzun sürmədi. 1905 yılında üçüncü bir mədəniyyət sistemi buna əlavə edildi. Bu da Tənzimat dövründən sonra Türkiyədə vücuda gələn Osmanlı-Avropa mədəniyyətiydi.

Bu surətlə rus mədəniyyəti məğlub olmaya və yerini Osmanlıçılığa tərk etməyə başladı. İştə bu hərəkatı vaxtında qavrayan Əli bəy Hüseynzadə qurduğu *"Füyuzat"* dərgisi ilə aydınların bilincini tənzim etmiş ve müəyyən bir istiqamətə yönəltmişdi. Bu surətlə, Osmanlı ədəbiyyate-cədidəsi, həm şəkil, həm dil, həm də mövzu etibarıyla vücuda gəlmiş Azəri ədəbiyyatı üçün bir ideal olacaqdı. "Füyuzat" ədəbiyyatı, iştə bu yeni hərəkatın ve yolun məhsulu olaraq ortaya çıkdı."

Bir az zorla, ayaqlarından çəkilərək, marksizm şəması içinə soxulan bəzi olaylara göz yumsaq, Əli Nazim bəyin "Füyuzat" və "Füyuzat"devrəsi"ni və Əli bəyin bu dövrdəki rolunu, xeyli dəqiqliklə təşhis və təyin etdiyini qəbul edə bilərik.

Qısası, Hüseynzadə Əli bəy, Azərbaycanda yalnız dil və ədəbiyyat sahəsində deyil, hətta siyasət nəzəriyyəsində belə, mərkəz Osmanlı dövləti olmaq üzrə, türkçülük, bütün türkçülük, hətta panturanistlik axımına ilk açıqlıq verən adamdır. Belə bir adam, Rusiyada geriçilik başlayıb, fəaliyyət sahəsi daraldığı vaxt, Osmanlı səltənətində hürriyyət və Məşrutiyyət elan edilən kimi təbii

[1] A. Nazim, "Yeni Azəri ədəbiyyatı haqqında", "Türk yurdu", XII yıl, c. IV, №31, iyul 1927.

olaraq Bakıda, yaxud Tiflisdə oturub qala bilməzdi; 1910-cu ildə İstanbula gəldi. İstanbuldakı fəaliyyətini irəlidə görəcəyik.

**AĞAOĞLU ƏHMƏD BƏY**

Ağaoğlu Əhmәd bәyә, türkçülük hәrәkatında xüsusi bir yer ayırmaq vacibdir -inancındayam. Əhmәd bәy Ağayev, türk milliyyәtçiliyi fikrinә, Şeyx Cәmalәddin Əfqani kimi bütün müsәlmanların, hәtta bütün doğuluların hәyat, xoşbәxtlik, bağımsızlıq vә gәlәcәyi qayğısı ilә bir neçә mәrhәlәdәn keçәrәk çata bilmişdir.

Əhmәd bәy, 1869-cu ildә Azәrbaycanın Şişә (Şuşa) şәhәrindә doğuldu. Şuşa, millәtimizin xalq әdәbiyyatında vә saz şairlәrinin әsәrlәrindә adı çox çәkilәn vә tәbiәtinin gözәlliklәri ilә "dünyanın әn könül oxşayan yerlәrindәn biri olan" Qarabağ yaylasının mәrkәzidir. Vә Ağaoğlunun nәşr olunmamış tәrcümeyi-halında dediyi kimi: "Qarabağ, Şirvan ilә bәrabәr Azәrbaycan türk kültürünün, türk musiqisinin, türk әdәbiyyatı ilә türk milliyyәtçiliyinin dә beşiyidir."

Bir zamanlar Osmanlı imperatorluğu mәmlәkәtlәrindәn olan Qarabağ vә Şirvan, Osmanlı dövlәtinin Doğu әyalәtlәri ilә sıx әlaqәlәr saxladığı kimi, başkәndә göndәrdiyi ziyalıları ilә dә Osmanlı-türk mәdәniyyәtinin yüksәlmәsindә tәsirli ola bilmişdir. Osmanlı–türk şairlәri, alimlәri, siyasilәri arasında qarabağlı vә şirvanlılar az deyildir. Ağaoğlunun baba tәrәfindәn ailәsi tәxminәn XVIII yüzildә Ərzurumdan bütün qәbilәsi ilә Qarabağa köçәrәk Gәncәyә, oradan da Qarabağa gәlib yerlәşmiş vә Qarabağ bәylәrindәn Haqverdioğulları ilә qohum olmuşdur.

Əhmәd bәyin atası Mirzә Hәsәn, hәlә yarı köçәri bir hәyat keçirәn Sarıcallı adlı türk qәbilәsindәn Rәfi bәyin qızı Tәzә xanımla evlәnmiş vә bu evlilikdәn Əhmәd bәy dünyaya gәlmişdir.

Adının qarşısında "Mirzә" sözünün olması da göstәrir ki, Əhmәd bәyin atası ülәma sinfindәndir. Hәlә Mirzә Hәsәnin atası Mirzә İbrahim Şuşanın mәşhur alimlәrindәn sayılırdı, xәttat idi vә türkcә şeir yazırdı. Xüsusәn, Hәmdullah Sübhi bәyin böyükbabası Sami Paşanın mәşhur mәnzumәsini[1] xatırladan aşağıdakı müxәmmәs (beşlik) diqqәtәlayiqdir:

Dila etmә dünyaya zevki-hәvәs:
Cihandan tamah, candan ümid kәs,
Gәlir guşimә dәmbәdәm böylә sәs:
Cihan ey bәradәr, nәmanәd be kәs,
Dil әndәr cihan afәrin bendübәs...

Əhmәd bәyin әmilәri türkcәdәn başqa farsca, әrәbcә vә rusca bilirdilәr. Qısası bütün ailә, Şuşada elm vә ürfanı ilә seçilirdi. Xüsusәn, Mirzә Hәsәnin dayısının ailәsi Qarabağın әn mәşhur

---

[1] Ey zair-i sahib nәfәs!
Hubbi sevadan meyli kәs,
Dünyada qalmaz heç kәs,
Allah bәs, baqi hәvәs...

üləma ocaqlarındandı. Əhməd bəy, uşaqlıqdan belə bir ailənin içində yetişdi: "Gənclik günlərimin hamısını elmi və irfani mücadilələr arasında keçirmək məcburiyyətində qaldım. O zaman hələ Azərbaycan türk ailəsi içində patriarxal adət-ənənələr hakim idi. Olduqca sərt və ağır xasiyyətli olan böyük əmim Mirzə Məhəmməd, bütün ailə üzərində mütləq hakim idi. Onun hər sözü, bərabər yaşayan və ən azından qırx adamdan ibarət olan bütün ailə üzvləri üçün bir qanundu. Mirzə Məhəmməd çox mütəəssüb və dindar adam idi."

"Gün olmurdu ki, evimizin geniş divanxanasına bir çox elm və irfan sahibi toplanıb, plovla nargilə arasında müxtəlif dini məsələlər barədə uzun-uzadı söhbətlər edilməsin."

"O zaman Azərbaycan hələ dini həyatın sıx şəbəkələri içində idi; ortada dini bəhslərdən başqa heç bir qayğı və düşüncə yoxdu... Həlli imkan xaricində olan və önəmi etibarı ilə bir çəyirdək içi doldurmayan incəliklər ətrafında günlərcə, həftələrcə, aylarca, illərcə davam edən mübahisə və söhbətlər olurdu."

"Məsələn, şeyxi, imamın doğrudan doğruya Allahın aracılığına müraciət etmədən aləmi-qeyb, şəfi-rüzi ceza və ilaxiri olduğunu iddia edər, mütəşərri bunu inkar edər. Kərimxani isə imamla bərabər Kərimxan Zəndin də eyni fəzilətlərə sahib olduğunu ortaya sürərdi... Bunlar bir-birlərini lənətləyərək, küfr edərək qovğa edib dururdular."

"Mən uzun illər davam edən bu kimi münaqişələrin və mücadilələrin içində böyüdüm."[1]

Evində gecələri belə anlaşılmaz və sonu olmayan metafizik müzakirələr dinləyən Əhməd bəy, gündüzləri məhəlləsinin məktəbinə gedirdi. O zamanlar, yəni XIX yüzilin son rübündə Şuşa şagird məktəbi də, Əhməd bəyin təsvirindən anlayırıq ki, bütün islam aləmində olan şagird məktəblərinin eynidir; sıra filan yox, məhəllənin altı yaşından on beş yaşına qədər oğlan uşaqları, döşəmə taxtasına diz çökərək çığır-bağır edərək sallanırlar, müəllim əfəndilər, əllərində uzun dəyənək "qorxu oyadan bir tərzdə" otururlar, baş uclarında böyük falaqqa asılı... Məktəbdə yalnız farsca və türkcə dərslər oxudulur. Türkcə Füzulinin "Leyli və Məcnun"u ilə Molla Caminin "Fəriştə"sini əzbərləməkdən ibarət. Digər dərslərin hamısı farsca, bu farsca dərslər içində nələr yox: Sədinin "Bustan" və "Gülüstan"ı, Hafizin divanı, hətta Mirzə Mehdi xanın "İnşa" və "Tarixi-Nadir şah"ı!

Əhməd bəy məhəllə məktəbində oxuyarkən xüsusi bir müəllimdən ərəbcə dərsi aldı. Ümumiyyətlə, oxumağa göstərdiyi istedad və həvəs, falaqqalı xocadan daha qorxunc böyük əmisinin bəzən təqdirini qazanırdı: "Görəcəksiniz, bu oğlum, müctəhid (din mütəfəkkiri) olacaq!" ...deyirdi. Ərəbcədən "Mütəvvəl"ə qədər çıxdığı zaman, şəhərin vali müavini olan dayısının oğullarına öyrətdirməyə başladığı rusca dərslərinə, əmisinin və atasının icazəsi, hətta xəbəri olmadan yalnız anasının razılıq və yardımı, dayısının təşviq və himayəsi ilə davam etdi. Ata

[1] Ağaoğlu Əhməd bəyin nəşr olunmamış tərcümeyi-halından.

və əminin xəbəri olunca, xüsusən, əmi etiraz etdisə də, məqam sahibi olan dayının müdaxiləsi, sərt əminin yumşalmasına yetdi... Və nəhayət Əhməd bəy, şəhərin yeganə çağdaş məktəbi olan rəsmi Rus ikinci dərəcəli məktəbinə girdi.

Şuşa əhalisinin yarısı türk, yarısı erməni idi. Məktəb ermənilərin yaşadığı yuxarı hissədə idi. Məktəbdə ancaq dörd türk uşaq vardı, beşinci olaraq Əhməd bəy gəldi. Əhməd bəy, ilk dəfə bu məktəbdə ermənilərin türk düşmənliyini özünə qarşı münasibətdə təcrübə etdi: "Bu beş adamın illərlə davam edən təhsili zamanı erməni uşaqlarından çəkdiklərini sözlə ifadə etmək imkansızdır. Tənəffüsdə biz, beş türk uşağı, cəld tərpənib arxamızı divara dayamağı böyük bir fərasət hesab edirdik. Yüzlərlə erməni uşaqları birdən üzərimizə hücum edirlər, birisi başımızdan papağı alıb atır, digərləri təpiklərlə dörd, beş altun qiymətində olan Buxara dərisini torpaqlar üzərində yuvarlayırlar. Bəziləri qiymətli və çoxu dəvə yunundan tikilmiş paltarlarımızın ətəklərindən yapışırlar, o yan-bu yana çəkirlər, parçalayırlar, bəzəklərini sökürlər, müqavimət göstərmək istəsək, yumruq, şillə, təpiklər altında bizi əzirdilər. Bəzən birləşib üstümüzə bir böhtan atırlar, birləşib şahid olurlar. Bizi haqsız yerə cəzalandırırdılar. Yoldaşlarımdan çoxu dayana bilmədilər. Məktəbi tərk etdilər. Son sinfə qədər türklərdən bir mən dayana bildim."[1]

Əhməd bəy 1884-cü ildə bu şəhər məktəbini bitirib iki il öncə açılmış olan "Realni-Uçulişe"yə, yəni klassik təhsildən çox real elmlərə, riyaziyyat və təbiət elmlərinə önəm verən bir növ litseyə qeyd oldu. 1877-ci ildə litseyi mükafatla tamamladı.

Əhməd bəy, litsey xocalarının xatirəsini həmişə minnətdarlıq və şükrlərlə anır. Tərcümeyi-halında isə xocalarına dair bu sətirlər var: "Bu sadə, vəzifəsini diqqətlə yerinə yetirən, məslək eşqi ilə dolu olan insanları xatırlarkən indi də dərin bir şükran hissi və minnətdarlıqdan özümü saxlaya bilmirəm. Bunlar məndə və bütün yoldaşlarımda elmə, irfana, həqiqətə qarşı dərin bir iman və eşq yaradaraq bizim üçün həyat yolunu işıqlandıran bir məşəl oldular. O zaman rus ziyalıları, xüsusən Tolstoy, Dostoyevski, Turgenev kimi idealistlərdən ilham alırdılar; çarlığın, istibdadın, zülm və cəbrin, təəssüb və cəhalətin amansız düşməni idilər. Üçüncü Aleksandr kimi zülmkar bir çarın bütün şiddətlərinə, bütün nəzarətlərinə baxmayaraq, bu müəllimlər tələbəyə elm, irfan, gözəllik və hürriyyət eşqini vermək yolunu tapırdılar. Tələbələrinə öz-özlərini tərbiyə etmək və yetişdirmək çarələri aşılaya bilirdilər.[2]

Realnı məktəbi bitirib yüksək təhsil üçün Peterburqa gedib "İnstitue Politechnique" müsabiqə sınağında uğur qazandısa da, sonra gözləri ağrıdığından məmləkətinə dönməyə məcbur oldu. Gözləri yaxşılaşınca, 1888-ci ilin əvvəllərində təhsilini tamamlamaq üçün Parisə getdi. Parisə çatan kimi ilk işi yarımçıq öyrəndiyi fransızcanı tamamlamaq oldu.

---

[1] Nəşr olunmamış tərcümeyi-halından.
[2] Nəşr olunmamış tərcümeyi-halından.

Əhməd bəy, Azərbaycan türkləri içində təhsil üçün Avropaya gedən ilk gəncdir. Moskvaya, Peterburqa, Kiyevə, Əhməd bəydən öncə də dörd-beş gənc getmişdi. Ancaq Rusiya sərhəddini aşa bilməmişdilər. Sərhəddən kənarda olan ölkələrə gedib təhsil almaq ənənəsi ancaq Doğu elmləri və dini elmlər üçün keçərli idi. Din alimi olmaq istəyənlər Kərbəlaya, Məşhədə, Mədinəyə, Misirə gedirdilər. Əhməd bəy, bu ənənənin cəbhəsini dəyişdirdi. Ağaoğluna Parisə getmək fikrini ehtimal ki, ondan on yeddi il öncə Parisdə olmuş Krımlı İsmayıl bəy Qaspıralının hərəkəti ilham vermişdir.

Parisdə altı ay davamlı və israrlı bir çalışmadan sonra, Əhməd bəy 1888-1889 təhsil ilində Hüquq Məktəbinə davamı ilə dərsləri yaxşıca anlaya biləcək qədər fransızcanı əldə etmişdi. Sonrakı il bir tərəfdən Hüquq Məktəbinə davam etməklə bərabər, digər tərəfdən "Ecole des hautes Etudes pratiques"in və "Ecole des langues Orientales vivantes"in bəzi dərslərini izləməyə başladı. Pratik Yüksək İncələmələr Məktəbində professor Ceyms Dermeşteterin (James Darmesteter), "Doğu qövmləri tarixi", Doğu dilləri məktəbində isə Şefer (Scheffer) və Barbiyə Dömanyerin (Barbier de Meynard) ərəbcə, əcəmcə və türkcə dil dərslərini təqib edirdi.

Ağaoğlu məktəblərdə, kitabxanalarda incələmə və araşdırmalarla məşğul olduğu qədər, Avropa həyatını həyatdan anlamağa çalışır və bu həyatı Doğu həyatı ilə qarşılaşdıraraq bəzi nəticələrə çatırdı. Ağaoğlunun Parisə gəlməsindən sonrakı il, 1889-cu il böyük Fransa İnqilabının ildönümü və bu səbəbdən qurulan dünya miqyaslı sərginin açıldığı ildi. Bu sərgidə Batı mədəniyyətinin ən yeni və ən mükəmməl müxtəlif əsərlərini görmək mümkündü. Əhməd bəy, sərgini bir araşdırmaçı gözü ilə seyr etmək və gəzmək fürsətini əldən buraxmadı. Sərgiyə dünyanın dörd tərəfindən məşhur və məchul adamlar toplanmışdı; aralarında doğulular da var idi. İran şahı Nəsrəddin şahla Fransa prezidenti Sadi Carnot bir maşında önündən keçərkən Əhməd bəyin gözləri bu mənzərini simvolik bir dəyər verərək əzbərlədi: "Şahın tacındakı brilyantlar gözləri qamaşdırırdı. Köksü cavahiratla örtülü idi. İri gözləri, qalın çatıq qaşları, dik başı təsviri mümkün olmayan bir qürur və kibrlənməyi ifadə edirdi... "

Carnotun sadə siyah redinqotu, dik bəyaz qalstuku, sadə davranışı bu qürur və kibrlənmə ilə tam bir təzad təşkil edirdi. Mən ilk dəfə hürr və sərbəst milləti təmsil edən bir rəis ilə əzəmət və kibri təmsil edən bir despotu yan-yana görürdüm. Fəqət Paris camaatı bu əzəmət və kibr ilə istehza etmək yolunu tez tapdı..."[1]

Ağaoğlu, şahı bir dəfə də görür. Bu səfər daha çox düşündürücü mənzərə qarşısındadır: "Gecə idi; yenə xalqın iki cərgəsi arasından keçirdi. Yolda üzərindəki üst geyimini hər nədənsə çiyninin bir hərəkəti ilə yerə atdı. Və arxasından gələn sədrəzəmə dönərək "Bərdar!" (*Götür*! -A. K.) əmrini verdi. Zavallı sədrəzəm dərhal bütün camaatın gözü önündə yerlərə qədər əyildi, şahın

---

[1] Eyni yerdə.

paltarını yerdən qaldırdı və bir uşaq kimi qolu üzərində gəzdirdi. Şahın bu ədası və sədrəzəmin bu aşağılanması Doğu istibdadının mahiyyətini göstərən açıq örnəklərdəndi."[1]

Ağaoğlu Əhməd bəy 1890-cı ildə, Əhməd Rıza bəylə tanış oldu. Daha öncə, elçilik müstəşarı şair Fərrux bəylə görüşmüşdü. Uzun illər Əbdülhəmid istibdadı ilə mücadilə edən Rıza bəyi Əhməd bəyə tövsiyyə edən Sultan səfirinin müstəşarı Fərrux bəy olmuşdur; Fərrux bəy qəlbən hürriyyətçi idi və Əhməd Rıza bəyə qarşı dərin bir hörmət duyğusu ilə dolu idi. Ağaoğlu da Əhməd Rıza bəyə qarşı o zamanlar dərin bir hörmət duyar. Əbdülhəmid, səfiri vasitəsi ilə ona yüz min frank təklif etdiyi halda fəqir Əhməd Rızanın bunu qəbul etməməsi gənc və idealist Əhməd bəyin sevgi və sayğısını coşduran səbəblərdən idi.

Bu zaman Əhməd bəy, Parisin alimləri ilə, ədibləri ilə də tanış olur. Alimlərin və ədiblərin toplandığı salonlara qəbul olunur. Paris həyatını bilənlər bunun o qədər asan olmadığını bilirlər. Bir-iki ildə alim və ədiblərin toplandıqları salonlara girmək və davam edə bilmək üçün Əhməd bəyin özünü müəllimlərinə ciddən təqdir etdirə bilmiş olması vacib idi.

"Professor James Darmesteterin sevgisini qazandım; adı keçən haqqımda unudulmaz yaxşılıqlar və qeyrətlər göstərməyə başladı. Məni evinə dəvət etdi, Parisdə önəmli bir ədəbi salon sahibi olan və Paris ədibləri arasında seçkin bir yer qazanmış olan Marie Robensoneoa təqdim etdi. Mən də Robensoneonun salonuna müntəzəm davam etməyə başladım. Bu salon ziyarətçiləri arasında o zaman Fransanın məşhur alimi və ədiblərindən olan Ernest Rönan (Ernest Renan), Hipolit Ten (Hyepolit Thaine), Caston Paris (Gaston Paris), Opert (Oppert), Madam və Müsyö Diyolafua (Dieulafoi) kimi şəxslər var idi. Ev sahibəsi məni bunlara təqdim etdi..."[2]

Əhməd bəy, Parisdə ikən Doğu və Batı alimlərini qarşılaşdırmağa imkan verən qəribə bir hadisənin şahidi olur. Daha öncə Doğunun şahlarından biri ilə, Batının bir hökumət başçısını yan-yana görmüşdü. Bu səfər də Doğunun dərvişlərindən biri ilə Batının tədqiqatçıları arasında olur. Və bu qəribə hadisə özünün də dediyi kimi, irəlidəki alın yazısının təyininə vasitə oldu. İran şahı Parisdə olduqdan bir müddət sonra, bu böyük şəhərə əfqanlı bir dərviş gəlib çıxır. "Çox gözəl, ucaboylu, əsmər və dolğun üzlü, köksünə qədər uzanan qalın qara saqqallı, üzəri təsbehlərlə örtülü bu əcayib adam" çox səyyah dərvişlər kimi diyar-diyar dolaşaraq İstanbula gəlmiş və İstanbulda ikən İran şahının Parisə getmiş olduğunu eşitmiş və bunun üzərinə özü-özünə: "madam ki Şahi-İran be Paris mirəvəd, mən ki şahi-cihanəm, çera nerevəm?!"[3] demiş və Paris yolunu tutub oraya qədər gəlmiş. "Şahi-cihan" Paris küçələrində qərib dərviş qiyafəti ilə, əlində kəşkül və əsası ilə dolaşırkən, polis yaxalamış, yersiz, yurdsuz bir sərsəri kimi dərhal həbsxanaya salmışdır. Bir qəzetdən, doğulu bir dərvişin həbs olunduğunu öyrənən Əhməd bəy, həbsxanaya gedib həmin adamı öz yaşadığı

---

[1] Eyni yerdə.
[2] Basılmamış tərcümeyi-halından.
[3] Madam ki, İran şahı Parisə gedə bilir, mən ki, cahan şahıyam, nə üçün getməyim?!...

yerdə yaşatmaq zəmanəti ilə qurtarır. Paris mətbuatı, dərvişlə, dərvişin sərbəst və orijinal sözləri ilə ilgilənir və nəhayət Əhməd bəyin sevgili ustadı, İran din və mədəniyyəti uzmanlarından Darmesteterlə digər şərqşünaslardan bəziləri də Əhməd bəyin vasitəsi ilə dərvişi görür və söhbət edirlər. Darmesteter, dərvişlə etdiyi söhbətin qısa məzmununu yazıb ona verməsini Əhməd bəydən istəyir. Bu söhbət ustadın ön sözü ilə "Jurnal de Deba"da (Journal des Debats) eyni ilə nəşr olunmuşdur. Bu əhvalatı daha ətraflı anlatdıqdan sonra Əhməd bəy belə deyir: "Mənim birinci dəfə mətbuat sahəsinə atılmam bu şəkildə başladı; və o gündən bu günə qədər taleyimi müəyyənləşdirdi."[1]

Demək olar ki, Ağaoğlu Əhməd bəy, *hələ 21 yaşında ikən yazarlığa fransızca bir məqalə yazaraq, 1890-cı ildə Parisdə başlamış olur.* Onu mətbuata bir ön söz ilə təqdim edən şəxs, o zamanın məşhur fransız alimlərindən ustadı James Darmesteter idi. Məqalədə əfqanlı dərviş münasibəti ilə Doğunun fəlsəfə və təsəvvüfündən, həyat və ədəbiyyatından bəhs edilməkdədir. Məqalənin qaralaması və ya basılmışı bu gün Əhməd bəyin özündə yoxdur.

Artıq yazarlıq həyatına atılmış olan Ağaoğlu, yenə ustadı Darmesteterin tövsiyyəsi ilə Madam Adamın (Mme Adam) aylıq "Nüvel Rövü"sü *(Nouvelle Revue)* ilə həftəlik "Rövü Blö" *(Revue Bleue)* dərgisinə, Doğu qövmləri və həyatına dair yazılar yazmağa davam etdi. 1802-ci ildə Londonda toplanan Şərqşünaslar Konqresinə qatılaraq, konqresdə "Şiə məzhəbinin qaynaqları" adlı bir tədqiq təqdim etdi. Bu incələmə, konqrenin qərarı ilə basılmış və yayımlanmışdır.

Görünür ki, Əhməd bəy, Parisdə təhsil ilə məşğul ikən, şəhsi və ailəvi istedadına, meylinə əlavə olunan ustadlarının təşviq və yol göstərməsi ilə elm, yazı həyatına girmişdi, ən çox məşğul olduğu mövzular, Doğunun tarixi və dinləri idi. Eyni zamanda qəzetçilik də edirdi; Tiflisdə çıxan rusca "Kafkas" adlı qəzetdə həftədə bir dəfə Parisdən yazılıb göndərilmiş silsilə məqalələri nəşr olunurdu. Rus qəzetlərinin silsilə məqalələrini daim yaxşı üslubla yazılmış, bir az da elmi mahiyyətli məqalələr təşkil edir. Əhməd bəy, bu məqalələrində islam aləmi və islam aləminin türk həyatı ilə məşğul olurdu.[2]

Ağaoğlu Parisdə ikən Şeyx Cəmaləddin Əfqani ilə də tanış oldu. Şeyx o zaman Parisə gəlmişdi. Əhməd bəy tərcümeyi-halında deyir ki: "İslam aləmi düşünürlərindən Cəmaləddin Əfqani həzrətləri Parisdə olduğu zaman mənim sadə evimi başqalarından üstün tutmuş, həftələrlə bərabər qalmışdıq..."

---

[1] Basılmamış tərcümeyi-halından.

[2] Əhməd bəyin "Revue Bleue"da nəşr olunmuş bir məqaləsini, bundan on-on iki il əvvəl onda görmüşdüm. Bu həyat dövründə yazılmış digər məqalələrini, təəssüf ki, görə bilmədim. Əhməd bəyin o zamankı düşüncə tərzini, idealını lazımi səviyyədə öyrənmək üçün bu məqalələrin incələnməsi lazımdır.

Daha öncə, naməlum əfqanlı dərbədər dərvişi həbsdən qurtarıb öz yaşadığı yerdə bir müddət saxlayan Əhməd bəy, sonra məşhur bir əfqanlı səyyah şeyxi də -bəlkə eyni otaqda qonaq etmiş deməkdir!...

Ağaoğlu Parisdə altı ilə qədər qaldı: Hüquq Məktəbindən məzun oldu- diplom aldı, "College de France"dan bir diplom aldı və 1894-cü ildə mayda Parisi tərk edərək İstanbul yolu ilə Qafqaza döndü. İstanbulda dörd aya qədər qaldı, və o zaman maarif naziri olan Münif Paşa və Qafqaziyalı tarixçi Murad bəylə sıx-sıx görüşdü, fikir mübadiləsi etdi. İstanbula ilk dəfə gəldiyi zaman Ağaoğlu Əhməd bəyin daşıdığı fikir və əməlləri göstərən yazılı əsərlər, təəssüf ki, əlimizdə mövcud deyildir.

Əhməd bəy ta iyirmi yaşından bəri müxtəlif dillərdə çox yazılar yazmış bir türk yazarıdır. Çox təəssüf ki, yazılarını özü saxlamadığı kimi, bu gün kitabçılardan və ya kitabxanalardan axtarıb tapmaq da çox çətindir, çünki Əhməd bəyin yazılarından çoxu qəzet və dərgilərdə nəşr olunub yayımlanmışdır; hələ rusca qəzetlərdə yayımlanan məqalə və silsilə məqalələrini tapmaq, zənn edirəm ki, bu gün imkan xaricindədir... Bu səbəbdən Əhməd bəyin fikri dəyişmə və inkişafını, əsərlərindən təqib etmək həlli çətin olan bir məsələ halındadır.

Qafqaza dönüşündən sonra, Əhməd bəy Parisdən məqalələr göndərdiyi Tiflisin "Kafkas" qəzetinə yazarlıq etdiyi kimi, Tiflisin Gimnaziyasında da fransızca müəllimi oldu.

O zamanlar Bakıda rusca "Kaspi" adlı bir qəzet çıxırdı. Bakının türk zənginlərindən məşhur *neft milyoneri Hacı Zeynalabdin Tağıyev* "Kaspi"ni satın alaraq Azərbaycan türklərinin hüququnu müdafiə edən və onların faydalarına xidmət edən rusca bir türk orqanı halına gətirdi. Və bu qəzetin baş yazarlığına Ağaoğlu Əhməd bəyi cəlb etdi.[1] Əhməd bəy bu vəzifəni yerinə yetirməklə bərabər, Bakı Gimnaziyasında və Bakı Yüksək Ticarət Məktəbində fransızca müəllimliyini də üzərinə götürdü.

1902-ci ildə Ağaoğlunun təsiri ilə Hacı Zeynalabdin rus hökumətindən türkcə bir qəzetin nəşri və yayımlanmasına izin almağa çalışdısa da, müvəffəq ola bilmədi. Rusiyanın o dövrdəki siyasəti Rusiyada yaşayan müsəlmanların öz dillərində mətbuat nəşrinə, hər şəkildə əngəl olmağı qarşısına məqsəd qoymuşdu. Min cür çətinliklərlə çarpışmağa məcbur olan "Əkinçi", "Ziya", "Kəşkül" çox davam edə bilməmişdilər. Necəsə daha öncə İsmayıl bəy Qaspıralıyə yarısı türk, yarısı rusca yazılmaq üzrə bir qəzet yayımı üçün verilən imtiyazın da bir siyasi xəta olduğunu Rusiyanın müsəlman və türk təbəəsi içlərində ixtisas sahibi sayılan misyoner İlminski və professor Smirnov kimi nüfuzlu şərqşünasları iddia edib dururdular. "Tərcüman"ın qapadılması üçün bir çox təşəbbüs oldu isə də, İsmayıl bəyin zəka, məharət və enerjisi; bütün türk və islam düşmənlərinin intriqalarına qarşı duraraq 20-30 milyonluq türk kütləsinin öz dilində çıxan bu kiçik həftəlik, yeganə qəzetinin yayımının davamını təmin edə bilmişdir. Ancaq bir ikinci "Tərcüman"ın da meydana

---

[1] Nəşr olunmamış tərcümeyi-halından.

çıxmasına rus bürokratiyası uğurla mane ola bilirdi. Və bu durum Rus-Yapon müharibəsinə, yəni 1904-cü ilə qədər davam etdi.

Rus-Yapon Savaşında çarlığın məğlubiyyəti illərdən bəri hazırlanan rus inqilabı hərəkatına qüvvət və cəsarət vermişdi. Hökumətin zəifləməsindən istifadə edərək Zeynalabdin Tağıyev də öncəki təşəbbüsünü təkrarladı, bu dəfə müvəffəq oldu. Bakıda, ümumiyyətlə, bütün Qafqazda ilk dəfə olmaqla türkcə gündəlik bir qəzet, *"Həyat"* çıxmağa başladı. O zamanlar İstanbuldan Qafqaza dönmüş olan Hüseynzadə Əli bəylə Ağaoğlu Əhməd bəy Azərbaycan *türk* qəzetinin başına keçdilər.

Daha öncə Axundzadələr, Məlikzadələr, Ünsizadələr Qafqazda türk milli duyğu və şüurunun oyanmasına az-çox təsir etmiş olmaqla bərabər, bu şüurun qüvvətli və müəyyən bir hala gəlməsi, iddia edilə bilər ki, Azərbaycanda gündəlik mətbuatın nəşrindən etibarən başlayır. *Və bu böyük işin ilk xidmət edənləri Hüseynzadə ilə Ağaoğludur.*

Əhməd bəy, "Həyat"da bir il qədər çalışdıqdan sonra ayrılaraq müstəqil "İrşad" adlı gündəlik qəzet çıxarmağa başladı. Bu, Azərbaycan türklərinin ikinci gündəlik qəzeti idi. "İrşad"ın məsləkini şəxsən Ağaoğlu belə anladır: "Bir tərəfdən rus hökumətinə qarşı mücadilə edərək hər növ siyasi və ümumi hüquqdan məhrum olan türk ünsürünə bu hüququ da təmin etməkdən, digər tərəfdən türk ünsürünün özündə birlik fikrini təmin etmək məqsədi ilə məzhəb ayrılığını və xüsusən sünni-şiə düşmənçiliyini qaldırmağa çalışmaqdan ibarət idi. Bununla bərabər, xalqı elm və irfana isindirmək, türkcə məktəb və digər irfan müəssilərini vücuda gətirmək üçün çalışmaq lazımdır."[1]

Həqiqətən, Azərbaycan türklüyünün əhəmiyyətli məsələlərindən birini də sünni-şiə anlaşılmazlıq və düşmənçiliyi təşkil edirdi. Bir zamanlar bu ayrılıqlardan yararlanan iranilik, bütün Azərbaycanı farslaşdırmağa çalışmışdır. Ruslar Azərbaycana hakim olunca, bu ayrılıq və düşmənçiliyi körükləyərək davamlı bir-biri əleyhinə düşmənçilik edən bu iki islam firqəsinin arasını daha böyük açaraq türk millətini zəiflətməyə, bu sayədə öz hakimiyyətlərini qurmağa, qüvvətləndirməyə çalışmışdılar.

Bu təməlsiz və mənasız məzhəb ayrılığının zərərlərini, bundan düşmənlərin yararlanma dərəcəsini göstərərək və isbatlayaraq *Qafqaz türklüyündə birliyin ortaya çıxmasına ən çox çalışan millət xidmətçiləri İsmayıl bəy Qaspıralı ilə Ağaoğlu Əhməd bəy, Hüseynzadə Əli və Topçubaşı Əlimərdan bəylərdir.*

Azərbaycan və İran türklüyünün məzhəb ayrılığı yarası Əhməd bəyi əskidən bəri məşğul etməkdədir. Qafqaza döndüyü zamanlar yazılmış danışıq tərzində nəşr olunmamış bir risaləsinin mövzusu məzhəb ayrılığının islama verdiyi zərərlərdir.[2]

---

[1] Nəşr olunmamış tərcümeyi-halından.
[2] Bu risalənin adı *"İslam və Axund"*dur. Nəşr olunmadığı halda Azərbaycan ruhaniləri və mütəəssüb xalq arasında bir xeyli dedi-qoduya və yazarına qarşı düşmənçiliyə yol açmışdır.

Ağaoğlu, bu kitabçada islamla bir şiə axundunu danışdırır. Fəqir və zəif islam, xüsusən məzhəb ayrılığı üzündən başına gələn fəlakətləri, zəngin və şişman axundun qan fışqıran sırtıq üzünə hayqırır. Həyəcan və hərarətlə yazılan bu risalədən Əhməd bəyin dini və məzhəbi məsələlərdə geniş, dərin bilgisi ortaya çıxdığı kimi, o zamanlar, yəni 1900-cü illərə doğru, qövmünün inkişaf və irəliləməsinə islamın xətalı anlaşılmasını və xüsusən bundan doğan məzhəblər ayrılığını ən önəmli bir maneə saydığı da məlum olur.

Əhməd bəy, türkcə qəzetçiliyə başlamadan öncə *"İslama görə və islamda qadın"* adlı rusca bir kitabça yazıb nəşr etdirmişdir.[1] Bu kitabça da basılmamış türkcə "Dialoq" kimi islamın görüşlərində irəliçi olduğunu, Abbasilərin orta dövrünə qədər bu mütərəqqi hərəkat davam etdiyi halda, daha sonra alimlərin və şeyxlərin mənfəətcikləri üzündən islamın gerilədiyini və çökdüyünü iddia etməkdədir. Əhməd bəy bu kitabçasında islamın irəliləməsi və geriləməsinə ölçü olaraq "qadın"ı almışdır. Əhməd bəyin araşdırmasına görə, həzrəti peyğəmbər, qadını əski İran mədəniyyətinə və islamdan öncəki ərəb adətlərinə nisbətən çox yüksəltmişdir. "Quran"ın ruhuna görə, birdən artıq həyat yoldaşı ilə evlənmək məsləhət deyildir. İslam aləmində "Quran"ın əmrlərinə, peyğəmbərin sözlərinə, İran və Assuriya mədəniyyətlərinin qələbəsindən etibarəndir ki, qadın, kültürəl və sosial mövqeyindən düşməyə başlamışdır. "Türk-tatar" qövmlərinin islamı qəbulu ilə islam aləminə hakim olmasından sonra, qadının mövqeyi təkrar yüksəlmişsə də, bu qüvvətli ünsürün adət qanunları belə Doğunun əski mədəniyyətlərindən olan İran və Assuriya mədəniyyətlərinə qalib gəlməyərək, qadın yenə kültürəl və sosial baxımlardan düşmüş və nəhayət bugünkü (yəni 1901-ci ildə Azərbaycandakı) dərəcəsinə enmişdir.

İslam qövmlərinin qurtuluş və irəliləməsini təmin etmək üçün, Ağaoğlunun fikrincə, xüsusən iki önəmli məsələnin həlli lazımdır: *qadın məsələsi və əlifba məsələsi*.

Düşüncə və görüşlərini çox diqqətəlayiq gördüyüm bu kitabçanın son səhifələrini eynilə tərcümə edirəm: "Müsəlmanların qurtarılması, onların mənəvi, maddi, hətta siyasi yüksəlişləri, yalnız iki məsələnin həllinə bağlıdır: qadın məsələsi və əlifbanın islahı."

"Zamanımızda müsəlman qadını, ancaq sərbəst və şüurlu bir ana, bir həyat yoldaşı oluncadır ki, sosial vəzifəsini yerinə yetirə biləcəkdir. Yalnız bu şərtlər daxilində uşaqlarının xarakter və iradəsini tərbiyə edə bilir və onlara yüksək duyğular və əsil fikirlər aşılaya bilər; bugünkü şərtlər dairəsində müsəlman qadının uşaqları bir qisim mənasız mövcudiyyətlərdən ibarətdir."

"Boğucu hərəm havası içində keçirilən tənbəl və sırf heyvani bir həyat, qadının fiziki inkişafına icazə vermədiyindən, irqin fiziki çöküşünə də yol açmaqdadır. Əlifbanın çətinliyi isə oxuyub yazmağı çətinləşdirdiyindən müsəlmanların ağıl və qəlblərinin aydınlanması yolunu qapamaqdadır. Qadın və əlifba, iştə islam aləminin iki ən həqiqi düşməni, onun müalicə olunmayan

---

[1] Bu əsər Tiflisdə, 1901-ci ildə Martirosyans Mətbəəsində basılmışdır.

iki xəstəliyi ki, onların təsiri altında bu aləm yavaş-yavaş məhv olmaqdadır. Yalnız son zamanlarda müsəlmanlar bu iki məsələni ciddiliklə göz önünə almağa başladılar. Ancaq bu barədə İstanbul, Qahirə, Bombey və Kəlküttədə göstərilən xidmət və qeyrətlər -ki oğlanlara olduğu qədər qızlara da məktəb açmaq və əlifba islahı təşəbbüslərində ortaya çıxmaqdadır- yetərli sayılmaz; bütün bu qeyrətlər, mütləq ölümlə nəticələnəcək uzun sürən və öldürücü xəstəliyə qarşı zəif və keçici əlaclar dərəcəsindədir. Müsəlman aləminin oyanması və o aləmin mədəni millətlər mühitinə girə bilməsi üçün, *çox ciddi bir sarsıntıya ehtiyac vardır. Müsəlmanların öz islahat dövrünü keçirmələri və içlərindən olduqca qüvvətli bir iradə sahibi və nəfsini iş üçün tamamilə fəda etməyə hazır bir adamın gəlib çıxması lazımdır.*[1] Belə bir islahatçı yuxarıda gördüyümüz kimi şəxsən islamda, islamın tarix və ənənələrində əməllərinə uyğun bir zəmin tapa bilər. Təkrar edirik: nə "Quran", nə şəriət özlüyündə inkişafa qarşı deyildir. Yalnız onların daşıyıcısı olan şeyxlər və alimlər faydaları uğrunda "Quran" və şəriətə mədəniyyətlə uyuşmayan bir şəkil verməyə çalışmışlar. Bunu çox gözəl bilən misirli yenilikçi Məmməd Əli, Misirin şeyxlərini və alimlərini sarayında toplayaraq ətraflarını özünə tamamilə sadiq olan üç sıra əsgərlə əhatə etdikdən sonra etdiyi yeniliklər və islahatı ölüm təhdidi altında onlara təsdiq və imza etdirdi."

"Müsəlman dini, əslində sevinc gətirən və irəliləməyi sevəndir. İslam, qədəri, hər hansı uğursuz və uydurma bir qüvvətin insan həyatına dəhşətverici və qəddar təzyiqi tərzində anlamaz, islama görə qədər, meydana gəldikdən sonra hadisələr ilə uyuşmanı təmin edən bir nəzəriyyədir ki, insanları qüvvətləndirər və qeyrətləndirər. Müsəlmanların peyğəmbəri şəxsən bir neçə dəfə təkrar etmişdir: "Dəvəni Allaha əmanət et, amma daha əvvəlcə dizini yaxşıca bağla!"

1901-ci ildə nəşr olunan 59 səhifəlik bu kiçik kitabçanın əhatə dairəsi, o dövrdə müsəlman mütəfəkkirlərinin düşüncə tərzinə uyğundur. İslamı islah ilə islamda bir sıra islahat edərək, müsəlman qövmlərini çöküşdən qurtarmaq, irəliləmə və yüksəlməyə sövq etmək. Ağaoğlu Əhməd bəy, bu risaləsində bütün müsəlmanlarla məşğuldur; onun türkçülük duyğusunu, ancaq türklərin, öz ifadəsi ilə "türk-tatar"ların qadına verdikləri dəyəri ifadə edən bu sətirlərdən çıxara bilərik: "Türk-tatar qadınını idealizə etməkdədir. Əhməd bəyin "İslama görə və islam aləmində qadın" risaləsində düşmənçilik hədəfi əski İran mədəniyyətidir. Ərəblərin İran mədəniyyətinin üstün təsirindən uzaq olduqları zamanlar, islamda qadının yeri və dolayısı ilə müsəlmanların mədəni səviyyəsi yüksək idi; türk qadınını aşağılayaraq türk həyat və mədəniyyətinin inkişafına, yüksəlməsinə mane olan qüvvət də o köhnə və çürük İran mədəniyyətidir.

Əlimizə keçən bu iki əsərində Ağaoğlu Əhməd bəyin də bir çox türkçü kimi, öncə islamın islahı, islamın əsil özünə döndərilməsi məsələsi ilə məşğul olduğu anlaşılır. Hələ Parisdə ikən Doğunun tarixinə, xüsusən ədəbiyyat tarixinə dair dərsləri təqib etmiş və bu yolda şəxsi

---

[1] Kursiv bizimdir (A. Y.). (Cəmaləddin Əfqaninin fikirləri ilə qarşılaşdırılsın).

araşdırmalar aparmış olduğundan, ilk araşdırma yazısının, fəaliyyətinin də bu mövzular üzərində olması təbiidir. Bununla bərabər, məmləkətinə dönüncə Azərbaycanın real həyatı Əhməd bəyin fikri-praktik fəaliyyətinin dini məsələlərdən milli və sosial məsələlərə keçməsini zəruri etmişdir.

Ağaoğlu bir tərəfdən *"İrşad"*ı çıxarırkən, digər tərəfdən eynən İsmayıl bəy Qaspıralı kimi yaydığı əsaslı fikirlərin həyata keçməsinə, gerçəkləşməsinə şəxsən çalışır. Qafqazda şəhər-şəhər dolaşaraq, bir çox şəhər və qəsəbədə məktəblərin, təhsil yayma cəmiyyətlərinin qurulmasını təşkil edirdi.

Türklər arasında özünü göstərən bu oyanış əsərlərini çəkə bilməyən qonşuları *ermənilər*, 1904-cü ilə doğru, türklər əleyhinə açıq düşmənçilik vəziyyəti aldılar və ermənilərlə türklər arasında real mücadilələr başladı. Ermənilər müntəzəm milli təşkilata sahib olduqları kimi, siyasi səbəblərdən, dini ortaqlarının və rus idarə mexanizmasında bir çox ermənilərin yerləşmiş olmalarına görə çar hökumətinin yardımına da nail olurdular. Türklərin ermənilərlə çarpışa bilmək üçün təşkilata ehtiyacları olduğu açıq idi. Bu ehtiyacı təmin etmək üçün Ağaoğlu Əhməd bəy 1905-ci ildə Bakıda "Fədai" adı ilə gizli bir cəmiyyət qurmağa müvəffəq oldu. "Fədai" cəmiyyətinin fəaliyyəti, ermənilərin türklərə qarşı işlədikləri zülmləri, gerçək dirənişlərlə müəyyən dərəcədə durdura bilmişdir. Şuşa məktəbində ikən ermənilərlə çarpışmaya başlayan Ağaoğlu Əhməd bəyin "Fədai" təşkilatı ilə həyat sahəsində və böyük ölçüdə qovğaya davam etdiyini görürük...

1905-ci ildə, çar hökumətinin anayasalı (*konstitusiyalı*) idarə formasına yönəlmə məcburiyyəti Peterburqda bir nazirlər kabineti qurulmasına yol açdı. Bu komitənin başında olan Kont Vesite məmləkətin hər bir tərəfindən gələn nümayəndə heyətlərini qəbul edərək, şikayət və istəklərini dinləmək zərurətini hiss etmişdi. 1906-cı ildə Rusiyanın türk əhalisi də Quzeydən, Doğudan, Güneydən nümayəndə heyətləri göndərdilər. Kazandan gələn heyətdə yuxarıda adı keçən Akçuraoğlu Yusuf olduğu kimi, Qafqaziya əhalisini təmsil edən heyətin aydınlarından Ağaoğlu Əhməd bəy, Hüseynzadə Əli bəy, Topçubaşı Əlimərdan bəy seçilmişdilər. Ağaoğlu bu heyətin ən fəal üzvü olmuşdur.

1907-ci ildə Bakı ətrafında, yəni neftli torpaqlar üzərində yaşayan türk əhalisini köçürmək məqsədinə yönəlmiş bir layihənin müzakirəsi üçün Petroqradda toplanan xüsusi komisyona, yenə Azərbaycan türk əhalisinin təmsilçisi kimi Ağaoğlu Əhməd bəylə üç yoldaşı göndərilmişdi. Bu komissiyanın üzvlərindən ermənilərlə bir sıra rusların olduqca çox qüvvət və qeyrət sərf etmələrinə baxmayaraq, heyətin otuzbeş gün davam edən müzakirələrinin sonunda türklərin köçürülməsi məsələsinin qarşısının alınmasına müvəffəq olunmuşdur.

Ağaoğlu Əhməd bəy bir tərəfdən milli ehtiyac və mənafelərin zəruri etdiyi bu kimi praktik xidmətlərdə çalışarkən, digər tərəfdən də yazarlığında əsla ara vermirdi: istər Nazirlər Komitəsinə istəklər siyahısı aparan təmsilçilər heyəti üzvlüyü sırasında nazirlərə dərd anladıb yorularkən, istər

Kont Kokoftsev komisyonunda ermənilərlə saatlarca çəkişərkən, Peterburq qəzetlərində də, Azərbaycan türklərinin haqqını və ehtiyaclarını müdafiə edən, rus bürokratiyası ilə ermənilərin türklərə yönəltdikləri iftiraları yalanlayan və bunların türklər əleyhinə çevirdikləri müxtəlif intriqaları pozan mahiyyətdə məqalələri nəşr olunurdu. Eyni zamanda Əhməd bəy, Bakıdakı qəzetinə, yəni *"İrşad"*a uzun məktublar yazmağa vaxt tapırdı. Əsasən, Əhməd bəyin çox və asan yaza bilmək istedadı fövqəladədir; türkcə, rusca, fransızca məqalələri eyni asanlıqla və sürətlə yazardı, hətta farsca məqalələr də yazmışdır. Özü bəzən zarafat edərək: "həyatımda yazdığım məqalələr, hamısı bir araya gətirilsə, Bakıdan İstanbula qədər bir geniş yol meydana gətirə bilər" deyir.

İstər yazılı, istər əməli fəaliyyəti, Ağaoğlu Əhməd bəyi, rus hökumətinin gözündə şübhəli və təhlükəli insanlardan saydırdı. Baxmayaraq ki, Əhməd bəyin yazılarında hədəf tutduğu ümumi məqsəd, Azərbaycan türk millətinin oyanması, Rusiyada yaşayan bütün millətlərlə (dolayısı ilə ruslarla da) bərabər hüquqa sahib və bu yöndən milli haqlarına sahib olmasını təmin etməkdi. Bu məqsədə nail olunduğunda, müxtəlif yollarla eyni məqsədə doğru gedən digər Qafqaz millətləri ilə bərabər, Azərbaycanın da Rusiya imperatorluğundan ayrılması nəticəsi öz-özlüyündən doğacaqdır; Azərbaycan türklərinin müstəqilliyinin, onların qonşu böyük türk kütləsinə qatılmalarını təmin etməsi də çox təbii idi... Məhz bu görüşlər, Azərbaycan türklüyünü oyanmağa, şüurlanmağa, milli və insani haqlarını müdafiə etməyə dəvət edən Əhməd bəyin rus hökuməti tərəfindən təhlükəli və zərərli sayılması səbəblərini açıqlayır; xüsusən Ağaoğlu Əhməd bəy, yalnız yazı ilə kifayətlənməyib "Fədai" cəmiyyətini quraraq fəaliyyət göstərmək kimi praktik sahələrdə də tək durmayan enerjili insanlardandır...

Bu şəkildə çar hökumətinin şübhə və düşmənçiliyini çəkən Ağaoğlu Əhməd bəylə qəzeti *"İrşad"*, ikidə bir hökumətin hücumuna məruz qalırdı: bəzən Əhməd bəyin evi axtarılır, bəzən mətbəəsi basılır, bəzən də qəzet bağlanırdı: ancaq daha öncə alınmış olan bir çox icazədən faydalanaraq qapanmış qəzetin yerinə dərhal bir digəri çıxarılırdı... Bir çox zəhmət və məsrəfi zəruri edən bu mücadilədə Azərbaycan türk zənginləri Əhməd bəyə ciddi şəkildə yardım etmişdilər. Bu da onu göstərir ki, *Azərbaycanda 1907-ci ilə doğru türk milli şüuru xeyli inkişaf etmişdi.*

Əhməd bəyin Parisdə ikən tanış olduğu "Jon türklər"dən bəziləri də ara-sıra *"İrşad"*da məqalələrini nəşr etdirmiş olduqlarından, bu qəzetin Osmanlı məmləkətlərinə girməsi yasaq idi; ancaq bu yasaq, uzun müddət davam edə bilmədi, çünki İstanbulda inqilab meydana gələrək idarə şəkli dəyişdi.

Osmanlı inqilabı ərəfəsində rus inqilabı bir irtica dövrü keçirirdi. Baş nazirlik məqamına keçən Stolipin, 1905-ci ildə qarışan və dağılmağa üz tutan Rusiyanın idarə qaydalarını sağlam və şiddətli əllərinə alaraq təkrar mütləqiyyətə doğru çevirmiş və yuxarıda sözü keçən "3 iyul hökumət

çevrilişi” ilə xüsusilə demokratiyanı və millətlərin hüququnu məhdudlaşdırmışdı. Bu istiqaməti alan daxili siyasət, Rusiyanın sosial tərəqqisinə və Rusiyada millətlərin formalaşmasına çalışan aydınların təzyiq altına alınmasını zəruri edəcəkdi. Bununla bərabər, Stolipin dövründə, xüsusən inqilabçılarla millətçilər təqib edildilər və təzyiq altında saxlandılar. Ağaoğlu Əhməd bəy də təqibə məruz qalanlardandır: “Şiddətlə təqib edilənlər arasında idim. İş o dərəcəyə gəldi ki, artıq yalnız özümün deyil, ailəmin də rahatlıq və sakitliyi qaçırılmağa başlandı. 1908-ci ildə Türkiyədə inqilab olmuşdu. İş başına tanıdığım bəzi şəxslər gəlmişdi. Eyni zamanda Qafqaz ümumi valisi Kont Varantsov-Daşkov mütləq məni tutmağa və sürgün etməyə qərar vermiş görünürdü. Bunu öyrənir-öyrənməz dərhal mən də qaçmağa qərar verdim və 1908-ci ilin sonuna doğru İstanbula qaçdım.[1]”

Osmanlı inqilabı, türklük üçün çalışmaq istəyənləri bütün türk aləmindən İstanbula çəkirdi; Ağaoğlu Əhməd bəyi də çəkdi, gətirdi. 1908-ci ildən sonra Ağaoğlunun İstanbulda çox zəngin və bərəkətli olan fəaliyyət dövrü başlayır.

---

[1] Nəşr olunmamış tərcümeyi-halından.

## TÜRKÇÜLÜKDƏ TƏŞKİLATLANMA DÖVRÜ

1908-ci il Osmanlı İnqilabından sonra türk milliyyətçiliyi hərəkatı çox genişlənmiş, dərinləşmiş və qol-budaq atmışdır. 1909-dan 1928-ci ilə qədər keçən iyirmi illik dövrün tədqiqini, bu ilki "Türk yılı"nə yetişdirmək mümkün olmur. Bu üçdə bir yüzillik dövr, indiyə qədər bəhs etdiyimiz yarım əsrlik dövrdən çox daha qarışıq və önəmli hadisələri özündə ehtiva etdiyindən, olduqca çox incələmə və araşdırmaya ehtiyac vardır. Bunların incələnməsi və qarşılaşdırılması, xeyli zaman aparacağı kimi, incələməmizin həcmi də bəlkə məqaləmizin bir yarım, iki misli olacaqdır.

"Türk yılı"nın ikinci bir nüsxəsini də nəşr etdirmək mümkün isə, türkçülük hərəkatının, Osmanlı Məşrutiyyət və Türkiyə Cümhuriyyəti zamanlarında qazandığı açıqlığı ətraflıca qeyd və təsbit etməkdə də bəlkə müvəffəq oluruq.

Bununla bərabər, indi bu məqaləni bitirmədən öncə, "Türk yılı"nı nəşr edən və türkçülük hərəkatının sosial sahəsində ən önəmli bir təşkilatlanma olan "Türk ocaği" ilə "Türk ocağı"nın quruluşuna öncülük edən milli təşkilatlara və "Türk ocağı"nın gerçək qurucusu Həmdullah Sübhi bəyə dair bir qədər məlumat verməyə çalışacağam.

Osmanlı dövlətinin Məşrutiyyət dövrü, türkçülüyün təşkilatlanmasına və türkçü cəmiyyətlərin qurulmasına imkan vermişdir. Mütləqiyyət dövründə hər növ cəmiyyət qurmaq fövqəladə dərəcədə çətindi, hələ milliyyət əsası üzərinə cəmiyyət qurulmasına hökumət əsla icazə verməzdi. Bununla bərabər, *müsəlman və türk olmayan təbəənin milliyyət əsasına dayalı, xeyriyyə və ədəbi maskalarla örtülü bir xeyli cəmiyyəti də var idi.*

### "Türk dərnəyi"

Türkiyədə türk milliyyətçiliyi əsasına dayanaraq qurulan ilk cəmiyyət "Türk dərnəyi"dir. 1908-ci ilin noyabrında İstanbula gələn Akçuraoğlu Yusuf hələ məktəb həyatından xatırladığı bəzi türkçüləri, yəni Nəcib Asim bəylə Vələd Çələbi Əfəndini ziyarət edərək siyasi olmayan, sırf kültürəl mahiyyətdə bir türk cəmiyyəti qurulmasını təklif və onların bu yolda rəhbər olmalarını rica etdi. Bu şəkildə başlayan ilk təşəbbüs, ilin ortalarına doğru Mülkiyyə Məktəbi müdiri Cəlal bəy mərhumun otağında olan bir toplantıda "Türk dərnəyi" adlı elmi bir cəmiyyət halında təşkilatlanmışdır.

*Bu cəmiyyətin nizamnaməsi 12 kanuni-əvvəl 1324 (25 dekabr 1908) tarixi ilə və "Türk dərnəyi Nizamnaməsi" adı ilə İstanbulda "Karapet" mətbəəsində nəşr olunmuşdur.*

Cəmiyyətin məqsədini ifadə edən nizamnamənin ikinci maddəsində belə deyilir: "Cəmiyyətin məqsədini türk deyə anılan bütün türk qövmlərinin keçmişdəki və bu günkü əsərlərini, işlərini, durumlarını, mühitini öyrənməyə və öyrətməyə çalışmaq yəni türklərin əski əsərlərini, tarixini, dillərini, avam və xavas (şifahi və yazılı) ədəbiyyatını, etnoqrafiya və etimologiyasını, sosial durumlarını və mövcud mədəniyyətlərini, türk məmləkətlərinin əski və yeni coğrafiyasını araşdırıb ortaya çıxararaq bütün dünyaya yayıb tanıtmaq və dilimizin açıq, sadə, gözəl, elm dili ola biləcək şəkildə geniş və mədəniyyətə əlverişli bir dərəcəyə gəlməsinə çalışmaq və imlasını ona görə incələməkdir."

Mülkiyyə Məktəbi toplantısından sonra qəzetlərə verilən bir elanda toplanan adamların adları açıqlanmışdır: Əhməd Midhət Əfəndi, Nəcib Asim bəy, Bursalı Tahir bəy, Korkmazoğlu Cəlal bəy(bu gün Qafqaz cümhuriyyətlərinin birində komissardır) Vələd Çələbi Əfəndi, Akçuraoğlu Yusuf, Boyaçıyan Akop əfəndi, Arif bəy (mərhum tarixçi), Ağyigidoğlu Musa bəy (mərhum Yüksək Əsgəri Baytar Məktəbi iqtisad öyrətməni idi), Fuad Raif bəy, Rıza Tofiq bəy, Fərid bəy (bu günkü London elçisi).

Sırf elmlə məşğul olacaq bu cəmiyyətə türk olmayan türkiyyatçılar da daxil ola bilərdi.[1]

15 təşrini-əvvəl 1328-ə qədər (noyabr 1912) üzvlük haqlarını ödəyən şəxslərin tamamı, cəmiyyətin kassa dəftərinə görə 63 nəfər görünməkdədir. Bunların içində professor Qordlevski, doktor Qaraçon, professor Martin Hartman kimi şərqşünaslar, Boyaçıyan Akop və Antuan Tınqır əfəndilər kimi türk olmayan Osmanlılar da vardır. Prins Said Paşa, Köse Raif Paşa, Xalid Ziya bəy kimi zamanın bəzi dövlət böyükləri, üzv olmadan nəqd yardım etmişdilər. Şair Məmməd Əmin bəy, İsmayıl bəy Qaspıralı, Hüseyn Cahid bəy, Azərbaycan Cümhuriyyəti baş vəkillərindən Yusifbəyzadə Nəsib bəy, Ağaoğlu Əhməd bəy, Hüseynzadə Əli bəy, Köprülüzadə Fuad bəy, "Türk ocağı" qurucularından doktor Fuad Sabit bəy və mərhum İspartalı Haqqı bəy ilk illərdə yazılan üzvlərdəndir.[2]

"Türk dərnəyi", məqsədini aşılamaq və yaymaq üçün, qəzetlər, risalələr, kitablar nəşr edəcək və ümumi dərslərlə söhbətlər təşkil edəcəkdi. Öncə Nəcib Asim bəyin "Türklərin ən əski yazısı" ilə Bursalı Tahir bəyin "Türklərin ülum və fününa xidmətləri" adlı risalələrini basdı və yayımladı. Sonralar "Türk dərnəyi" adlı "Türklüyə dair incələmələri özündə ehtiva edən", "ayda bir çıxan" bir dərgi çıxardı. "Türk dərnəyi"nin birinci ilinin birinci sayı 1327 (1911) ilində "Mətbəəyi-Xeyriyyə və Şürəkası"nda nəşr edilmişdir. Bu dərginin ancaq yeddi sayı yayımlana bilmişdir. Nüsxələrdə yayımlandıqları ay göstərilməmişsə də, 1327 (1911) ilində ancaq altı nüsxənin basılmış

---

[1] "Cəmiyyətin məqsədinə xidmət etmək istəyən hər kəs, hansı din, cins və tabeeyyətdən olursa olsun, mərkəzdəki idarə heyətinə şifahi və ya yazılı müraciət etdiyi təqdirdə onun girişi cəmiyyətin iki üzvünün zəmanəti ilə və idarə heyətinin təsdiqi ilə qəbul olunur." *"Türk dərnəyi" nizamnaməsi,* maddə: 4.

[2] Şair Məmməd Əmin bəy, Ağaoğlu Əhməd bəy, Hüseynzadə Əli bəy, Mülkiyyə Məktəbindəki toplantı zamanı İstanbulda deyildilər.

olmasından, hər ay bir dərgi yayımlana bilmədiyi anlaşılır. “Türk dərnəyi” adına Akçuraoğlu Yusuf tərəfindən “Çingiz xana” dair ümumi bir dərs verildiyi kimi, o zamanlar bir neçə dəfə mitinqdə “Türk dərnəyi”nə mənsub natiqlər məqsədlərinə uyğun məruzələr etmişlər.

“Türk dərnəyi”nin həyatı uzun davam edə bilmədisə də, atdığı toxum verimsiz torpağa rast gəlmədi. Dərnəyin bir aralıq xeyli müntəzəm davam edən idarə heyəti toplantılarına, dövlət idarəsi başında durmağa hazırlanan bəzi kimsələr də müsafir kimi gedib-gəlirdilər. Ənvər bəyin dayısı Xəlil bəyin, Baha Şakir bəyin müsafirliklərini xatırlayıram.

Bir müddət sonra, dərnəyin ən fəal üzvlərindən Miralay Raif Fuad, Miralay Nəcib Asim bəylərin bölüklərinin başına getmələri, Vələd Çələbi Əfəndinin Konya Böyük Çələbiliyinə təyin olunması, Akçuraoğlu Yusufun İstanbuldan ayrılması, dərnək toplantılarını seyrəkləşdirdiyi kimi dərginin də qapanmasına səbəb olmuşdur.

Ancaq, “Türk dərnəyi” dərgisinin son nüsxəsinin yayımlanmasından çox az zaman sonra “Türk yurdu” adlı və daha geniş proqramlı bir türkçülük dərgisi yayımlanmışdır.

**“Türk yurdu”**

“Türk yurdu” dərgisini yayımlayan “Türk yurdu” cəmiyyəti idi. Hökumət “Türk yurdu” cəmiyyətinin quruluşundan 18 avqust 1327 (1911) tarixli rəsmi arayışla xəbərdar olduğunu təsdiq etmişdir. 1911-ci ilin sonlarında “Türk yurdu” dərgisinin ilk nüsxəsi yayımlanmışdır.

“Türk yurdu” nizamnaməsinə görə, cəmiyyət, türk çocuqlarına məxsus bir pansiyon açacaq, “türklərin zəka və irfanca səviyyələrinin yüksəlməsinə, gəlir və təşəbbüs sahibi olmalarına xidmət etmək üzrə bir qəzet çıxaracaqdır.” (maddə: 4). “Türk yurdu”nun qurucuları bunlardır: Məmməd Əmin bəy (türk şairi), Əhməd Hikmət bəy (mərhum, əski xariciyyə vəkaləti müstəşarı), Ağaoğlu Əhməd bəy, Hüseynzadə Əli bəy, Doktor Aqil Muxtar bəy, Akçuraoğlu Yusuf. *“Türk yurdu” fikrini şair Məmməd Əmin bəy ortaya atdı.* “İttihad və tərəqqi” cəmiyyəti bu təşəbbüsə diqqət göstərdi. “Türk yurdu” cəmiyyəti təmsilçiliyinə Akçuraoğlu Yusuf seçildi. 1912-ci ilin sentyabrında Əhməd Hikmət bəy Peşte səfirliyinə təyin edilmiş olduğundan, yerinə Göyalp Ziya bəy seçildi. “Türk yurdu”nun quruluş sıralarında Ziya bəy hələ Səlanikdə idi. “Türk yurdu” dərgisinin imtiyazı şair Məmməd Əmin bəy adına alınmışdı. Məmməd Əmin, 1911-ci ildə avqustda Ərzurum valisi olduğundan, dərginin imtiyazı və müdirliyi Akçuraoğlu Yusufa həvalə olundu. İlk nüsxəsindən etibarən, “Türk yurdu”nu Akçuraoğlu çıxardı.

1911-ci ildə “Türk yurdu” yazı və tərtib tərzinə dair müdiri Akçuraoğlu tərəfindən irəli sürülüb, idarə heyəti və yazı heyəti tərəfindən bəzi dəyişikliklərlə qəbul olunan proqramın əhatə etdiyi önəmli xüsuslar bunlardır:

“1. Risalə türk irqinin mümkün olduğu qədər əksəriyyəti tərəfindən oxunub anlaşılacaq və faydalanılacaq bir tərzdə yazılacaqdır.”

“Buna görə, b) dili sadə olacaqdır; c) qövmün əksəriyyətinə faydalı mövzular seçiləcəkdir; d) çətin mövzular belə asan ifadə edilməyə çalışılacaqdır. Bununla bərabər, aydın düşüncə sahiblərinin zövqü, mənafeyi gözdən qaçırılmayacaqdır.”

“2. Risalə bütün türklərə məqbul ola biləcək bir ideal yaratmağa çalışacaqdır.”

“3. Risalədə türklərin bir-birlərini tanımalarına, iqtisad və əxlaqca yüksəlmələrinə və fənni biliklər cəhətdən zənginləşmələrinə xidmət edən mövzular ən yüksək yer alacaq, siyasət bunlardan sonra gələcəkdir.”

“4. Türklərin bir-birini tanımaları üçün türk dünyasının hər tərəfində olub keçən və xüsusilə qardaşlar arasında sevinc və kədər doğuran hadisələr ilə türk dünyasının müxtəlif yerlərində doğan fikir axımları qeyd olunacaq və türk irqinin çeşidli qövmiyyətlərində doğan ədəbiyyatı irqin bütün üzvlərinə bildirmək üçün çalışılacaqdır.”

“5. Risalə, Osmanlı dövlətinin daxili siyasətindən söz edərkən, heç bir siyasi partiyaya tərəfdarlıq etməyəcək, ancaq türklüyün, türk ünsürünün siyasi və iqtisadi mənafeyini müdafiə edəcəkdir. Türk ünsürünün mənafeyini müdafiə edərkən, müxtəlif ünsürlər arasında anlaşılmazlıqlar doğmasından qaçınmaya çalışılacaqdır.”

“6. Risalə, Osmanlı türkləri arasında türk milli ruhunun inkişafına və qüvvətlənməsinə, idealsızlıqdan doğan tənbəllik və bədbinliyin qaldırılmasına çox çalışacaq və əksərən heç bir şeyə dayalı olmadan ortaya çıxan mübaliğəli Batı qorxusundan da bu milləti qurtarmağa əlindən gəldiyi qədər çalışacaqdır.”

“7. Risalənin dövlətlərarası siyasətdə əsas fikri, türk aləminin mənafeyini müdafiə etməkdir.”

“Türk yurdu” dərgisi, Akçuraoğlu Yusufun bəzi kiçik aralarla idarə etdiyi altı il içində, bu proqrama sadiq qalaraq, proqram maddələrini, işlərini mümkün olduğu qədər tətbiq etməyə çalışmışdır.

“Türk yurdu”nun türk çocuqlarına məxsus pansiyonunun inşasına Vəqflər Naziri Xeyri bəy (Allah rəhmət etsin!) zamanında başlanmış və inşaat çatıyı alacaq qədər irəliləmiş olduğu halda, adı keçənin ölümündən sonra bu gözəl təşəbbüs üzü üstə qalmışdır. Binanın tamamlanması və gözəl istifadə olunması, Türk Maarif Cəmiyyətinin qeyrətindən ümid və təmənna olunur.

“Türk yurdu” dərgisi bu gün davam etməkdədir və bu gün bu dərgi, “Türk ocağı” tərəfindən yayımlanmaqdadır. İlk nüsxəsi 1911-ci ilin noyabr ayının əvvəllərində yayımlanmışdır. Dolayısı ilə, *dərgi bu gün 17 yaşındadır.*

**“Türk ocağı”**

“Türk ocağı”nın rəsmən doğuşu “Türk yurdu”nun yayımlanmaya başlamasından bir neçə ay sonradır. “Türk ocağı”nın rəsmən quruluş tarixi, “Türk ocağı”nın əsas Nizamnaməsinin birinci maddəsində göstərildiyinə görə, 12 mart 1328-dir (1912).[1] Ancaq irəlidə görüləcəyi kimi, qurulması üçün təşəbbüslər daha öncədən başlanır. “Türk ocağı”nın Əsasi və Daxili Nizamları” adlı ilk nizamnaməsi, İstanbulda 1913-də “Mətbəəyi-Xeyriyyə və Şürəkası” adlı mətbəədə basılmışdır. Bu nizamnamənin ikinci maddəsində cəmiyyətin məqsədi belə açıqlanmaqdadır: “İkinci maddə: cəmiyyətin məqsədi: islam qövmlərinin başlıca mühümü olan türklərin milli tərbiyə və elmi, sosial, iqtisadi səviyyələrininin irəliləmə və yüksəlməsi ilə türk irq və dilinin zənginləşməsinə çalışmaqdır.”

Cəmiyyətin çalışma tərzi üçüncü və dördüncü maddələrdə göstərilmişdir: “Üçüncü maddə: Cəmiyyət məqsədini əldə etmək üçün “Türk ocağı” adlı klublar açaraq dərslər, konfranslar, müsamirələr təşkil etməyə, kitab və risalələr yayımlamağa və məktəblər açmağa çalışacaqdır.”

“Milli sərvəti qorumaq və çoxaltmaq üçün hər cür məslək və sənət sahibləri ilə görüşərək iqtisadi və zirai təşviq və uyarıda olacaq və bu kimi quruluşların doğub yaşamasına əldən gəldiyi qədər yardım edəcəkdir.”

“Dördüncü maddə: Ocaq, məqsədini əldə etməyə çalışarkən sırf milli və sosial bir durumda qalacaq, *əsla siyasət ilə uğraşmayacaq və heç bir siyasi firqəyə xidmət etməyəcəkdir.”*

Rəsmi şəkildə 1912-ci ilin əvvəllərində qurulan “Türk ocağı”nın daha öncədən başlanmış uzun bir doğuş dövrü vardır: Hələ 1911-ci ilin ilkbaharında Əsgəri Tibbiyyə Məktəbi tələbələrindən bir qrup, türk millətinin millət kimi formalaşmasına çalışmaq arzu və amalı ilə öz aralarında toplanaraq fikir mübadiləsi etmiş; nəhayət düşüncələrini xeyli dəqiqləşdirdikdən sonra 11 may 1911-ci il tarixli məktublarla məhz bu fikirlərindən yararlana biləcəkləri bəzi kimsələrə üz tuturlar. Bu məktubların biri də mənə göndərilmişdi. Məktub belə başlayır: “Çərşənbə, 11 may 1327

Əfəndimiz!

Türk irqinin maarif və məktəblərinə xidmət edərək, ictimai gələcəyini təmin amalı ilə toplanmış 190 Tibbiyyəli tələbə adından zati-alilərinə müraciət edirik. Məqsədimiz ərz edəcəyimiz şeylərə hakimanə və ədibanə fikirlərini öyrənməkdir.”

Bu şəkildə başlayan məktub “türk qövmünün məhv olma dövrünü yaşadığını” söyləyərək buna “sələflərimiz kimi ilgisiz qala bilməyəcəyimizi” bildirdikdən sonra, “həyatın əbədi bir mücadilə olduğuna və bu mücadilədə uğurun ən böyük şərtinin maarif və məktəblərin qələbəsi”

---

[1] “Türk dərnəyi”, “Türk yurdu” və “Türk ocağı” adlı ilk türkçülük təşkilatlarının quruluş tarixləri “Türk yılı”nın birinci sayında yanlış göstərilmişdir: mövcud rəsmi sənədlərə görə bu müəssisələrin qurulma tarixləri, mətndə açıqlandığı kimi belədir: “Türk dərnəyi: 25 dekabr 1908, “Türk yurdu”: 18 avqust 1911; “Türk ocağı”: 12 mart 1912.

olduğuna hökm edirdi. Daha sonra bu Tibbiyyəli gənclər özlərinin "təkamül qanununa riayət fikrində israrlı" olacaqlarını ifadə edərək, "əkinçilik, ticarət və sənaye ilə qazanılmış ictimai hakimiyyəti quru bir siyasi hakimiyyətdən üstün tutduqlarını" açıqlayır və bu fikirlərini belə bir arzu ilə tamamlayırdılar: "Gələcək nəslimiz, miskinliyi günah, fəaliyyəti ibadət bilsin! Təşəbbüskar, qüvvətli və sərvət sahibi olsun!"

Bu amalların gerçəkləşməsi üçün "hər cür firqə ixtilaflarının üstündə, hər cür siyasət qalmaqallarının xaricində yeni bir axım doğması"na lüzum görürlər; və bu axımı doğurmaq üçün də Donanma Cəmiyyəti qədər geniş, ancaq sırf milli, sosial bir cəmiyyət meydana gətirmək ehtiyacını da duyurdular.

Bu cəmiyyət irəlidə Anadoluda, Rumelidə və hətta türk olan digər məmləkətlərdə şöbələr açacaq, ziraət, ticarət və sənaye məktəbləri quracaqdı.[1]

Bu cəmiyyət tanınmış və qüdrətli şəxslərin nəzarəti altında idarə ediləcəkdi.

Məktub belə bitirdi: "Belə bir cəmiyyətin təməl daşlarını ali məktəblərə davam edən türk gəncinin maddi-mənəvi fədakarlıqları ilə atacağıq."

"Bu barədə hakimanə və ədibanə görüşlərinizi öyrənmək istədiyimizi bildirir və elmi və əməli işbirliyində bulunmalarını israrla təmənna eylərik, əfəndimiz!

190 Tibbiyyəli türk övladı."

Mütarikə zamanı "Türk ocağı" və "Türk yurdu"nun nüsxələrini ingilis işğal qüvvətinin təzyiqi ilə evdən-evə daşıyarkən qurtara bildiyim sənədlər arasında, bu məktublara bəzi tanınmış adamların verdikləri şifahi cavabların qeydləri də vardır; ancaq nöqsanlıdır. Gələcək "Türk yılı"nda türkçülük tarixinin Məşrutiyyət dövrü incələnirkən, bu qaynaqlardan yararlanaraq, "Türk ocağı"nın doğuşundan ətraflıca bəhs edərik, bu konspektdə ancaq bir neçə önəmli nöqtəni təsbit edib keçəcəyik.

Mövcud mənbələrdən anlaşılır ki, fransız dilində yayımlanan "Jon türk" adlı qəzet aprel sonlarında və mayın əvvəllərində (1911), "parlaq uğurları ilə gözləri qamaşdırmaqda olan Milli Donanma Cəmiyyəti kimi "*qövmi bir Türk Maarif Cəmiyyəti meydana gətirmək*" fikrini ortaya sürmüş və "Tanin" qəzeti də bu fikrə qatılmışdır.

Bu qəzetləri diqqətlə təqib edən Tibbiyyəli gənclərdən bəziləri, öz aralarında belə düşünmüşdülər: "Belə böyük amalları feilən gerçəkləşdirmək üçün qövmün gəncləri birləşməli, o artıq doğmuş olan amalı fikrən və real olaraq bəsləməli, yaşatmalıdır."

Tibbiyyəli idealist gənclər bu işi öz vəzifələri hesab edirlər: "Bu tibb müəssisəsində bu gün insanların acılarını aradan qaldırmaq üçün çalışmaqda olan bizlər, bir vaxtlar qövm və din fərqi düşünmədən bu Osmanlı vətənini siyasi cəhətdən uçurumlara düşməkdən qorumaq məqsədi ilə

---

[1] Məktubdakı kursivlər bizimdir (A. Y.).

təməl döşəyən sələflərimiz kimi[1]", bu gün də türk qövmünün sosial süqutunun önünü almaq üçün ilk addımları atmalıyıq."

Bu sətirləri, Tibbiyyəlilər tərəfindən yazılıb bəzi adamların fikirlərini öyrənmək üçün göndərilən və bir qismi yuxarıda gətirilən bəyannamənin 4 may 1327 (1911) tarixli ilk variantından çıxardım. Əldə mövcud mənbələr əsasında bu variantdan daha öncə yazılmış heç bir yazı yoxdur.

Bu eskizdən bunu da anlayırıq ki, Tibbiyyəli gənclər, özlərinin "Jon türk"də yazı yazan Cəlal Nuri bəydən ən çox ilham aldıqları inancındadırlar.

Tibbiyyəlilər, "Cəhlə qarşı mücadilə" düsturu ilə xülasə etdikləri bu hərəkata təşəbbüsçü olaraq başlanğıcda aralarından bu əfəndiləri seçirlər: *"Dördüncü sinifdən Mahmud, Rəfət, Ədhəm, Haşim, Cəlal, Behcət, üçüncü sinifdən Hüseyn Fikrət, Hüseyn Cahid (Baydur), Möhsin, Nəşət, Lütfi, Süleyman, ikinci sinifdən Həbib Əfəndilər."*

20 iyun 1911-ci ildə, Tibbiyyədən 231 tələbə adına gəlmiş nümayəndələr (Hüseyn Fikrət və Rəmzi Osman bəylər) ilə tələbənin dəvətini qəbul edərək toplantıya gəlmiş olan Məmməd Əmin (şair), Fərid (bu günkü London elçisi), Yusuf (Akçuraoğlu), Məmməd Əli Tofiq (yazar), Əmin Bülənd (şair), Fuad Sabit, Ağaoğlu Əhməd bəylər toplanaraq, qurulacaq cəmiyyətin adını "Türk ocağı" şəklində qəbul etmişdilər və "Türk ocağı"nın qurucuları ilə müvəqqəti İdarə Heyətini seçmişdilər:

*Qurucuları*:

Şair Məmməd Əmin bəy

Əhməd Fərid bəy

Ağaoğlu Əhməd bəy

Doktor Fuad Sabit bəy

*Müvəqqəti İdarə Heyəti:*

Başkan: Məmməd Əmin bəy

İkinci başkan: Yusuf bəy (Akçuraoğlu)

Katib: Məmməd Əli Tofiq bəy

Mühasibat: Fuad bəy (Doktor Fuad Sabit)

Eyni toplantıda ocağın ilk nizamnamə əlyazmasının müzakirəsinə başlanmış olduğu kimi, idarə mərkəzi toplantı yeri olmaq üzrə də Şərəf küçəsində 5 nömrəli ev (Akçuraoğlu Yusuf bəyin yaşadığı pansiyon) "Türk dərnəyi Otağı" olaraq göstərilmişdir.

Tibbiyyəlilərin quruculuğa və idarə heyəti üzvlüyünə namizəd olaraq göstərdikləri iyirmi adamlıq siyahının içində türkçülük hərəkatı ilə sonradan heç bir əlaqəsi olmayan bəzi adamlar

---

[1] Burada "İttihad və tərəqqi" cəmiyyəti nəzərdə tutulmaqdadır. Gerçəkdən də bu cəmiyyətin qurulmasına da ilk təşəbbüs edənlər, Tibbiyyə Məktəbi tələbələri idi.

olduğu kimi, “Türk ocağı”nın yaşamasında, inkişafında çox böyük xidməti keçən *Həmdullah Sübhi bəy* də var idi.

“Türk ocağı”na ilk önəmli maddi yardımı, 50 Osmanlı altını vermək surəti ilə Hüseyn Cahid bəy (“Tanin” yazarı) etmişdir.

Yuxarıda haqqında bəhs etdiyimiz hadisələrə görə, *“Türk ocağı”nın əməli surətdə qurulmasını 20 iyun 1327-ci ilə (1911) təsadüf edən bazar ertəsi günü olaraq qəbul edə bilərik.*[1] Rəsmən quruluşu isə, daha öncə göstərdiyimiz kimi, 12 mart 1328 (1912), yəni əməli surətdə quruluşundan doqquz ay sonradır.

Bu müddət içində idarə mərkəzinin yeri iki dəfə dəyişmiş, bir çox toplantılar olmuşdur. Bu toplantıdan ancaq 5 avqusta qədər olan beş toplantının protokolları məndədir.[2] Müzakirələr, ümumiyyətlə nizamnamə üzərində cərəyan etmişdir. Haqqında danışılan məsələlərdən ən çox mübahisə açan məsələ bu olmuşdur: Cəmiyyət məqsədini əldə etmək üçün “Türk ocağı” adlı klublar açsınmı? Yoxsa risalə, dərgi nəşr etməklə və məktəblər açmaqla kifayətlənsinmi? *Tibbiyəli tələbələr, klublar açılarsa, işə siyasət qarışacağından qorxur və buna görə klub açmanın şiddətlə əleyhinə çıxırdılar.*

“Türk yurdu” cəmiyyətinin rəsmən quruluşu 18 avqust 1911-ci il olduğuna görə, ocağın feilən qurulduğu 20 iyun 1911-dən sonra deməkdir. Bununla bərabər “Türk yurdu”nun qurulmasına çalışılarkən 20 iyundan daha öncə məsələyə dair bəzi yazışmalar olduğu da “Yurd”a dair mənbələrdən anlaşılmaqdadır.

Buna görə “Türk yurdu” ilə “Türk ocağı”nın hər ikisinin 1911-ci il ilkbaharından etibarən quruluş çalışmasına başlanılaraq, o ilin yayında qurulması mümkün olmuşdur -deyə bilərik.

---

[1] Bu 20 iyun toplantısından öncə, bir neçə toplantı da olduğu, qısası 29 may bazar günü Ağaoğlu Əhməd bəyin evində toplanıldığı və bu toplantıda bir nizamnamə qələmə alınması qərarlaşdırıldığı yenə mövcud sənədlərdən anlaşılmaqdadır.

[2] Başqalarını tapmaq mümkün olmadı.

**“Gənc Qələmlər”**

İstanbulda “Türk dərnəyi”, “Türk yurdu” və “Türk ocağı” adlı quruluşlarla türkçülük fikrinin təşkilatlanmasına çalışılarkən, *Səlanikdə “İttihad və tərəqqi” Mərkəzi Heyəti üzvlərindən, özünə “Göyalp” adını verən Ziya bəyin təlqin və ilhamları ilə mərkəzdə bir türkçülük axımı başlamış olduğu kimi,* o zamanlar Səlanikdə çıxmaqda olan *“Gənc Qələmlər”* dərgisi də Göyalpın təsiri ilə türkçülük təbliğ etməyə başlamışdır. Bir xeyli axtardığım halda, *“Gənc Qələmlər”*in tam komplektini tapmaq mümkün olmadı. *“Gənc Qələmlər”*in bəzi şərtlər qoyaraq dili sadələşdirmək haqqında ilk yazılarını hansı tarixdə nəşr etmiş olduğunu dəqiqləşdirə bilmədim. Bu dərgi “Yeni lisan və bir araşdırma” adlı bir kitabça da çıxararaq, müdafiə etdiyi görüş haqqında bir növ “Anket” də yaratdı. Ancaq əlimizdə mövcud olan bu risalənin də heç bir yerinə tarix qoyulmamışdır! Bununla bərabər, *“Türk yurdu”nda “Gənc qələmlər”i tənqid edən mahiyyətdə çıxan bir yazıda* Səlanikli dərginin İstanbullu arkadaşı çıxmaya başladıqdan sonra türkçülük yoluna girdiyini iddia etmək mümkündür. Hətta bu iki dərginin eyni zamanda türkçülüyə başladıqları düşünülsə belə, hər ikisinin “Türk dərnəyi” ilə nəşr olunan dildə türk milliyyətçiliyi düşüncəsini əsas aldıqları həqiqəti örtülə bilməz və inkar oluna bilməz... Qısacası, nə deyilirsə deyilsin -məsələn “İttihad və tərəqqi” qeyrətkeşləri bir zamanlar bütün fikri hərəkatların da qaynağını öz cəmiyyətlərində göstərmək istəyərək təbliğatlar etmişdilər- Osmanlı dövlətində kültürəl türkçülüyün ilk təşkilatı “Türk dərnəyi” cəmiyyəti və ilk türkçü dərgi də *“Türk dərnəyi”* dərgisidir...

Səlanikdə yerləşən əsrarəngiz “İttihad və tərəqqi” komitəsi, formalaşmaqda olan bütün fikri, sosial və siyasi hərəkatları özünə aid etmək amalında idi. “Türk dərnəyi” qurulunca üzvlərindən bəzilərinin oraya gəlib getdiyi göründü. Tibbiyyə tələbəsi arasından “İttihad və tərəqqi”yə çox bağlı və dost olmayan bəzi gənclər tərəfindən “Türk ocağı”nın təməlləri atılmağa başlanınca, “Türk ocağı”nın qurulmasına və “Gənc Qələmlər”in türkçülük etməsinə “İttihad və tərəqqi” cəmiyyətinin təşviqçi və yardımçı olduğunu görürük. Get-gedə “İttihad və tərəqqi” üzvlərindən bir qismi, açıqdan açığa türkçülüklərini ifadə və elan etməkdə günah görmürlər. Bu şəkildə “Türk yurdu” və “Türk ocağı”nı “İttihad və tərəqqi” cəmiyyətinə bağlı imiş kimi göstərmək belə istəyirlər. Və bu məqsədə çatmaq üçün Cəmiyyət hər iki müəssisəyə pul yardımı da edir; ancaq türkçülük müəssisələri cəmiyyətin müxtəlif vasitələrlə göstərdiyi təsirlərə qarşı dura bilmiş və “İttihad və tərəqqi” cəmiyyətinin dağılmasına qədər xüsusiyyət, əsliyyət və muxtariyyətini qorumuşdur.

“Türk ocağı”nın xüsusiyyət və şəxsiyyətini qoruyaraq davamlı inkişaf və irəliləməsində ən çox xidməti görülən ocaqlı Həmdullah Sübhi bəydir.

## Həmdullah Sübhi bəy

Yuxarıda söyləmişdik ki, Həmdullah Sübhi bəy Ocaq qurulduğu zaman Tibbiyyəli tələbələrin Müvəqqəti İdarə Heyəti üzvlüyünə namizəd göstərdiyi 20 nəfərlik siyahıya daxil idi; lakin o zamanlar (1911) Həmdullah bəyi lazımi səviyyədə tanıyanlar az olduğundan Müvəqqəti İdarə Heyəti üzvlüyünə seçilə bilməmişdi. Ocaq qurulub, Divan Yolunun Mərcan ağa məscidinə yaxın hissəsində özünəməxsus bir neçə otaq da təmin etdikdən sonra Həmdullah bəy öz ifadəsinə görə, Akçuraoğlu Yusufun vasitəsi ilə 25 yanvar 1328-ci ildə (1912) 776-cı nömrə ilə Ocağa üzv yazıldıqdan sonra, çox tez gerçək yerinə yüksəldi; yəni idarə heyəti başqanı oldu. Həmdullah bəyin Ocağa alındığı zaman idarə heyətində başkan Əhməd Fərid bəy, ikinci başqan Akçuraoğlu Yusuf idi. Ümumi katib bu gün Bükrəş elçisi olan Hüseyn Rağib bəydi.

Həmdullah bəyin ocağa girməsini təqibən toplanan qurultayın seçimində başkanlığa Həmdullah Sübhi bəy keçdi, ikinci başkanlıqda yenə Akçuraoğlu Yusuf qaldı.

Həmdullah bəy, Ankarada Mərkəz Heyəti binasının təməl daşı qoyularkən (21 mart, 1927) söylədiyi qüvvətli və gözəl nitqində ilk daxil olduğu zaman “Türk ocağı” binasının halını belə təsvir etmişdir: “Bundan 16 il öncə idi. İstanbulun tarixi bir caddəsinin kənarında, sadə bir evin üst mərtəbəsində iki boş və fəqir otaq... orada toplananlar, bir toplantı təşkil etdikləri vaxt dinləyiciləri oturtmaq üçün lazım olan qədər stul tapa bilməzdilər. Aşağı küçəyə enərlər, ətraf qəhvələrdən öz ciblərindən verdikləri kiçik pullarla stul alar, bunları bellərində Ocağa gətirirlər və toplantıdan sonra yenə geri təhvil verərdilər. “Türk ocağı”, onu rədd və inkar edən bir hava içində doğuldu. Ona hər kəs qarşı idi. Hətta bir çox türk aydını belə...”[1]

Həmdullah bəy, maddi və mənəvi durumunu ustalıqla bir neçə cümlə ilə canlandırdığı “Türk ocağı”nı iki-üç ildə İstanbulun ən canlı, xeyli zəngin bütün türk gəncliyi tərəfindən sevilən çox önəmli sosial bir quruluşu halına gətirdi. Bir neçə ayda, o iki-üç otaq beş-altı otaq oldu, bir il sonra “Türk ocağı” Bayaziddə böyük bir iqamətgahı tamam tuturdu. Ocağın qurultayları, yəni konqresi, Darülfünunun böyük konfrans salonunu dolduracaq qədər qalabalıq və gəncliyin səmimi düşüncə və duyğularını qüvvətlə ifadə etdiyindən çox canlı və gurultulu olurdu. Türk ellərinin hər tərəfində yeni-yeni ocaqlar açıldığı xəbərləri də davamlı olaraq mərkəzə gəlirdi.

## Göyalp Ziya bəy

---

[1] Həmdullah Sübhi, *Dağ yolu*, birinci kitab, s. 30. Bu kitab Həmdullah bəyin 27 nitqini əhatə edir. “Türk ocaqları” İdarə Heyəti Yayınının 6 nömrəli sayıdır. Ankarada “Türk ocaqları” Mərkəz Heyəti mətbəəsində 1928-ci ildə nəşr olunmuşdur.

Türk gəncliyinin ruhuna təsir etməyə, Ocaqların təşkilatlanmasına Həmdullah bəy çalışarkən türk milliyyətçiliyi fikrinin düşüncə sahəsində tənziminə, sistem halına gətirilməsinə də “Türk ocağı”ndakı konfrans və söhbətləri ilə “Türk yurdu”ndakı məqalələri ilə, xüsusən Göyalp Ziya bəy çalışırdı.[1]

“İttihad və tərəqqi” mərkəz komitəsi Səlaniki tərk etməyə məcbur olub İstanbula gəldikdən sonra Ziya bəy və tələbələri “Gənc qələmlər”i çıxarmağa çalışmamışdılar və hamısı “Türk yurdu”na qatılaraq yurd və ocaqda bərabər çalışmağı üstün tutmuşdular. Bu şəkildə bütün türkçülük qüvvətləri bir yerə toplanmışdı. Və türkçülük axımının gənclər arasında ən canlı dövrü, Balkan Savaşı ilə Birinci Dünya savaşı arasında keçən iki-üç illik dövrdür -deyilə bilər.

Bu zamanlar Həmdullah bəyin ocaqdakı fəaliyyəti çox uğurlu oldu; türkçülük fikri gənclər və aydınlar arasında tamamən yayıldı və möhkəmləndi. Onu rədd və inkar edən hava ocağın ətrafından dağıldı. Türk aydınları arasında mərhum Göyalpın təsnifinə görə, Doğu və ya Batı internasionalizminə kor-koranə yapışmaqda israr edən geri zəkalılarla camaatı özünə güldürənlərdən başqa hər kəs “Türk ocağı”na üzv yazılmış və ya dost kəsilmişdi.

Ocaq başkanlığında bu qədər uğur qazanan Həmdullah Sübhi bəy, məlumatı, savadı və biliyi ilə, xüsusən zəka, əsalət, fövqəladə natiqlik qüdrəti ilə ətrafındakılara sevgi aşılayaraq, xidmət göstərərək hakim və təsiredici olmaq kimi irsi qabiliyyətləri ilə özünü göstərmişdir.

Həmdullah bəy, Osmanlı imperatorluğunun siyasət, idarə, elm və ədəbiyyat sahələrində önəmli mövqelər tutmuş qədim, əsil və ziyalı bir ailəyə- Sami Paşa ailəsinə mənsubdur. Həmdullah bəyin böyük babasının babası, Şeyx Nəcib əfəndi, Yunan İxtilalı zamanı Moranın ən önəmli şəhri olan Tripolis qəsəbəsinin idari və mənəvi hakimi idi. Yunan İxtilalçılarına qarşı bu mühitin türk hakimiyyətini müdafiə etməyə çalışdı; bu ərazinin müsəlman və türkləri ilə müdafiəni təşkil etdi. Şeyx Nəcib Əfəndi, mütəsəvvüf, alim və şair idi. Həmdullah bəyin böyük babası, yəni Şeyx Nəcib Əfəndinin oğlu Əbdürrəhman Sami Paşa Osmanlı səltənətinin ilk təhsil naziri olan şəxsdir və Osmanlı ədəbiyyatında tanınmış bir simadır. Keçəçizadə Fuad Paşa ağzından yazılmış mənzuməsi olduqca məşhurdur. Əbdürrəhman Sami Paşanın oğlu və Həmdullah bəyin atası Əbdüllətif Sübhi Paşa müqtədir bir idarəçi, ciddi bir tarixçi, əski əsərlər və metal pullar, sikkələr mütəxəssisi, ərəbcə, əcəmcə və fransızcaya lazımi səviyyədə bələd olan, Homeri öz dilində oxuyub-anlayıb türkcədə ustad sayılan adamlar idi. Sübhi paşa, maliyyə, bayındırlıq, vəkflər və təhsil naziri olmuşdur. Təhsil naziri ikən, Osmanlı ölkəsində qız sənət məktəblərini açdı və oğlan və qızların birlikdə təhsil aldığı

[1] Osmanlı Məşrutiyyət dövrü türkçülüyündə Göyalp Ziya bəyin yeri çox önəmlidir. Deyilə bilir ki, bu dövrdə türkçülüyün nəzəriyyəsi sahəsində mərkəzi sima Göyalpdır. “İttihad və tərəqqi” cəmiyyətində mövqeyi və nüfuzu ilə ictimai adını verdiyi məqalələri ilə, siyasi nəzəriyyəsinə verdiyi sistematik şəkil və ifadələri ilə, ancaq bunlardan daha artıq çox təbii və sadə yazılmış şeirləri ilə, xüsusən uşaqlara aid şeirləri ilə, türkçülüyə çox böyük xidmətləri toxundu.

məktəblərdən sonra türk qızlarına ilk orta təhsil bu məktəblərdə verildi. Məmləkətimizdə ilk əkinçilik məktəbi ilə, ilk muzeyi də Sübhi Paşa qurmuşdur.

Həmdullah Sübhi bəyin əmisi Sezai bəylə, ən böyük qardaşı Ayətullah bəy, Sami Paşa ailəsinin tanınan ziyalı simalarındandır. Gənc yaşında ölən Ayətullah bəy, Namiq Kamalın yoldaşlarından və yuxarıda bəhs etdiyimiz kimi, “Yeni osmanlılıq” hərəkatının ilk təşəbbüskarlarındandır. Sezai bəy, Namiq Kamal ədəbiyyatı məktəbinin böyüklərindən olduğu kimi, [1]Yeni Osmanlılığın “İttihad və tərəqqi” dövründə sürgün həyatını seçmiş və Avropada çıxan “Jontürk” qəzetlərinə dəyərli yazılar yazaraq, türk gəncliyinə hürriyyət, məşrutiyyət və milli hakimiyyət fikirlərini aşılamağa çalışmış hürriyyətçilərdəndir.

Əbdüllətif Sübhi Paşa elmi və idari bir çox əsər nəşr etdirdiyi kimi, özündən sonra çoxsaylı ailə üzvlərindən məmləkətə Həmdullah bəy kimi xeyirli bir övlad da qoyub getmişdir.

Sübhi Paşanın yaşca ən kiçik oğlu Həmdullah bəy 1884-cü ildə İstanbulda Xorxorda babasının bir saray qədər böyük, zəngin evində doğuldu. Uşaqlığını Sami Paşa ailəsinin Camlıcadakı köşk və baxçalarında keçirdi. Bununla bərabər, ara-sıra Xorxordakı evlərinə də gəlirdi. “Türk yurdu”nda çıxan “Xoruz döyüşü” -ki Murad Paşa məscidi həyətində baş verir- qonaqda keçirdiyi zamana aid xatirələrindəndir.

Həmdullah bəy, Qısıqlı ibtidai məktəbində oxumağa başladı; Altunizadə və “Nümuneyi-tərəqqi” məktəblərində ilk təhsilini bitirdi. İkinci təhsilini Qalatasaray sultanisində gördü.

Mən onu ilk dəfə, “İttihad və tərəqqi” tərəfindən nəşr olunan “Şurayi-ümmət” qəzetinin yazı heyəti arasında, Şərəf küçəsindəki qəzet idarəsində gördüm; yazı heyəti müdirliyini dostum Fərid bəy edirdi. Həmdullah bəyin zəkasını, yazarlıq qabiliyyətini, Fərid bəy mənə tərifləmişdi. Gerçəkdən, davranışındakı əsillik və gözlərindəki özünəməxsusluq onu digər qələm yoldaşlarından ayıracaq qədər aydındı. O zamanlar qurulan “Fəcri-ati” ədəbi topluluğuna Həmdullah bəy də daxil olmuşdur və “Sərvəti-fünun”da nəsr və nəzmlə bir xeyli ədəbi parçaları nəşr olunmuşdu.

“Fəcri-ati” gənclərini “Sərvəti-fünun”un mininci nüsxəsini hazırlamağa çalışdığı zaman ziyarət etmişdim. Sonradan türkçülük hərəkatının önəmli üzvləri olacaq Cəlal Sahir, Köprülüzadə Fuad kimi gənclər arasında Həmdullah Sübhi bəy də çalışırdı.

Müəllimsiz bir dərs otağı kimi gurultulu olan yazı otağında xüsusən iki gənc- Həmdullah Sübhi bəylə Rəfiq Xalid bəy diqqəti çəkmişdi. Oturduğu yerdən qələmi əlində mənə diqqətlə baxan Həmdullah bəyin gözləri sanki yerindən çıxıb ruhuma qədər nüfuz edərək məni, mənliyimi təftiş edir kimi gəlmişdi. Gözləri o dərəcə içə işləyirdi. Rəfiq Xalid bəyin isə nə vücudu, nə dili, heç dinc durmurdu, davamlı bir stuldan o birinə sıçrayır və bütün bu gənclərin arasında başkan kimi dolaşan Cəlal Sahir bəyin sözünü bitirməyə imkan vermədən hey kəsirdi.

---

[1] Sami Paşazadə Sezai bəy, Osmanlı-türk yazarları arasında insan alverini şiddətlə tənqid edən ilk yazardır. Bu mövzudakı əsərinin adı “Sərgüzəşt”dir.

Həmdullah bəy, yazarlıqla bərabər, müəllimliyə də başlamış və sırası ilə Ayasofiya rüşdiyyəsində, darülmüəllimində, Bəhriyyə məktəbində, nəhayət Darülfünunda müəllimlik etmişdir. Son üç ali məktəbdə estetika tədris etmiş və Doğunun nəfis əsərlərini anlatmağa, duyurmağa çalışmışdır. Darülfünunda çox ümumi bir mahiyyətdə olan "Hikməti-bədaye" (Estetika hikməti) dərsi yerinə islam və xüsusən türk sənaye-nəfisə tarixini oxutmuşdur.

"Türk ocağı"na girib başkanlığına seçildiyi zaman darülmüəllimində müəllim idi. Ocaqdakı xidmətini ətraflıca yazmağı gələcək ilə buraxırıq. Bu xidmətlər nəticələrinə baxılaraq qısaca belə ifadə və təsbit oluna bilər: Həmdullah bəy, "Türk ocağı"na başkan olduğu zaman Divan Yolunda bir evin üst mərtəbəsində iki-üç otaqdan ibarət tək bir məhəlli ocaq var idi; bu ocağın üzvləri nəhayət 826-ya çatırdı, illik büdcəsi təqribən bir neçə yüz lirədən ibarət idi. Bu gün ocaq mərkəzi olmaq üzrə Ankarada bir milyon lirədən artığa başa gəlmiş bir bina tikilib bitmək üzrədir. Türkiyə Cümhuriyyəti daxilində 250-yə qədər ocaq mövcuddur; ocaqlıların miqdarı 30 mindən artığa çatmışdır. 1921-ci ildə Mərkəz büdcəsi 754121 lirə bütün ocaqların büdcəsi isə bir milyon üç yüz mindən artıq lirə olaraq təsbit edilmişdir. Bu böyük fərqin, yəni ocağın 10-15 ildə bu qədər genişlənmə və böyüməsinin ən önəmli səbəblərindən biri, mən heç şübhə etmirəm ki, Həmdullah Sübhi bəyin iş başında olmasıdır.

"Türk ocağı", imperatorluq dövründə siyasətlə məşğul olmadı; quruluşundakı ideyalarına sadiq qaldı. İmperatorluq parçalanıb dağıldığı zamanlar isə, türk milliyyət fikri hadisələrin təsiri ilə siyasi bir fikir olmuşdur. Ocağın fəaliyyəti özlüyündən siyasi bir fəaliyyətə çevrilmişdi.

Osmanlı imperratorluğunda artıq partiyalar deyil, millətlər bir siyasi təşkilat halı alırdı. Anadoluda Mustafa Kamal Paşanın başkanlığında başlayan türk milli hərəkatı milli bir türk dövləti meydana gətirməyi məqsəd seçmişdi. "Türk ocaqları" olduqca təbii və məntiqi olaraq, bu hərəkata qatıldılar. İstanbulda keçirilən milli mitinqlərə öncül oldular. Batı Anadoludakı müdafiə təşkilatları ilə əlaqələr qurdular və milli hərəkatın başı Mustafa Kamal Paşaya bağlılıq və itaətlərini bildirdilər. İmperatorluğun son Məclisi-məbusanı seçilərkən, ocağın nüfuzlu adamları "Milli türk firqəsi" adlı bir firqə adı ilə seçimə qatılaraq bir neçə məbus seçdirdilər ki, bunlardan biri iki seçim bölgəsindən, yəni Antalya və Saruxandan seçilən Həmdullah Sübhi bəydir.[1]

Ocağın fəaliyyətlərini diqqətlə təqib edən ingilis işğal qüvvətləri 1920-ci ildə, "Türk ocağı"nı iki dəfə basaraq əşya və nüsxələrindən bir qisminin ziyanına səbəb olduğu kimi, fəaliyyətində də görünürdü ki, bir maneə yaratmışdı.

9 mart 1920-ci ildə Bayaziddəki ocaq mərkəzi işğal olunmuşdu. Sonra Ocaq mərkəzi olaraq "Milli Təlim və Tərbiyə Cəmiyyəti" binası tutulmuşdu. Bu bina da ingilislər tərəfindən işğal edildi. Bundan sonra Mərkəz heyəti başkanı Həmdullah Sübhi bəy öz imzası ilə Mustafa Kamal Paşa

---

[1] Digəri Kütahyadan seçilən Əhməd Fərid bəydir ki, o da Böyük Millət Məclisinə qatılaraq Böyük Millət Məclisi Hökumətinin Maliyyə və Daxili İşlər Naziri olmuş, sonra Paris və daha sonra London elçiliklərinə təyin olunmuşdur.

həzrətlərinə işğal qüvvətlərinin milli müəssisələr əleyhinə yönəltdikləri bu zərbələrdən şikayət və ocaqlılara necə bir hərəkət tövsiyyə edəcəklərini soruşdu. Alınan cavabda elçiliklər nəzdində etirazlar edilməsi və lazım olduqda mitinqlər edərək üzüntümüzün göstərilməsi tövsiyyə edildi.[1]

Ankarada Türkiyə Böyük Millət Məclisi toplanırkən Həmdullah Sübhi bəy, Antalya millət vəkili kimi Ankaraya getdi və Məclisə qatıldı. *Və Müvəqqəti hökumətin ilk təhsil naziri təyin olundu.* Həmdullah bəy, bu şəkildə siyasətə, ancaq milli siyasətə girmiş olurdu. İkinci və üçüncü Böyük Millət Məclislərinə İstanbul millət vəkili kimi gəldi. Türkiyə Böyük Millət Məclisi hökumətində təhsil naziri oldu. Xarici işlər və təhsil komisyonlarının bir neçə dəfə rəhbəri oldu.

Bu siyasi vəzifələri yerinə yetirməklə bərabər, *Həmdullah Sübhi bəy "Türk ocağı"ndakı fəaliyyətini əsla məhdudlaşdırmamış, mərkəz heyəti rəhbərliyinə ilk seçildiyi gündən bu günə qədər rəqibsiz qorumuş və bu şəkildə Ocağın inkişafına ən önəmli amil olmuşdur.*

Osmanlı səltənətinin keçirdiyi son böhran dövründə, Məşrutiyyətdən bəri qurulmuş türkçülük müəssisələrindən ən uzun ömürlüsü "Türk ocağı" oldu. "Türk dərnəyi", öncə də qeyd edildiyi kimi, iki-üç ilə qədər davam edib dağılmışdı. "Türk yurdu" 1917-ci ildən sonra "Türk ocağı" ilə büsbütün qaynayıb-qarışmışdı; "Türk yurdu" müdiri Akçuraoğlu Yusuf "Qızıl Ay" təmsilçisi olaraq Rusiyada olan Osmanlı əsirlərinin Osmanlılara əsir düşən ruslarla dəyişdirilməsinə məmur edilib İsveç, Danimarka və Rusiyaya göndərildiyi zaman "Türk yurdu"nun idarə və yayımını "Türk ocağı" Mərkəz Heyətinə tapşırmışdı. Sonra "Türk ocağı" da mütarikə dövründə işğal qüvvətlərinin, xüsusən ingilislərin bir neçə dəfə hücumuna məruz qaldı. Ocağın mərkəzi, iqamətgahdan məhrum edildi: nüsxələri və sənədləri, kitabxana və komplektləri dağıdıldı. Şükürlər olsun ki, Ocağın bu dəyərli xəzinələrindən böyük qismi Ocaqlıların evlərində saxlanaraq qurtarıla bildi. Bütün bu təqib və təzyiqlərə baxmayaraq, "Türk ocağı" özünü qoruya bildi və dağılmadı. *Ocağın tarixində aravermələr yoxdur.*

"Türk ocağı" bu davamlı həyatını ən çox rəhbəri Həmdullah Sübhi bəyə borcludur. Həyatını və gələcəyini Ocağa bağlamış olan Həmdullah bəy, enerjisi, fikir təqibi, ruh aşinalığı və bənzəri olmayan strategiyası sayəsində, "Türk ocağı"nı Türk Milli dövlətinin qurulmasına qədər qoruyub saxlaya bildi.

Ankarada, milli türk dövləti "Türkiyə Böyük Millət Məclisi Hökuməti" adı ilə qurulduğu zaman, "Türk ocağı"nın mərkəzi də Ankarada yerləşdi. *Və bundan sonra "Türk ocağı"nın maddi inkişafı daha sürətli addımlarla irəlilədi.* Çünki yeni Türkiyə dövləti türk milliyyəti əsaslarına verdiyi dəyəri daim ifadə etmişdir. Türkiyə dövlətinin quruluşunda Qazidən sonra ən önəmli işləri görən İsmət Paşa, 17 iyul 1333-cü ildə(1917) Üçüncü Kolordu Komandanı İsmət İnal bəy ünvanı ilə və 2320-ci nömrə ilə "Türk ocağı"na daxil olmuş bir Ocaqlı yoldaşdır. Nəhayət, Ocağı təmsil edən

---

[1] Həmdullah Sübhi bəyin xüsusi bir məktubundan.

şəxs, Həmdullah Sübhi bəy də milli türk dövlətinin rəhbərlərindən, “Türkiyə Böyük Millət Məclisi Hökuməti”nin vəkillərindən olmuşdur.

**Türkiyə Cümhuriyyəti**

*Türkiyə Cümhuriyyətinin, başda "Türkiyə Böyük Millət Məclisi Hökuməti" adı ilə, sonra gerçək adı ilə qurulması, türk milliyyətçiliyi baxımından türkçülük idealının gerçəkləşməsi deməkdir.* Bir çox türkçülərin bəlkə həyatlarında gerçəkləşəcəyinə ümid edə bilmədiyi ideal, bir türk dahisinin qüdrəti ilə gerçək olmuşdu; milli türk dövləti qurulmuşdu.

Türk milliyyətçiləri, dilin türkcələşməsini, hüququn türk hüququ olmasını və buna görə qadının əski türk qanunlarına uyğun bir hürriyyət qazanmasını, incəsənətin türkcələşməsini, yəni şeirin, musiqinin, rəssamlığın... v.b. milli və əsli olmasını, qısacası, türk kültürünün yad təsirlərdən qurtarıb öz əsilliyini əldə edərək inkişafını diləyir və buna əllərindən gəldiyi qədər çalışırdılar.

Ancaq bütün bu kültürəl hürriyyət və müstəqilliyin siyasi sahədə tam hürriyyət qazanılmadıqca əldə edilə bilməyəcəyi Məşrutiyyət təcrübəsi ilə anlaşılmışdı. Osmanlı dövlətinin siyasəti, çoxlu səbəblərdən sərbəst ola bilmədiyi kimi, *türkün kültürü də, Göyalp Ziya bəyin dediyi kimi, bir çox kapitülasyonla bağlı idi.* Bu kapitülasyonların bəzilərini Doğu, bəzilərini Güney, bəzilərini də Batı türkün boynuna salmışdı. Türk, bütün bu ağır-ağır halqaları atıb, istədiyi kimi yürüyə bilmək üçün, həyat qüdrətini göstərən bir iqtidar və hakimiyyət feilini tapmaq, bunu bacarmaq məcburiyyətində idi. Türk milləti, başlarına keçən eşsiz Mustafa Kamalın rəhbərliyi və idarəsi sayəsində, bu iqtidar və hakimiyyət feilini, Osmanlı imperatorluğuna qalib gəlmiş xarici düşmənlərin iradəsinə boyun əyməyərək və xarici və daxili düşmənləri məmləkətdən qovmaq və çıxartmaqla, əsgəri və siyasi sahədə göstərdi; və bununla siyasi cəhətdən tam hürriyyət və bağımsızlıq qazandı. Artıq kültürəl hücumları da yavaş-yavaş söküb atmaq yolu açılmışdı. Türk milləti, açdığı bu yolda enerji və uğurla davamlı irəlilədi; kültürəl hürriyyət və bağımsızlığını məhdudlaşdıran maneələri ara vermədən qaldırdı və bu gün də qaldırmaqda davam edir. Son qalxan kültürəl kapitülasyon, türk dilinə uyğun olmayan hərflər sistemi və imla tərzidir.

Türk milliyyətçiliyinin necə başladığını və necə yayıldığını, əlimizdən gəldiyi qədər obyektivliklə göstərməyə çalışdığımız bu məqalədən anlaşılmışdır ki, yaşamaqda olduğumuz zamandan bəziləri yetmiş-səksən il, bəziləri əlli-altmış il öncə gəldikləri halda, türklüyün haraya doğru getdiyini və getməsi vacib olduğunu görən və ona görə çalışan uzaqgörən, doğru düşüncəli türklər vardır. Görüşlərinin və düşüncələrinin doğruluğu sübut olunan bugünkü gündə, o şəxslər ehtiramla anılmağa layiqdir.

Türkçülük fikri, yarım yüzil öncə nəhayət, bir neçə şəxsiyyətin beyin və qəlblərində düşüncələr, duyğular və amallar oyandıran, ara-sıra dil və qələmlərindən aydın olmayan və qətiyyətsiz şəkildə çıxan bir nəzəriyyədən ibarət idi. Bu nəzəriyyə, o zamanlar mühitə o qədər yad idi ki, tərəfdarları onu çox açıq söyləyib yazmaqdan çəkinirdilər. Halbuki türkçülük fikri bugün

gerçəklik sahəsinə çıxmışdır, hadisələr halında özünü göstərir. Belə böyük fikirləri gerçəkləşdirənlərə bəşəriyyət dahi və qəhrəman deyir. Türk aləmində türk idealını gerçəkləşdirən dahi və qəhrəman, Türkiyə dövlətinin banisi və Türkiyə Cümhuriyyətinin ilk cümhurbaşqanı Qazi Mustafa Kamal həzrətləridir.

**Səlamiçeşmə, 6 sentyabr 1928**

**Akçuraoğlu Yusuf**

***İÇİNDƏKİLƏR***

